*Bu kitab “**Səməd Vurğun.** Əsərləri. Yeddi cilddə. IV cild”*
*(Bakı, Elm, 1988) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Aslan Salmansoy**

Redaktoru: **Aybəniz Vurğunqızı**

**894.361 - dc 21**
**AZE**
**Səməd Vurğun. Seçilmiş əsərləri.** Beş cilddə. IV cild. Bakı, “Şərq-Qərb”, 2005, 400 səh.

Öz qaynağını xalq yaradıcılığı çeşməsindən götürmüş Səməd Vurğun sənəti xalqın dühası kimi zəngin və zəngin olduğu qədər də sadədir. O sehrli sadəliyi ilə Vurğun sənəti bu gün də bizim ədəbiyyatımızın yollarını işıqlandıran bir məşəldir.

Cəmi əlli il ömür sürmüş ustad şairin zəngin yaradıcılıq irsində onun mənzum dram əsərləri də əhəmiyyətli yer tutur.

“Seçilmiş əsərləri”nin bu cildinə müqtədir sənətkarın “Vaqif” (1937), “Fərhad və Şirin” (1941), “İnsan” (1945) pyesləri daxil edilmişdir.

“Vaqif” dramı əslində Səməd Vurğunun adı, şəxsiyyəti, milli poetik “mən”i ilə ən çox bağlı olan əsərdir. “Vaqif” həm də şair və onun taleyi haqqında dramdır. Əsərin bir çox səhnələri xalq yaddaşında zərb-məsələ çevrilib yaşamaqdadır.

Nizami yaradıcılığından ən gözəl tərcüməni (“Leyli və Məcnun”) Səməd Vurğun etdiyi kimi, Nizami mövzusunda ən gözəl və orijinal əsəri də məhz o yazmışdır. “Fərhad və Şirin” Vurğun sənətinin şəksiz uğurları sırasındadır. Şərq şerinin klassik eşq dastanına yeni məna verən müəllif məhəbbət süjetinin əxlaqi mahiyyətini ön plana çəkir.

“İnsan” mənzum romantik-fəlsəfi dramında isə Hörmüz-Əhrimən, Xeyir-Şər, Faust, Hamlet sualı və fəlsəfəsi ilə bağlı əbədi düşüncə davam edir. Bu əsərində Vurğun dahi Nizaminin müdriklik dünyası anlayışları ilə zəmanəsinə şərh verməyə çalışır.

Görkəmli dramaturqun hər üç əsəri uzun illər boyu teatrlarımızın repertuarında yer almış, saysız-hesabsız tamaşaçılar toplamışdır.

**ISBN 9952-418-47-4**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# VAQİF

*5 pərdəli 11 şəkilli mənzum dram*

## İŞTİRAK EDƏNLƏR

| | |
|---|---|
| Vaqif | – XVIII əsrin məşhur Azərbaycan şairi |
| Ağa Məhəmməd şah Qacar | – İran hökmdarı |
| Vidadi | – Vaqifin həməsri və yaxın şair dostu |
| İbrahim xan | – Qarabağ xanı |
| Eldar | – xanlıq zülmü və Qacar basqını əleyhinə üsyan qaldırmış kəndlilərin başçısı |
| Kürd Musa, Arşak | – Eldarın dəstəsindən |
| Xuraman | – Vaqifin arvadı |
| Əli bəy | – Vaqifin oğlu |
| Gülnar | – Əli bəyin sevgilisi |
| Əminə | – Gülnarın anası |
| Tükəzban | – Vidadinin arvadı |
| Vəzir | – Qacarın vəziri |
| Təlxək | – İbrahim xanın təlxəyi |
| Şaliko, Tamara, Kiçik gürcü | – Qacar tərəfindən əsir alınmış gürcülər |
| Şeyx Alı | – Qarabağ şeyxi |
| İlyas | – Eldarın dəstəsinə soxulmuş casus |
| Sərkərdə | – Qacar qoşunlarının sərkərdəsi |
| Zülfüqar, Teymur | – Qacarın əleyhdarlarından |
| Əhməd kişi, Qurban kişi | – kəndlilər |
| Qasım, Murad | – çobanlar |

Kəndlilər, qaçaqlar, əsgərlər, elçilər və b.

## BİRİNCİ PƏRDƏ

### BİRİNCİ ŞƏKİL

XVIII əsr. Azərbaycan, Qazax mahalı. Vidadinin evi. Arxa tərəfdə Kür çayı şırıl-şırıl axır. Qürub zamanıdır. Vidadi tək ağac altında namaz qılır. Namazın arasında əllərini göyə qaldırıb, titrək və təsirli bir səslə.

V i d a d i

Xudaya! İnsanın halı yamandır,
Nələr çəkdiyimiz sənə əyandır,
Mənası varmıdır min təriqətin?
Aç... aç qapısını sən həqiqətin.
Nə olur, bir yeni işıq ver bizə,
Bizim kor yaranmış gözlərimizə –
Bəlkə də yaxşını seçək yamandan,
Ta ki, qansız keçən bir güzərandan
Biz də ilham alaq, sevinək barı!
İşıqlat bu dibsiz qaranlıqları...
Yazıqdır dünyanın əşrəfi insan,
Böyüksən, adilsən, keç günahından!
Qoyma ki, yerlərdə sürünsün bəşər,
Dünyada qalmasın nə pislik, nə şər.
Yaxşılıq insana bir sənət olsun,
Dünya başdan-başa bir cənnət olsun...

T ü k ə z b a n

Yenə namaz üstə şeir deyirsən!

V i d a d i

Sən də təzə-təzə qəlbə dəyirsən...

T ü k ə z b a n

Yox, yox... Vidadican, bağışla məni,
Könüldən sevirəm hər bir kəlməni.

Otuz il gördüyüm bu yoxsul ocaq,
Bir qonaq görməmiş bu səssiz bucaq,
Sənin ayaqların dəydiyi zaman,
Mənə cənnət kimi görünür, inan!

V i d a d i

Gəl, gəl, yaxın otur, vəfalı qarım,
Səndə yuva salmış ilk arzularım;
Dünyanın dərdini, qəmini hər an
Mənə bir baxışla unutdurursan.

T ü k ə z b a n

Bizə çox görməsin Yaradan bunu,
Mən sənə borcluyam ömrüm uzunu.

V i d a d i

Tükəzban! Azaldı gəlib-gedənlər,
Vaqifdən gəlməyir təzə bir xəbər.
Of... O, Qarabağa köçəndən bəri
Gödəlir ömrümün bu son günləri...
Onsuz günü-gündən çoxalır qəmim,
Oydu bu yerlərdə könül həmdəmim.

T ü k ə z b a n

Vidadi! Darıxma, bizdə məsəl var:
Bir yandan bağlayan, bir yandan açar.

Qapı döyülür.

V i d a d i

Buyurun!

İki nəfər elçi gəlir.

I elçi

Sizsiniz Vidadi şair?

Vidadi

Bəli, qulluğunuz bəndəyə dair?

I elçi

Gəncədən gəlmişik, qonağıq sizə...

Tükəzban

Bizim yoxsul olan bu evimizə
Siz xoş gəlmişsiniz!

Vidadi

Gəlin, qardaşlar!
Allah qonağının öz qisməti var.

Elçilər əyləşirlər. Tükəzban qarı aftafanı sacayağının üstünə qoyub çay hazırlayır.

Vidadi

Yaxşı, hardansınız, kimlərdənsiniz?

I elçi

Şair, Cavad xanın adamıyıq biz,
Xoş xəbər gətirib gəlmişik sizə.

Vidadi

Vaqifdən?

I elçi

Yox, Vaqif Qarabağdadır,
Siz ki, bilirsiniz, o uzaqdadır.

Vidadi

Bəli, uzaqdadır, həsrəti çoxdur...
Ancaq sədaqətin mənzili yoxdur.
Yaxşı, bir danışın, buyurun, görək!

I elçi

Yoxdur bu torpaqda şair sizin tək,
Gözəl sözləriniz düşüb dillərə,
Sizi çox görməsin Tanrı ellərə.

Vidadi

Yox... yox... Hüsni-kəlam Vaqifdə vardır,
Hər sözü ölməyən bir yadigardır.
Belimi sındırıb onun həsrəti.

I elçi

Bizim xan çox sevir şeri, sənəti,
Sizin yanınıza göndərdi bizi,
İstəyir saraya gəlməyinizi.

Vidadi

Necə?

I elçi

Xan deyir ki, Vidadi gəlsin,
Sarayda yaşasın, burda yüksəlsin.

Eviniz hazırdır bir bağ içində,
Eyvanı yamyaşıl yarpaq içində;
Bilməyəcəksiniz nə dərd, nə zillət,
Aşıb-daşacaqdır sizinçin dövlət.
Sizi vəzirliyə dəvət edir xan.

V i d a d i

Oğul, mən azadam başdan, binadan.
Bir də, alışmışam bizim çöllərə,
Könlümdən ayrılmaz bu dağ, bu dərə.
Məndən nə şah olar, nə də xan olar,
Gəlsəm də xan özü peşiman olar.

I I  e l ç i

Canım, bir düşünün, bu səadətdir...
Bu tərki-dünyalıq yaman adətdir.
Qanadlı bir quşdur fürsət əzəldən,
Qaçar, buraxmayın siz onu əldən!

V i d a d i

(*bir növ başdan eləmək məqsədi ilə*)

Deyin ki, xəstəyəm yoxdur qüvvətim,
Yoxdur o əvvəlki sözüm, söhbətim.
Bu gün-sabahlığam, günlər tez keçir,
Mənim də karvanım yığışıb köçür.

I I  e l ç i

Demək... baş tutmadı xanın arzusu?
Sizdən gözlənilməz bir cavabdır bu.
Canım, bu ac evdən nə tapmısan sən,
Niyə buraxırsan kefi əlindən?

V i d a d i

Burda olmasa da saray havası,
İstidir hər quşun doğma yuvası.
Kasıb komacığım özümə yetər,
Burda yazılmışdır yüzlərlə əsər.

I e l ç i

Bəxtinizdən küsün...

V i d a d i

Yox, yox... mən şadam,
Burda hər qayğıdan, dərddən azadam.

I I e l ç i

Gəl gedək, gəl gedək, bu ki dəlidir.

I e l ç i

Gəl gedək, doğrudan bu gülməlidir.

V i d a d i

Qalın, gecələyin, evimiz vardır!

I e l ç i

(*rişxəndlə*)

Sizə darlıq olar, daxmanız dardır...

V i d a d i

Ürək geniş olsun!

I elçi

Gözünüz görsə də odlar, alovlar,
Sizə şirin gəlir xəyalplovlar.

II elçi

Di salamat qalın!

Elçilər gedirlər.

Vidadi

Gedin! Yanılmışdır sizi göndərən,
Başqa bir aləmin qonağıyam mən!
Bu fani dünyanın kefi, ləzzəti
Axırda yaradır könül möhnəti.
Gedin, aldadammaz məni saraylar!
Burda həmdəmimdir ulduzlar, aylar,
Burda gecələrin qərib səsi var.
Könlümün incə bir kəmənçəsi var...
Ona toxunmasın o soyuq əllər,
Mənim sarayımdır yüksək əməllər!..

Tükəzban

Vidadi, nə dedin! Lap ürəyimdən
Ömür sürməmisən qoltuqlarda sən.
Belə cavab verən dilin var olsun!
Yurdunu atana dünya dar olsun!

Vidadi

Tükəzban! O saray qan ocağıdır,
Onun hər vüsalı hicran dağıdır.
Bir düşün Vaqifi, daima gülən,
Daima şadlanan o böyük hünər
Bəzən taleyindən şikayət yazır;
Səbəb? – Saraylardır...

Arxadan səs gəlr.

V a q i f

Ay ev yiyəsi!

T ü k ə z b a n

Aman! Bu olmasın Vaqifin səsi?

V i d a d i

Deyəsən özüdür.
Bir nəfər kəndli tələsik içəri girir.

K ə n d l i

Vidadi! Vidadi! Gözlərin aydın!
Vaqif qonaq gəlir...

Vaqif bir bölük kəndli ilə daxil olur. Vidadi Vaqifi görən kimi özünü onun üstünə salır, qucaqlaşıb öpüşürlər.

V i d a d i

Canım! Ciyərim!
Yolunu gözləyən zəif gözlərim
Artıq işıqlandı, nə yaxşı, of, sən...
Vəfasız deyildin sən ki, əzəldən

Əyləşirlər.

V a q i f

Günah mənimkidir, əfv elə, ustad!
Sənsiz olmamışdır bir gün könül şad.
Yuxumda görmüşəm səni gecələr,
Sənsiz gülməmişdir ruhuma səhər.

T ü k ə z b a n

Yaxşı, ay utanmaz bir de yadından
Çıxdı birdəfəlik Tükəzban xalan?

V a q i f

(*Tükəzbanın boynundan qucaqlayaraq*)

Yox... yox, sən anadan artıqsan mana,
Həyatım olduqca borcluyam sana!

V i d a d i

Yaxşı, nə var, nə yox? Kefin necədir?

V a q i f

Bu dünya doğrudan bir bilməcədir.
Qapıya qoymuram can möhnətini,
İçirəm dünyanın hər şərbətini.
Gündüzlər oxşayır məni saraylar,
Gecələr sirdaşım ulduzlar, aylar...
Hər gülün rəngində bir canlı sənət,
Nə qədər təmizdir, safdır təbiət.
Mənim də oylağım dağdır, dərədir,
Könlüm gözəlliyə bir pəncərədir,
Dünyanın sirrini görürəm ordan...
Bir parça sümükdür sevdasız insan.

V i d a d i

(*ərk ilə*)

Sevda bir dənizdir – göylərdən dərin,
Asta bax, qaralar birdən gözlərin
Burnun uşaq kimi dəyər daşlara.

V a q i f

Xeyr! Mən yoldaşam uçan quşlara,
Dünya çox böyükdür, min bir yuvam var,
Hələ bu dünyayla mənim davam var.
Hər təzə gülüşdən zövq almalıyam,
Ovçu gözlərimdə qalmasın bir kam.
Ömür vəfasızdır, bizi tərk edir,
Hər ağ gün, qara gün ömürdən gedir...

V i d a d i

Şair! Heç aldanma dünya varına,
İnanma dünyanın etibarına.
Savab gör, hər zaman yaxşılıq eylə,
Dar gündə Allaha "kərimdir" söylə.
Səni bu dünyada boğsa da möhnət
Axırda qismətin olacaq cənnət,
Axirət dünyası qalacaq bizə.

V a q i f

O da bir pərdədir gözlərimizə.
Canım, nə cəhənnəm, nə cənnət vardır,
Bunlar da bir cürə uydurmalardır.

V i d a d i

Yenə şairliyin baş aparır ha!..
Yoxsa ağ olursan böyük Allaha?..

V a q i f

Bilirsən, Vidadi, sözün doğrusu,
Olmaq istəmirəm vicdan oğrusu.
Çoxdu bu dünyanın gözəllikləri,
Bəzən cilvələnən nazlı bir pəri

Şəhla gözlərini süzdüyü zaman
Cənnəti alıram mən bu dünyadan.
Qoy nisyə dalınca şeyxlər yüyürsün,
O nisyə cənnəti qoy onlar görsün.
Boş sözdür, “dünyanı heçdən yaradan” –
Bütün cənnətləri quracaq insan.

T ü k ə z b a n

(*gülür*)

Ha... ha... Vaqif, elə uşaqlıqdan da
Səndə görünürdü bu söz, bu əda.

V i d a d i

Yaxşı, nə tapmısan o saraylardan?
Sən ki zövq alırsan gözəldən, yardan?

V a q i f

Çoxdur Qarabağda gözəl sənəmlər,
Baxdıqca kül olur dərdlər, ələmlər.
Məndən çox uzaqdır hər bəla, hər qəm,
Yalnız gözəllərdir Məkkəm, Mədinəm.

V i d a d i

Demək, gözəllərçin unutdun bizi?
Unutdun öz ana beşiyimizi?

V a q i f

Mən orda olmasam, qan çıxar dizə,
Quşlar da ağlayar ellərimizə.
Xan məndən utanır, çəkinir bir az,
Mən getsəm, qırğının hesabı olmaz.
O, bəzən hirslənib quduran zaman,
Mənəm zəncirini dartıb saxlayan.

Bir neçə kəndli gəlir.

Əhməd kişi

Vaqif, xoş gəlmisən, üzünü görək!

Vaqif

Sağ ol, Əhməd dayı, kefin necədir?

(*Köksünü ötürür.*)

Əhməd kişi

Nə var ki, ömrümüz zülmət gecədir;
Yenə əllərimiz qabar-qabardır,
Nə çuval dibində bir arpa vardır,
Nə də təknəmizdə quru bir çörək.

Vaqif

Bilirəm, bilirəm, o dərdləri mən...

Əhməd kişi

Gərək yadındadır rəhmətlik dədən, –
Bükülmüşdü belə keçə atmaqdan.

Vaqif

Darıxma, darıxma, keçər bu dövran
Ağ günün işığı görünər sizə,
Hələlik güvənin zəhmətinizə.

Qurban kişi

Yaxşı, gözümüzün sən işığıydın,
Bütün məclislərin yaraşığıydın,
Şeirlər deyərdin gəlinə, qıza –
Onu da çox gördün axırda bizə?

V a q i f

Yox, yox, Qurban əmi, mənə dünyada
Bu ellər, obalar gülzar görünür.
Gözüm gözünüzdən uzaq olsa da,
Könüldən-könülə yollar görünür.

Q u r b a n   k i ş i

Sağ ol, əskik olma, sən yaşa barı!

Bu arada qatar-qatar durnalar keçir, onların qığıltısı hər iki şairin diqqətini cəlb edir.

V i d a d i

Tükəzban, bir tez ol, gətir sazları.

Tükəzban iki dənə saz gətirir. Vidadi sazın birini Vaqifə verir.

V i d a d i

Bunu tanıyırsan?

V a q i f

Mənimdir bu saz!

V i d a d i

(*ərk ilə*)

Hələ saxlamışam onu, utanmaz!
Ondan ayrılmasın sənin hisslərin,
Onun tellərində göylərdən dərin
Bir məna vardır ki, yaşadır izi,
Şair eləmişdir hər ikimizi.

Vaqif

Doğrudur, qardaşım, inan ki, bir an
Könlüm ayrılmamış telli sazlardan.

Vidadi

Di gəl, durnalara bir şeir deyək.

Sazları çalırlar. Vidadi və Vaqif deyişirlər.

Vidadi

Qatar-qatar olub qalxıb havaya,
Nə çıxıbsız asimanə, durnalar?
Qərib-qərib, qəmgin-qəmgin ötürsüz,
Üz tutubsuz nə məkanə, durnalar?

Vaqif

Bir zaman havada qanad saxlayın,
Sözüm vardır mənim sizə, durnalar!
Qatarlaşıb nə diyardan gəlirsiz?
Bir xəbər versəniz bizə, durnalar!

Vidadi

Bir baş çəkin dərdi-məndin halına,
Ərzə yazsın, qələm alsın əlinə,
Vidadi xəstədən Bağdad elinə
Siz yetirin bir nişanə, durnalar!

Vaqif

Nazənin-nazənin edərsiz avaz,
Ürək tazələnər, edər sərəfraz,
Vaqifin də könlü çox edər pərvaz,
Hərdəm sizin ilə gəzə, durnalar!

Ə h m ə d  k i ş i

Sağ olun, gecəniz xeyirə qalsın!

V a q i f

Xeyrə qənşər gedin, çox şad oldum mən.

Kəndlilər Vaqiflə görüşərək gedirlər. Vaqif axşam qəribliyinə şairanə bir nəzərlə baxaraq.

V a q i f

Ah, bu axşam nə gözəldir, ondakı mənaya bax,
Parçalanmış ağ buludlar, göydə bardaş quraraq,
Təbiətin saflığına qulaq asır uzaqdan,
Gəlin kimi bəzək vurub ay da çıxmış otaqdan.
Nə təmizdir, nə parlaqdır Mahtabın süd bənizi,
Ən müqəddəs xəyallara dəvət edir o bizi.

V i d a d i

Xəyal şirin nemətidir bu acı kainatın.

V a q i f

Xəyal doğma balasıdır bizim ana həyatın,
Onun gözü kor olsa da, sevəcəkdir bu ana,
Yazıq, bədbəxt balasını basacaqdır bağrına.

T ü k ə z b a n

Vaqif! Danışmadın heç Əli bəydən,
Necədir, görmürəm xeyli zamandır?

V a q i f

Paho... lap böyüyüb, yaxşı cavandır;
Toyudur... Gəldim ki, aparım sizi,
Özü tapşırıbdır gəlməyinizi.

V i d a d i

Yaxşı, Əli bəyin toyudur demək?

V a q i f

Bəs necə, toyudur!

V i d a d i

Tükəzban, gedək!
Oğul bizimkidir, gedək, Tükəzban!

T ü k ə z b a n

Sənə zəhmət olar...

V i d a d i

Nə?

(*Vaqifə işarə ilə*)

Budur cavan?
"Nə qədər olsa qoca, gərçi Vidadi xəstə,
Yenə Vaqif kimi, əlbəttə, yüz oğlana dəyər",
Sən ki ləleşini yaxşı bilirsən!

T ü k ə z b a n

Yaxşı, qoca vaxtı qürrələnmə sən.

V a q i f

Yox, xala! Heç qorxma, indi bahardır,
Qarabağ doğrudan bir laləzardır:
Yenə yanaqlara sığal vurulur,

Hər daşın dibində bir toy qurulur,
Bir yanda tar səsi, bir yanda qaval...
Bükür dağ döşündə boynunu maral,
Axır şırıltıyla köpüklü çaylar,
Gəlir səcdəsinə ulduzlar, aylar.
Gedək! Bizim yerlər xoş keçər sizə.

V i d a d i

Gedək, xına qoyaq əllərimizə,
Uşaq bizimkidir, mübarək olsun!
Gəlinin yolları gül-içək olsun!

Sevinclər içində Vaqiflə qucaqlaşırlar.

P ə r d ə

## İKİNCİ ŞƏKİL

Şuşa qalası. Xan sarayı. Vaqifin evi. Toy məclisi, oyun, İbrahim xan, yanında da adamları gəlir. Hamı qalxıb, xana baş əyir.

İ b r a h i m  x a n

(*xanəndələrə*)

Başqa bir zövqü var bugünkü toyun,
Tez olun, yaxşı bir segah oxuyun!
Musiqi çalınır.

X a n ə n d ə

(*oxuyur*)

Hər bağın, hər bağçanın bir bülbüli-şeydası var.
Hər duyan qəlbin, əzizim, gizli bir sevdası var.

Ruhu oxşar, qəlbi oxşar incə bir canan səsi,
Gah gülər, gah ağlayar – hər dəmdə bir mənası var.
Can alan hər nəğmənin mənası yalnız eşqdir,
Göz görüb, əl çatmayan ulduzlu bir dünyası var.
Böylə bir söz var ki, Vaqif indi bir Məcnun olub,
Şerü sənət adlanan nazəndə bir leylası var.

İ b r a h i m  x a n

Çox gözəl, Vaqifi çağırın görək...
Bəy də öz toyunda oynasın gərək!

Əli bəy oynayır, Vaqif gəlir.

İ b r a h i m  x a n

Vəzir, xeyir işiniz xeyli mübarək!
Ağ günlərə çıxsın sizin Əli bəy!
Ancaq çıxarmasın bizi yadından...

V a q i f

Görək, bu növrağı pozmasa zaman...

İ b r a h i m  x a n

Yenə də şikayət? Gəl inan ki, sən
Nə qədər mən sağam kef görəcəksən!

Təlxək gəlir.

T ə l x ə k

Gəlininiz bir mələk,
Hamı deyir “mübarək!”
Ancaq mənim boş başım
Sizə deyir – Qardaşım,

Bir qumardan, bir atdan,
Bir də gözəl arvaddan
Ehtiyatlı dolanmaq,
Ehtiyatlı dolanmaq!..

Gülüş

Eşikdə tüfəng atılır və ura səsləri ucalır, gəlini gətirirlər.

Y e n g ə

Anam, bacım, qız gəlin,
Əl-ayağı düz gəlin,
Yeddi oğul istərəm,
Bircə dənə qız, gəlin!..

V a q i f

A qızım,üzündən götür duvağı,
Qoy açıq görünsün ayın qabağı.
Açıq yaşamışdır bizim nənələr,
Kəfəndir, a balam, sərapərdələr.
Nədir gözəllərdə bu pərdə, bu rəng,
Can dustaq olanda gülərmi ürək?
Yazın laləsidir al yanaqların,
Yaqut kənarıdır gül dodaqların,
Camalın dünyadır, qucağın cənnət,
Utansın hüsnündən o kor şəriət!..

Hamıda heyrət, həyəcan görünür; gəlini biri otağa aparırlar.
Bu arada Eldar çiynində bir quzu içəri daxil olur.

V a q i f

Of... dostum, qardaşım, xoş buyurmusan,
Səndə dağ havası duyuram, inan!
Sizdən ayrılmayır könlümün quşu,
Ellərdə görürəm hər qurtuluşu.

E l d a r

Möhtərəm şairə salamlar olsun!
Bu dünya durduqca o da var olsun!

İ b r a h i m  x a n

(*ətrafa*)

Aha... heç saymayır bu hərif bizi,
Görünür dadmamış qüvvətimizi.

Ş e y x

(*İbrahim xanın qulağına*)

Bir bax gözlərinə... Baxışı qandır,
Kəndə qarışıqlıq salanlardandır.

İ b r a h i m  x a n

Vəzir, çoban-çoluq məclisidir bu?

V a q i f

Düzü, gözləməzdim heç sizdən bunu.

İ b r a h i m  x a n

Necə gözləməzdin, lap yersiz, nahaq,
Yox, bir başa keçsin çiynində çomaq.

V a q i f

Əziz qonağımdır, dostumdur Eldar.

İ b r a h i m  x a n

Xanın hüzurunda nə ölümü var?

V a q i f

Bu mənim evimdir, siz qonaqsınız,
Qonağı sevərlər, lap nahaqsınız.

İ b r a h i m  x a n

Qonağı, qonağı... qonağa bir bax!
Hər yoldan ötəni başa çıxardaq!

V a q i f

Onun görkəmindən iyrənməyin siz,
Bir kəndli babadır, vicdanı təmiz,
Dilindən düşməyir gözəl nağıllar;
Ən böyük ürəklər, yetkin ağıllar
Ellər dünyasında yetişir, bilin!
Namusu, vicdanı təmizdir elin!

İ b r a h i m  x a n

Doğrusu, yorulub bezikmədin sən,
Elə, durub-durub ellər deməkdən?

E l d a r

(*Vaqifə*)

Canım, dalaşmayın, mən gedim.

V a q i f

Dayan,
Başqadır könlümdə gülən xaniman...

İ b r a h i m  x a n

Getsin gərməsini ayaqlamağa!

E l d a r

Buyruq sizinkidir, möhtərəm ağa,
Ancaq olmasaydı kasıb kəndlilər
Bunca qudurtmazdı sizi simü zər...

Eldar məclisi tərk edir. Onu tutmaq istəyirlər, adamlar arasına iğtişaş düşür.

İ b r a h i m   x a n

Qoymayın, tez olun, tutun Eldarı!
Ona da göstərin daş zindanları!

(*Vaqifə tərəf*)

Qudurtdun bunları, doğrudan da, sən,
Bəlkə də özünsən ona dil verən?

V a q i f

Xeyr, yanıldınız, ona dil verən
Gözilə dünyada alovlar görən
Kəndistan yeridir, bəli, kəndistan!
Bəzən tanrıya da ağ olur insan...

İ b r a h i m   x a n

(*qəzəblə çıxaraq*)

Yaxşı danışarıq...

Toy adamları dağılır. Vaqif gəzinir, Vidadi heyrətdədir.

V a q i f

Bu da haqqı-salam, bu da duz-çörək...
Dünyada dərd varmı mənim dərdim tək?
Bu xan bir ilanmış, saray yuvası,
Zəhrimar qoxuyur onun havası.

V i d a d i

Vaqif, sabah məni yola sal gedim,
Torpaq evciyimi ziyarət edim.
Ordadır dünyanın zövqü, ləzzəti.
Sən də öz boynundan at bu minnəti,
Kəndimizə qayıt!

V a q i f

Yox, qayıtmaram.
İş ki belə düşdü, meydanda varam!

V i d a d i

Əl çək bu tərslikdən, qulaq as mana!

V a q i f

Ölsəm də, ölməyim xoşdur mərdana!

V i d a d i

Sən öz dediyindən dönməyəcəksən,
Səni yalnız qoyub gedəmmərəm mən.

Ə l i  b ə y

(*Gəlir.*)

Ata, həbs etdilər yazıq Eldarı!

V a q i f

(*mənalı*)

İnsan uçuracaq daş zindanları,
Zəncirsiz, zindansız günlər gələcək,
Bizə təsəllidir böyük gələcək.

Əli bəy

Bəs Eldar nə olsun?

Vaqif

Heç, nə dərdi var,
Vaqif ölməmişdir, onu qurtarar.

(*Vaqif qolunu oğlunun boynuna dolayaraq*)

Oğlum! Xeyir işin olsun mübarək,
Dünyanın kefini, ləzzətini çək!
Mənim də ürəyim hələ cavandır,
Yaşayaq birtəhər, bu da zamandır...

Vaqif Əli bəyin alnından, Əli bəy də Vaqifin əlindən öpür, o eləcə də Vidadi ilə öpüşüb gedir.

Vidadi

Ağıllı baladır, Allah saxlasın!

Vaqif

Könlümdə dünyanın min sirri vardır,
Ah, duyan, düşünən nə bəxtiyardır!
Dəryalar üstündə süzən sonalar,
Siz, ey göy üzündə uçan durnalar
Deyin, xoşbəxtəmmi?..

Təlxək qapıdan burnunu göstərərək.

Təlxək

Çox çalışıb, çox yanmayın,
Uşaq kimi inanmayın,
Bu dünyanın səfasına,
Sarayların vəfasına.

(*Gedir.*)

V a q i f

Gör nələr danışır ağıllı təlxək,
Nəsə, dincəlməyir sinəmdə ürək...

Xuraman gəlir.

X u r a m a n

Kişi, bu nə işdir? Küsüb getdi xan!

V a q i f

Qoy küssün özünün qanacağından!

(*Gedir.*)

X u r a m a n

Bir el ağasıydı əvvəlki ərim,
Öz qapım, öz evim öz nökərlərim
Hamsı qulluğumda hazır durardı.
Rəhmətlik gündə bir məclis qurardı...
Buna da bir "böyük vəzir" dedilər,
Başımı, beynimi ovub yedilər.
İnandım, dedim ki, nə xəyalı var.
Yəqin ki, bunun da öz cəlalı var.
Bu ki qoltuqlarda gəzib-dolanır,
Çox vaxt da su kimi rəngi bulanır,
Elə dərd tökülür qaş-qabağından,
Amma çox razıyam qanacağından.
Şairdir, görünür, düz ilqarı var,
Nə gözəl, nə şirin kəlamları var...
Eh... bir də, bunlardan mənə kar aşmaz...

Vaqif gəlir.

V a q i f

Nə var, fikirdəsən sən, ey sərvinaz,
Amandır, örtməsin, ey nazlı nigar,
O ay camalını qara buludlar!

X u r a m a n

Niyə, nə dərdim var, Allaha şükür!
Hara baxıramsa xeyir görünür...

V a q i f

Yox... Sənin səsində bir titrəyiş var,
Gəl məndən gizləmə, aç, söylə aşkar!

X u r a m a n

Heç... bir az incidir məni bu qürbət.

V a q i f

Yox, bu da olmadı, düz danış, afət!
Yalan yaraşmayır gül dodaqlara...

X u r a m a n

Bıy... Yaxşı, nə deyim mən bəxtiqara?

V a q i f

Aha... bundan danış... danış görüm, sən
Niyə öz bəxtinə qara deyirsən?

X u r a m a n

Deyirlər ki, sən...

V a q i f

Nə? Təzə xəbər?

X u r a m a n

Nə bilim, doğrusu...

V a q i f

Danış!

X u r a m a n

Deyirlər,
Səni vəzirlikdən qovlayacaq xan!

V a q i f

Ha... ha... ha... Bəs elə bu?

X u r a m a n

Bəli.

V a q i f

Xuraman!
Xuraman, gör nəyin xəyalındasan!
Qəfəsdə quş kimi yaşayıram mən.
Nə sənin gördüyün bu saray, bu yurd,
Nə də dişlərində qan donan o qurd
Bu tərlan könlümü ovlaya bilməz!
Dərin elə busa, lap arxayın gəz!

X u r a m a n

Bu səni... bəs səni...

V a q i f

Nə?.. Çıxarsalar?

X u r a m a n

Necə dolanarıq, dilənçilər tək?

V a q i f

Bizə qəhət olmaz bir parça çörək,
Qorxma, bəxtinə də söyləmə qara...
Kaş ki, düşməyəydim bu saraylara!
Yanıldım, doğrusu, uyub aldandım,
Başqadır könlümdə mənim ilk andım...

X u r a m a n

Elə şirin-şirin danışmağın var.

(*Başqa otağa keçir.*)

V a q i f

Yox... sərraf gözüdür mənim bu gözüm,
Özüm tutduğuma heyranam özüm.
Gözüm su içməyir heç Xuramandan,
Onu başqa ruhda böyüdüb zaman.
Deyəsən, şöhrəti çox sevir qadın,
Ah, mənsəb!.. Ah şöhrət!.. Yaranmasaydın!..

P ə r d ə

## İKİNCİ PƏRDƏ

### ÜÇÜNCÜ ŞƏKİL

Xan sarayı. İbrahim xan içəri otaqda yatır.

T ə l x ə k

Əzizim, İbrahim xan,
Bit yerisin yaxandan.
Ayağını bərk uzat,
Xorul-xorul yaxşı yat!
Ordu çəkibdir Qacar,
Şeypur çalır qoşunlar,
Sən yuxuna şəkər qat,
Yaxşı uzan, yaxşı yat!..
Qoy axsın millət qanı,
Çək başına yorğanı.
Şahlar bizi boğsa da,
İnək kimi sağsa da,
Sən yuxuna şəkər qat,
Yaxşı uzan, yaxşı yat!.

İ b r a h i m  x a n

(*yuxudan təlaşla ayılaraq*)

O yandan Türkiyə, bu yandan İran,
Burdan da Rusiya, göndərir fərman...
Pozmaq istəyirlər cah-cəlalımı,
Qalmamış düşünən mənim halımı.
Könlüm ayrılmayır tacü təxtimdən,
Kəndlər də çaxnaşır mənim bəxtimdən...
Həddindən aşmışdır yenə qaçaqlar,
Dağlarda yurd salır bütün qoçaqlar,
Neyləyim?..

Əyanlar ağalar, şeyxlər daxil olurlar.

Ş e y x

Ey böyük hökmdar, əhvali-şüma?..

İ b r a h i m   x a n

Ya şeyx, bir tədbir tök mənim yuxuma!
Bu gecə qorxunc bir vaqeə gördüm.

Ş e y x

Lütf edib, danışın gördüyünüzü.

İ b r a h i m   x a n

Gördüm dəniz olub bu Cıdır düzü,
Elə bir dəniz ki, büsbütün qandır,
Onun dörd tərəfi qara dumandır.

Ş e y x

Sonra?..

İ b r a h i m   x a n

Bu dənizdə üzür qayıqlar,
Get-gedə sıxlaşır bu qayalıqlar;
Elə bil, sıxırlar məni dörd yerdən.

Ş e y x

Hə... Sonra?

İ b r a h i m   x a n

Bir qayıq yaxlaşdı birdən,
Zəncirli bir kəmənd atdılar mana.

Həmin kəmənd keçdi düz boğazıma,
Məni çəkə-çəkə hey apardılar.
Gördüm qayıqdadır o qaçaq Eldar...

Ş e y x

Bəli, o dələduz?

İ b r a h i m   x a n

Bəli, lap özü,
Hirsindən alışıb yanırdı gözü.
O məni dənizə basıb dedi: – Xan,
Buyur, doyunca iç tökdüyün qandan!

Ş e y x

(*yaltaqlanaraq*)

Ha... ha... qəm yeməyin, adil hökmdar!
Sizə neyləyəcək bir qaçaq Eldar?
Yuxu dəhşətlidir, – qorxusu yoxdur,
Dəniz aydınlıqdır, qan qovuşuqdur.

T ə l x ə k

(*özünü ortaya salaraq*)

Şeyxin kəlamı xoşdur,
Mənim kəlləmsə boşdur...

(*Qaçır.*)

V a q i f

(*Daxil olur və xana məktubu uzadaraq*)

Qacara yazdığım cavabdır, alın!
Elçilər gözləyir, tez yola salın!

İbrahim xan

Vəzir!

Vaqif

Dinləyirəm!

İbrahim xan

Qarışır zaman,
Ruhuma dar gəlir bütün xaniman.

Vaqif

Çox dedim, sözümə baxmadınız siz,
Dedim ki, zülmlər qalmaz əvəzsiz.
Bu dünya boş deyil, öz qanunu var,
Elin qüdrətinə lovğa baxanlar,
Əlbəttə, basılar...

İbrahim xan

(*hiddətlə*)

Basılar!.. Sən, sən...
Xeyir söz çıxmayır yenə dilindən.

Vaqif

(*şeyxə işarəylə*)

Çünki sözlərimdə doğruluq vardır,
Yalançı-yaltaqlar və oğrulardır.
Sizi yatırmasın ağır yuxular,
Hücuma hazırdır Məhəmməd Qacar.

İ b r a h i m   x a n

(*Vaqifin yazdığı cavabı oxuyaraq*)

Çox gözəl, hər sözün iti bir bıçaq,
Qacarın bağrını parçalayacaq!
Mənim qeyrətimi çəkirsən, demək?

V a q i f

Elimiz qoçaqdır, zülmdən əl çək.
Hələ yaranmamış həyata əvəz,
Həyatın qədrini düşünün barı!
Dünya naz götürüb yaşada bilməz
Onunla gizlənpaç oynayanları.

Ş e y x

(*kinayə ilə*)

Bəli, dərs alacaq bizim böyük xan
Bunun həkimanə kəlamlarından...

V a q i f

Yaxşısı budur ki, yaltaqlanma sən,
Ağıl ummayıram boş kötüklərdən...

İ b r a h i m   x a n

Vəzir! Bu sözləri qoyun bir yana,
Vəziyyət xarabdır, yol göstər mana!

V a q i f

Eldə can qoymadı ağır vergilər;
Siz bu qanunlarla qalsanız əgər,
Doğma balanız da yad olacaqdır,
Külünüz göylərə sovrulacaqdır.

Ş e y x

(*xana yaltaqlanaraq*)

Bəli də, bəli də çox sevir sizi,
Dağıdın, paylayın xəzinənizi,
Bəlkə, doyacaqdır acların gözü...

V a q i f

Daxili vəziyyət belədir, düzü,
Xalq razı qalmasa bir hökmdardan,
Hakimi qurd kimi didəcək zaman.

İ b r a h i m   x a n

Yaxşı, vergiləri azaltsaq bir az,
İşlər düzələrmi?

V a q i f

Bundan kar aşmaz!
Məncə, nə olsa da bu gündən belə,
Vicdan azadlığı lazımdır elə...

İ b r a h i m   x a n

O nədir?

V a q i f

Kor kimi qalmasın insan,
Qalxsın cəhalətin qaranlığından!
Açılsın hər yerdə məktəb, mədrəsə!
Balalar quş kimi versin səs-səsə,
Dağların döşündən yollar çəkilsin,
Yollar kənarında güllər əkilsin,
Nəğmələr bəzəsin vətən mülkünü;
Mən də qoca vaxtı görüm o günü.

Ş e y x

Bundan sənə nə var?

V a q i f

Onu duymazsan...
Çıxar əmmaməni, sən keçəl qazsan...

Ş e y x

Elm günah işdir, təmizdir islam, –
Buyurmuş peyğəmbər əleyhüssəlam!

V a q i f

Lal ol! Ləkəlidir qəlbin, niyyətin,
Tiryək satanısan bəşəriyyətin!

Ş e y x

Sən xalqın gözünü açırsan bizə –
O da baş əyməyir bir əmrimizə.

İ b r a h i m  x a n

Şeyx doğru deyir! Kor qalsın onlar,
Xalq ayılan zaman haqqını anlar...

V a q i f

O kor dediyiniz hirslənən zaman
Çox bərk yapışacaq boğazınızdan...

İ b r a h i m  x a n

Birdən Vaqifin əlindəki əsaya baxaraq

Vəzir, əlindəki o əsa nədir?

V a q i f

Rusiya padşahı o zülmkardan –
Yekaterinadan bir hədiyyədir.

İ b r a h i m x a n

Aha...
De, sən hara? Rusiya hara?
Yoxsa satılmısan o kafırlara?

V a q i f

(*əsanı göstərərək*)

Buna şəkil verən bir sənətkardır,
Mənim sənətkara hörmətim vardır.

İ b r a h i m x a n

Bəs onu göndərən Yekaterina?

V a q i f

Yalnız nifrətim var, inanın, ona!
Onu da boğacaq gedən üsyanlar,
Azadlıq uğrunda tökülən qanlar.

Ş e y x

Bəs ruslar? Bəs ruslar? Bəs o məlunlar?

V a q i f

Din ayrı, dil ayrı olsa da onlar,
Yenə beşiyidir mədəniyyətin,
Qədrini çox bilir şerin, sənətin.

Ş e y x

(*xanı qızışdıraraq*)

Aman! Ayaqladı müqəddəs dini,
Bu tanrı düşməni, vətən xaini!

S ə s l ə r

Bir buna bax! Məlun!
Aldanmış, qansız!

Ş e y x

Satılmış...

S ə s

Bimürvət...

Ş e y x

Yezid, imansız!

V a q i f

(*hiddətlə*)

Durun! Mən deyiləm vətən xaini,
Saydım nəbilərin sonsuz sayını.
Min ildir baş əydik yalnız Qurana.
Baxdı gözlərimiz kor kimi ona,
Bizə yasaq oldu başqa kitablar,
Kitabsız bir ömrün nə mənası var?
Didildi daima ixtiyarımız,
Barı, bir gün görsün övladlarımız.

İ b r a h i m x a n

Bəs mənim şöhrətim? Bəs tanrı? Bəs din?

V a q i f

Mən bir aşiqiyəm saf ürəklərin...

İ b r a h i m  x a n

Demək, satılırsan sən şeytanlara!

V a q i f

Tarix cavab verər bu böhtanlara...

İ b r a h i m  x a n

Bir vaxt təriflədin mənə Eldarı, –
Dağ-dərə tutmayır o qaçaqları.
İndi də rusların tərəfdarısan.
Sən elin dostusan, elin yarısan...

V a q i f

Dünya yaranmamış ötərgi bir səs,
Günəş qaranlıqla yaşaya bilməz...

Çıxır.

Ş e y x

(*xana*)

Başqa bir qisas da siz alın ondan!

İ b r a h i m  x a n

Buyurun, o nədir?

Ş e y x

O da, Xuraman!..
Çəkin bağrınıza o sərvinazı,
Qırılsın Vaqifin qoy ilham sazı!

İlyas daxil olur.

İ b r a h i m   x a n

İlyas! Gəlib çıxdın? De, nə var, nə yox?

İ l y a s

Eldarın halına bələdəm az-çox
Tez-tez dəyişdirir o öz yerini,
Tovlayıb azdırır gündə birini.
O qədər artıb ki, yenə qaçaqlar,
Tutmayır meşələr, dərələr, dağlar...

İ b r a h i m   x a n

Yaxşı, öldürməyə fürsət olmadı?

İ l y a s

Düzü, qorxuludur Eldarın adı.
Kəndistan yerində çox hörməti var.
Məsəldir: "Qaçağı el özü saxlar".
Belədir babalar dövründən bəri.

İ b r a h i m   x a n

Onun oylağına yaxın kəndləri
Yandırsaq necədir?

İ l y a s

Yox, yox, bu olmaz!

(*Döşünə döyərək.*)

Gələr öhdəsindən lələşin İlyas.

İ b r a h i m   x a n

Yaxşı, fikrin nədir, bir danış görək?!

İ l y a s

Bu gündən onlara qoşulam gərək.

İ b r a h i m  x a n

Necə? Nə deyirsən?

İ l y a s

Belədir, bəli...
Qaçağı öldürər xəyanət əli.
Deyərəm: "Məni də asdırırdı xan,
Qaçıb qurtarmışam dar ağacından".
İnanar... Onlara yoldaş olaram.
Bildiyim qisası sonra alaram.

İ b r a h i m  x a n

Necə? Nə minvalla?

İ l y a s

Nə varmış buna?
Əvvəl girəcəyəm onun qılığna,
Yanından getməyib günlü, gecəli,
Qəsdən olacağam onun sol əli.
Bir gün yenə də qılığna girib,
Hərifi birtəhər yuxuya verib,
Bir güllə vuraram lap təpəsinə,
Başımı götürüb qaçaram yenə...

İ b r a h i m  x a n

(*gülə-gülə*)

Mərhəba, mərhəba, İlyas pəhləvan!
Sonra da on para kəndin var, inan!
Olarsan onlara sən də bir ağa,
Çaparsan atını hey sola-sağa.

Tökülər qapına müftə bəhrələr,
Bir də kasıblıqdan görməzsən əsər.

İ l y a s

Heç əskik olmayın!

İ b r a h i m  x a n

Eləsə, di get,
Verdiyin vədəyə tamam əməl et!

İ l y a s

Baş üstə, baş üstə, arxayın ol, xan!
Eldar qurtulammaz qurduğum tordan...

Gedir.

İ b r a h i m  x a n

(*şeyxə tərəf*)

Sən də Xuramana yaxşı tədbir çək,
Vaqifə göz dağı bu olsun gərək!..

Gedir.

Ş e y x

(*sevinclə*)

İndi sevin, Şeyx Alı!
Bəxtinə gün doğalı...
Vaqifi saldın tora,
Qoymadın dinc otura.
İndi xanı dolaram,
Özüm vəzir olaram,
Nə dərdim var, qəmim var!

Sarayda qız balalar
Mənə baxıb göz eylər.
Hər məsələ düzələr...
İndi sevin, Şeyx Alı!
Bəxtinə gün doğalı...

(*Oynaya-oynaya çıxmaq istəyir.*)

T ə l x ə k

(*şeyxin arxasınca*)

İndi sevin, Şeyx Alı!
Bəxtinə gün doğalı...

Ş e y x

Tfu!

Gedir.

T ə l x ə k

(*şeyxin arxasınca*)

Yekəqarın, yekəbaş,
Ara düzəldən oğraş!

(*Təlxək mütəəssir halda Vaqifin arxasınca.*)

Nələr gördün, aman, Vaqif!
Nə qansızmış zaman, Vaqif!
Mən demədimmi çox yanma,
Uşaq kimi çox inanma
Bu dünyanın səfasına,
Sarayların vəfasına...

P ə r d ə

## DÖRDÜNCÜ ŞƏKİL

Saray. Vaqifin evi. Gülnar əlində bir neçə dəstə bənövşə, qızlar ilə gəlir.

G ü l n a r

Bizim sərin meşələr,
Bu körpə bənövşələr!
Gəlin, öpüm sizi mən;
Getsəniz gözlərimdən
Mənə böyük dərd olar.
Ah... bizim dik qayalar...
Havaları sərindir,
Dərələri dərindir.
Yaşamağın dadı var:
Gözəl-gözəl adı var
Hər enişin, yoxuşun,
Bir rəngi var hər quşun.
Əsmə, dayan, ey külək,
Ova çıxmış Əli bəy.
O mənim sevgilimdir,
O, ağzımda dilimdir.
Tüfəngini yel əysə,
Ayağına daş dəysə,
Ürəyimə ox batar.
Nə gözəl də boyu var!
O baftalı çuxası,
O düyməli yaxası,
At belinə qalxmağı,
Tərlan kimi baxmağı,
Göz görməyən uzağı
Onun nişan almağı
Söylənilir ellərdə,
Dastan olub dillərdə.

Gülnarın anası Əminə gəlir.

G ü l n a r

Of, anacan, ana!

Qucaqlaşıb öpüşürlər.

Ə m i n ə

Qurbanam sana!
Mənim şirin balam, ağıllı qızım.
Sürüdən ayrılan körpəcə quzum.
Yoluna baxmaqdan gözüm saraldı,
Həsrətin səbrimi əlimdən aldı.
Adam anasını heç unudarmı?

G ü l n a r

Ana! Əli bəyin heç vaxtı varmı?
Vallah, gələsiydik bu həftə sizə,
Sənin ayrılığın dərd olub bizə.

Ə m i n ə

Əli bəy necədir? Damağı çağdır?

G ü l n a r

Nə var, lap yaxşıdır, şir kimi sağdır.
İndi ova gedib, bu saat gələr.

Ə m i n ə

Allaha çox şükür, xoş olsun xəbər.
Burdan kəsilməsin xeyrin ayağı.
Allah göstərməsin sizə göz dağı.
Yaxşı, bir de görüm, özün necəsən?

G ü l n a r

Özüm? Nə olacaq? Lap yaxşıyam mən.
Əli bəy quş kimi yemləyir məni,
Deyir, kənd yerindən seçmişəm səni.
Gözündə parlayır qaynar bulaqlar,
Ürək duyduğunu xatirə saxlar.

Ə m i n ə

Zarafat deyil ki, şair oğludur,
Görünür, sinəsi sözlə doludur.

G ü l n a r

Elədir, anacan... dedin ürəkdən
Ana! Şair olmaq istəyirəm mən.
Bilirsən nə qədər sinəmdə söz var?

Ə m i n ə

Yox... yox... qadan alım, min əyri göz var,
Bircə farağat dur... göz dəyər sana!

Vaqif və Vidadi daxil olurlar.

V a q i f

Xoş gördük! Xoş gördük, Əminə bacı!

Ə m i n ə

Tanrı göstərməsin sizə bir acı!

V a q i f

(*Gülnarın başını qucaqlayaraq*)

Bilirsən nə şeytan baladır Gülnar?
Mənim çox ağıllı bir gəlinim var.

V i d a d i

Düzdür, ağıllıdır qızımız Gülnar,
Südü təmiz olur bizim analar...

V a q i f

Əyləşin, Əli bəy gələr indicə.

Vaqif və Vidadi sol otağa keçirlər.

G ü l n a r

Görürsən, ana?
Necə mehribandır qaynatam mana.
Elə bil atadır...

Ə m i n ə

Olsun, ay bala!

Əli bəy əlində tüfəng və bir neçə qırqovul oxuya-oxuya daxil olur.

Ə l i   b ə y

Əminə xala!

Əminə onun alnından, o da Əminənin əlindən öpür.

Yaxşı, xala, bir de görək,
Bir de görək, nə vaxtadək,
Bizdən ayrı dolanıb sən
Yalqız ömür sürəcəksən!

Ə m i n ə

Necə, sizdən ayrı niyə?





Əli bəy

Bir qulaq as mən deyənə:
Doğrudan da kənddə təksən,
Çox əziyyət çəkəcəksən,
Daha bəsdir, qarış bizə!
Köçünü çək evimizə!

Gülnar

Ana! Qurban olum sana,
Gəl bizimlə yaşa, ana!

Əminə

Belə, ağ gün görəsiniz,
Xoş dövranlar sürəsiniz,
Başınızdan bir tük belə
Pay olmasın qara yelə.

Gülnar

De, köçürsən?

Əminə

Yox, ay bala!
Dövranımı çox sürmüşəm,
Qızımı da köçürmüşəm,
İndi dünyam quru səsdir,
Komacığım mənə bəsdir.
Bir də sizə budur sözüm,
Alışmışdır könlüm, gözüm
Ata-baba yerimizə,
Kənd yaxşıdır yenə bizə.

Əli bəy

Gülnar! Bir suya sal qırqovulları,
Xalama bir plov hazırla, barı!

Ə m i n ə

(*xurcundan bir cüt corab çıxararaq*)

Oğul! Deyirlər ki, qış bərk gələcək;
Sənə toxumuşam bu corabları;
Bilirsən, bunlardır kəndlinin varı.

Əli bəy

Çox sağ ol, çox sağ ol, Əminə xala!

Ə m i n ə

Sağlıqla geyəsən, mehriban bala!

Əli bəy

Gəl, ana! O evdə rahatlan bir az.

Hər üçü sağ otağa keçir. Vaqif gəlir.

V a q i f

Əli bəy, Əli bəy!

Əli bəy çıxır.

Əli bəy

Nə buyurursan?

V a q i f

Çöldə nə var, nə yox?

Əli bəy

Gördüm Eldarı!
Toplayıb başına qəhrəmanları,
Dağlarla yurd salıb Koroğlu kimi.

Məni görər-görməz sevindi qəlbi,
Dedi ki: – Atana məndən salam de,
Onunköməyindən çox xoşhalam, – de.
Yaxşılıq boynumda qalmayacaqdır.

V a q i f

(*pərişan bir vəziyyət alır*)

Yazığı saldılar çölün düzünə,
Dünya gözlərimdə qarışır yenə...

(*Oğluna.*)

Sən insan oğlunun taleyinə bax!
Ona göz dağıdır yerdə yaşamaq,
Lakin ayrılmayır dünyadan ürək,
Ətirlər qoxuyan hər gül, hər çiçək,
Göylərə baş vuran bu qəlbi dağlar,
Dağlar döşündəki şır-şır bulaqlar,
Hər yaşıl mənzərə, hər sarı sünbül,
Güllərin başına dolanan bülbül,
Bizim bu yerlərin gözəl elatı,
Çoban tütəyindən axan bayatı
Həyata çağırır hər zaman bizi,
Yaradır, yaşadır hər nəğməmizi...

Oğlum, düşündükcə, duyduqca dərin –
Qollarda səslənən bu zəncirlərin
Günəşli, gündüzlü bir sabahı var,
Ölsün gələcəyə inanmayanlar!

V i d a d i

Yenə inildədi qəlbindəki saz..
Gəlin, seyrə çıxaq dağları bir az.

Vidadi, Vaqif və Əli bəy çıxırlar. Xuraman gəlir.

X u r a m a n

Gecə fikir, gündüz fikir...
Nə yurd salır, nə ev tikir.
Elə yazır, yazır yenə...
Bir baxmayır mən deyənə.
Eh... baisin evi yansın,
Gözlərində od qalansın.
Əvvəl şirin dili vardı,
Məni öpər, oxşayardı.
Qurtarıbdır indi o da,
Dirigözlü düşdüm oda...
Nə bir durur, nə dincəlir,
Nə gözünə yuxu gəlir,
Hey düşünür ağır-ağır,
Üz-gözündən bulud yağır.
Birdən rəngi dönür qana,
Kişi olub lap divana...
Bilməyirəm nə dərdi var,
Günüm, gecəm keçir ağlar.

Qarı daxil olur.

Q a r ı

Nə şirinsən, nə göyçəksən,
Dərilməmiş bir çiçəksən.
Gözlər qalıb yanağında,
Sənin bu gül dodağında...
Nə şirindir suyun sənin,
Lap sərvdir boyun sənin.
Nə xanlar xörəyisən...

X u r a m a n

Qarı nənə, nə var ki, sən
Belə, bir cür dil tökürsən?..

Q a r ı

Qələm kimi qaşların var,
Qulac-qulac saçların var.
Ağzın kiçik bir püstədir,
Nə buyursan göz üstədir...

X u r a m a n

Bıy... dəlidir, nədir qarı...

Q a r ı

Kimin vardır belə yarı?
Çənəndəcə xalın da var,
Xoş yaradıb pərvərdigar,
Od kimidir yanaqların,
Bal kimidir dodaqların,
Nə xanların xörəyisən...

X u r a m a n

Qarı, bir de, nə var görək?
Mətləbini danış gödək.

Q a r ı

Hər tələsmə, körpə quzum,
Gözəl balam, gözəl qızım,
Qurban sana qarı nənən,
Xeyir xəbər gətirdim mən.
Gözü düşüb xanın sana...
Mənə bir xələt alsana!

X u r a m a n

Nədir, nədir, xanın sözü?

Q a r ı

Bəli, budur sözün düzü:
Bir gəlinsən gözəl-göyçək,
Geyin xara, geyin ipək,
Boynuna tax daş-qaşları,
Gəl ol xanın gözəl yarı!..
Qabağında qulluqçular,
Asta yeri, xumar-xumar.
Gecə xanın gir qoynuna,
Qollarını sal boynuna.
Ürəyin şad, könlün açıq,
Körpə quzum, ağ günə çıx!

X u r a m a n

(*xoşlanaraq*)

Aman... Nələr deyir qarı!
Doğrudurmu bunlar barı?..

Q a r ı

Xan deyəndə gör nə xandır!
Bığıburma bir cavandır.
Rüstəmi-Zal bir sərçədir.
Bu, xan deyil, pəhləvandır.

X u r a m a n

Yox... yox, bəsdir, qarı nənə,
Bu sözləri demə mənə,
Of, darıxır, lap ürəyim...

Q a r ı

Heç darıxma, gül-çiçəyim,
Bir az tərpən zirək kimi,
Xan da səni bəsləyəcək
Yağ içində böyrək kimi.

X u r a m a n

Yox... xoş getməz bu Allaha;
Vaqif məndən...

Şeyx girir.

Ş e y x

Aha...aha!..
Yox... qorxub eləmə, qızım, Xuraman!
Səndən razı qalar xaliqi-sübhan...
Doğrudur, cavansan... Düşünsən bir az,
Xanın təklifinə zidd getmək olmaz.
Onun yaşatdığı Allah yoludur.
Bütün bu bəndələr xanın quludur.

Gülnar gəlib qapının ağzından qulaq asır.

Bir də yadına sal gözəl cənnəti,
Bil ki, cəhənnəmin hər əziyyəti
Səndən uzaq olar... Göyərçin balam!
Mələklər, hurilər, pərilər səni
Alıb qanadına, gəzdirər səni.
Yoxsa əzrayıllar durar gözünə,
Zidd çıxmaq olarmı xanın sözünə?
Razısan?

Q a r ı

Razısan?

Ş e y x

Razısan?

Q a r ı

Di, din!
Ötsün şirin-şirin tuti dillərin.

Ş e y x

Tez ol, bir cavab ver!

X u r a m a n

(*çətinliklə, əzabla*)

Razıyam... ancaq...

Ş e y x

Bilirəm... hə, Vaqif? Yaşamayacaq!
Xətər gəlməyəcək sənin halına,
Onu heç gətirmə sən xəyalına,
Di, salamat qalın!

Qarı və Şeyx çıxırlar.

X u r a m a n

Of, nə iş tuturam?.. Yatmışammı mən!
Gör bir nələr çıxdı mənim dilimdən!..
İndi nə deyəcək qonum-qonşular,
Of, yazıq Vaqifin nə günahı var?

Gülnar daxil olur. Xuramana baxır, özünü saxlaya bilməyərək.

G ü l n a r

Xanım, mübarək!

X u r a m a n

Nə var?

G ü l n a r

Ay ləçər,
Bu iş yaraşarmı heç nəslimizə,
İndi nə deyəcək el-oba bizə?

Vaqif, Əli bəy və Vidadi daxil olurlar. Gülnara və Xuramana heyrətlə baxırlar.

V a q i f

Bu nədir? Bunlara nə olmuş görən?

Ə l i  b ə y

Hələ ki, anlaya bilməyirəm mən.

G ü l n a r

Ata!

V a q i f

Nə var, qızım, nə oldu sana?
Utanma, dərdini aç, söylə mana.

Gülnar ağlayır. Xuraman o biri evə qaçır.

Ə l i  b ə y

Ay qız, de, bir danış!

G ü l n a r

Nə deyim?

(*Ağlayır.*)

V a q i f

Gülnar!
De, qızım, de görək, qəlbində nə var?

G ü l n a r

(*utana-utana*)

İndicə bizdəydi şeyx ilə qarı,
Mən də qapımızda pusdum onları.

Vidadi o biri evə keçir.

V a q i f

(*oğluna*)

Hə... deyəsən iş var...

Ə l i  b ə y

De, danış, Gülnar!

G ü l n a r

Gördüm Xuramanla danışır onlar,
Dedilər ki, "Səni çox istəyir xan,
Çıx, ona arvad ol!"

V a q i f

Yaxşı, Xuraman?

G ü l n a r

Xuraman dedi ki...

Ə l i  b ə y

Nə dedi?.. Bir din!

V a q i f

Gizləmə... gizləmə, ağıllı gəlin!

G ü l n a r

Dedi ki, razıyam, gedərəm xana.

Əli bəy Gülnarı o biri otağa aparır.

V a q i f

(*düşüncələr içində*)

Aha, halal olsun bu Xuramana!
Yenə gözlərimdə hava qaralır,
Yenə dağ başını duman, qar alır...
Elə bil, mənliyim çəkilir dara,
Qəlbim sığışmayır dar saraylara.
Burda gözlərimə min qan görünür,
Mənə bu divarlar zindan görünür.
Könül viran qalan bir xanimandır...
Deyib-danışmayır xeyli zamandır...
Mənə nə göylərdən bir təsəlli var,
Nə yerlər ruhumu zövq ilə oxşar...

X u r a m a n

(*Pərişan daxil olur.*)

Vaqif! Ey sərvərim, ey tacidarım!

V a q i f

İtil gözlərimdən, bivəfa yarım!
Get, atıl murdarın qan qucağına,
Zülm yuvasına – od qucağına.

Xuraman başını aşağı salıb çıxır. Bir az sükut.

V a q i f

Canan üz döndərdi... Dövran bivəfa,
Pozuldu gördüyüm hər zövqü səfa.
Saraldı ömrümün çiçəkli yazı,
Qırıldı qəlbimin sədəfli sazı.

Əli bəy acıqlı halda gəlir.

Ə l i  b ə y

Ata, qoy öldürüm o mürvətsizi!

V a q i f

Əli bəy, alçaldar cinayət bizi;
Bir bax, əllərinə yaraşarmı qan?
Oğlum, yaşatmağa yaranmış insan.

Ə l i  b ə y

Bunda qalmamışdır nə namus, nə ar,
Vəfasız olurmuş ögey analar.

Gedir.

V a q i f

(*yalqız və pərişan*)

Düşüb-düşməyəli bu saraylara,
Hələ rast gəlmədim vəfalı yara!
Çəkin boğazımdan məni min dara,
Çobanlar yaylağı yadıma düşdü.
O təmiz duyğular, o saf ürəklər,
Bənövşə qoxulu sərin küləklər,
Başına döndüyüm güllər, çiçəklər –
Tərlanlar oylağı yadıma düşdü...
Mən ki çox keçmişəm sonalı göldən,
Bir ətir çəkmişəm hər təzə güldən,
Vaqif! Ayrı düşdün obadan, eldən,
Ömrümün növrağı yadıma düşdü...

Əyləşir, qələm-kağız götürür, şeir yazmağa başlayır.

P ə r d ə

## ÜÇÜNCÜ PƏRDƏ

BEŞİNCİ ŞƏKİL

Səhər yenicə açılır. Ordugah. Uca bir təpə.Təpənin başında şah Qacarın çadırı. Onun ətrafında başqa çadırlar görünür. At kişnəmələri, insan səsləri eşidilir. Qacar yuxudadır. Sağ tərəfdəki çadırdan Tamaranın kədərli şərqisi eşidilir.

T a m a r a

Ayrı düşdü tərlan könlüm
Öz mehriban yuvasından,
Göy üzünün durnaları,
Deyin vətən havasından.
Bir dustağam qolum bağlı,
Bir qəribəm sinəm dağlı ,
Bir xəstəyəm qəm otaqlı
Ürəyimin yarasından...

Q a p ı ç ı

Cana yanğın salır əsirin səsi,
Bu ana fəryadı, qadın naləsi.
Anasız ağlaşır körpə balalar,
Bir ad alacaqmış Məhəmməd Qacar...
Yoxmuş bu zalımda vicdandan əsər,
İranda qalmadı sağlam nəsillər,
Dondu cəbhələrdə laxta-laxta qan,
Bu yenə doymadı içdiyi qandan.

T a m a r a

Külək əsər, gül bükülər,
Könül yanar, can sökülər,
Gecə-gündüz yaş tökülər
Gözlərimin qarasından...

Qacar yuxudan oyanaraq, çadırın önünə gəlir.

Q a c a r

(*məğrur bir tövr ilə* )

Yenə gürcü qızı dərdə qərq olmuş.

Q a p ı ç ı

Şahim! Sevinməz ki, qəfəsdəki quş...
Görünür yazığın qəlbi qırıqdır,
Hər sözü bir nalə, bir hıçqırıqdır...

Q a c a r

(*kinayəli*)

Sənin də çox yanır ona ürəyin?

Q a p ı ç ı

Yox! Şahim! Hökmüdür bu da fələyin...

Q a c a r

(*Tamaranı qucaqlayır və sonra hiddətlə itələyərək*)

Deyirlər şirindir busənin dadı,
O da kor bəxtimə qismət olmadı.

(*Qapıçıya.*)

Haydı, get, vəziri yanıma çağır!

Qapıçı gedir. Qacar qızaran üfüqlərə göz gəzdirir.

Yenə də göylərdən od, alov yağır.
Bizə həyat verən günəş də qandır.
Dünya qan üstündə bir xanimandır...
Başıma ildırım töksə də fələk,
Qanlı qılıncımla hökm edəm gərək
Sonsuz dənizlərə, sonsuz çöllərə!..

Qoy qanla sulansın hər susuz dərə!
Qoy qana boyansın güllər, çiçəklər,
Yalnız qan qoxusun əsən küləklər!
Mənim vicdanım da, qəlbim də qandır,
Dünya qan üstündə bir xanimandır.

Vəzir gəlir. Ehtiramla baş əyir, əli ilə düzləri göstərir, yaltaqlanaraq.

V ə z i r

Şahim, nə gözəldir bu çiçəkli yaz!!

Q a c a r

Vəzir! Sözlərimə yaxşı qulaq as!
Yenə od içində yanır bədənim,
Dağlar ağırlıqda dərdim var mənim...

V ə z i r

Yaraşmayır bədbinlik sizə,
Şeytanmı görünür gözlərinizə?

Q a c a r

Tutaq ki, məşriqdən məğribə qədər
Mənə xərac verdi bütün ölkələr.
Nə olsun? Bədbəxtəm, bədbəxtəm, inan!
Tutaq ki, İldırım, Teymur, Çingiz xan
Hamısı mənəmmiş, nə olsun sonu?
Duyuram dünyanın boş olduğunu...

Yoxdur vəliəhdim... Bir sonsuzam mən,
Nə qədər küskünəm kor taleyimdən!

V ə z i r

Şahim, bu düzlərə, çöllərə bir bax!
Komadan-komaya qanad çalaraq
Şərqilər oxuyan xınalı kəklik,
Sizi qarşılayan güllük, çiçəklik
Deyir xoş buyurmuş böyük hökmdar...

Q a c a r

Vəzir, bu sözlərin nə mənası var?

V ə z i r

Dedim ki, qəlbiniz yumşalsın bir az.

Q a c a r

Hım... Hım...

V ə z i r

Gülürsünüz!

Q a c a r

Bizə yaraşmaz
Qılınc meydanında kəklik ovlamaq!
Bir bax! Qılıncımda qanlara bir bax!
Min mələk uçsa da gülümsəyərək,
Gərək yumşalmasın cəbhədə ürək!

V ə z i r

Buyruq sizinkidir, adil hökmdar!
Sizdə fəzilət də, ədalət də var.

Qacar

Xeyr, vəzilətdən dəm vurma, vəzir,
Dayan bir qul kimi əmrə müntəzir!
Bil ki, balıq qədər qanım soyuqdur,
Min vəz eləsən də mənası yoxdur!..
Bir boynu olsaydı bəşəriyyətin,
Onu bir qılıncla vurardım yəqin!..

Vəzir

Buyruq sizinkidir, adil hökmdar,
Sizdə fəzilət də, ədalət də var...

Qacar

Məni uşaq vaxtı axtaladılar,
Üzüldüm dünyanın hər nemətindən,
Qisas almalıyam bu dünyadan mən!

Vəzir

Şahim, olmasa da vəliəhdiniz,
İran torpağına hakimsiniz siz.
Şikayət etməyin taleyinizdən,
Oğlunuz, qızınız deyilmi vətən?

Qacar

(*kinayəli*)

Vətən! Çoxmu sevir məni o vətən?
Mənə həcv yazır hər yoldan ötən...
Çox da tərifləmə mənə vətəni,
Bu qılınc olmasa, yeyərlər məni!

Vəzir

İndi nələr keçir ürəyinizdən?
Tiflisi yandırdıq, oda qaladıq,

Bütün ellərini soyub taladıq,
Yenə də hirsiniz soyumadımı?

Q a c a r

Dünya tanımamış hələ adımı...
Gərək qan altında qalsın bu dağlar,
Bağlansın qapılar, sönsün ocaqlar.
Könüllər ayrılsın sirdaşlarından,
Çaylar yaradılsın göz yaşlarından!

V ə z i r

Şahim! Vicdanınız sonra ağrıyar...

Q a c a r

(*kinayəli*)

Vicdan!
O nə məndə, nə də səndə var!..
Gəlib çıxmadımı bizim elçilər?

V ə z i r

Xeyr, Qarabağdan yoxdur bir xəbər,
Deyirlər arifdir o İbrahim xan;
Deyirlər dərs alır Molla Pənahdan.

Q a c a r

O kimdir?

V ə z i r

Şairdir, ləqəbi "Vaqif".
Yaranmış, deyirlər, hər elmə vaqif.

Q a c a r

Yox bir, patavalı, çoban bir ölkə
Böyük Firdovsilər yaratdı bəlkə...

V ə z i r

(*qorxa-qorxa*)

Şahim, siz özünüz... azərbaycanlı...

Q a c a r

Nə?.. Mən?.. Mən?
Çoxdandır atmışam onu üstümdən.

V ə z i r

Buyruq sizinkidir, adil hökmdar,
Sizdə fəzilət də, ədalət də var.

Q a c a r

(*qapıçıya*)

Yoxlayın, hardasa əsir gürcülər –
Gəlsin vuruşmağa o iki nəfər!

S ə r k ə r d ə

(*daxil olaraq*)

Şahim, qayıtmışdır bizim elçilər.

Elçilər gəlir. Şahın hüzurunda baş əydikdən sonra cavab məktubunu şaha verirlər.

Q a c a r

(*məktubu vəzirə verərək*)

Oxu, gör nə yazır Qarabağ xanı!

V ə z i r

(*məktubu açaraq heyrətlə*)

Şahim! Bu ki şeirdir, bəs cavab hanı?

Q a c a r

Oxu, deyirdin ki, şairləri var,
Yəqin ki, cavabı mənzum yazmışlar.

V ə z i r

(*həyəcanla oxuyur*)

“Aldıq məktubunu, Məhəmməd Qacar,
Tərlan oylağında sar ola bilməz!”

Q a c a r

(*hiddətlə*)

Sar ola bilməz!...

V ə z i r

“Bu dünya qalmamış ulu şahlara,
Zülm də, zalım da var ola bilməz!”

Q a c a r

Var ola bilməz!..

V ə z i r

“Göydən başımıza odlar da yağsa,
Bu ellər baş əyib xar ola bilməz.
Mayan turş ayrandır, zatın qırıqdır,
Söyüd ağacında bar ola bilməz.
Basma ayağını bizim torpağa,
İlandan, əqrəbdən yar ola bilməz!”

Q a c a r

(*son dərəcə hiddətlə*)

Aha! Cürətə bax, cəsarətə bax!
Vəzir! De, necədir kəklik ovlamaq?
Xəbərdar eləyin sərkərdələri,
Hücuma toplasın bütün əsgəri!
Gurlasın dağlarda şeypurun səsi,
Sabah alınmalı Şuşa qələsi!

İki nəfər gürcünü gətirirlər.

V ə z i r

Şahim! Gürcülərdir...

Q a c a r

Əsir gürcülər!
Sabah bu dağlara gün doğan zaman
Asılacaqsınız dar ağacından.
Soyunun, vuruşun, şərtim var yalnız:
Soysun dərinizi, dırnaqlarınız,
Görünsün gözümə qıpqırmızı ət...
Qoy alsın ürəyim bir yeni qüvvət!
Sabah hücum vardır...
Tez olun, döyüşdə sağ qalan nəfər
Azad olacaqdır!..

Ş a l i k o

Şahim!

Q a c a r

Müxtəsər!

Ş a l i k o

Şahim, biz qardaşıq... birdir qanımız,
Birdir vicdanımız, birdir canımız...

Q a c a r

Necə? Qardaşsınız?

G ü r c ü l ə r

Bəli!

Q a c a r

Vəzir, bax!
Bu oyun doğrudan ləzzət olacaq!

V ə z i r

Buyruq sizinkidir, adil hökmdar,
Sizdə fəzilət də, ədalət də var...

Q a c a r

Tez olun, vuruşun!

Ş a l i k o

Gəl, qardaşım, gəl!
Onsuz da qapını açmışdır əcəl!

Gəl məni parçala öz əllərinlə,
Sonra baş götürüb dön bir ağ yelə,
Qayıt evimizə, gözləyir anan;
Barı, kor olmasın o ağlamaqdan,
Sən qayıt, qardaşım, barı yaşa sən,
Mən ölsəm də ölüm, sən sonbeşiksən.
(Gürcülər soyunub vuruşmaq istərkən)

K i ç i k  g ü r c ü

Ah! qolum qalxmayır!

Tamara çadırdan çıxaraq, gürcülərin arasına atılır, qollarını açaraq, şaha tərəf baxır. Sükut. Qacarın vəhşi qəhqəhələri. Bu an arxada – orduda üsyan qalxır. Bir nəfər əsgər yüyürərək Qacarın qarşısında durur.

Ə s g ə r

Bəsdir! Vuruşmaqdan yorulduq daha,
Barı, kor vicdanın baxsın Allaha!
Arvad-uşağımız İranda acdır,
Bir parça çörəyə, suya möhtacdır.
Bəsdir, bir doymadın içdiyin qandan...

Q a c a r

(*qılıncını çıxarararır*)

Xain! Sən orduya fitnə salırsan?

Qılınc davası qopur, vuruşa-vuruşa arxaya çəkilirlər. Səhnədə yalnız qapıçı və gürcülər qalırlar.

Q a p ı ç ı

Di, qaçın! Tez qaçın, indi fürsət var,
Odur bax, hazırdır yəhərli atlar!
Sabah olarsınız doğma vətəndə.

Tamara

Çox sağ ol, qardaşım, sonra qaç sən də.

Gürcülər qaçırlar.

Qapıçı

(*Qacarın arxasınca kinlə baxaraq*)

Elə zənn etmə ki, qapıçınam mən,
Bir az seçilirəm nökərlərindən...
Fürsət axtarıram, gələr bir zaman,
Doyunca içərəm sənin qanından!

Pərdə

## ALTINCI ŞƏKİL

Qarabağ. Qalın meşəli bir dağ. Dağ başında qala görünür. Meşənin ətəyində Eldarın dəstəsi. Bəziləri ayaq üstə, bəziləri də oturub söhbət edirlər. Ocaq tüstülənir. Bir ağacdan soyulmuş toğlu asılmışdır.

Kürd Musa

(*bayatı oxuyur*)

Qərənfiləm qələmsiz,
Qərarım yoxdur sənsiz,
Yorğanına od düşsün,–
Necə yatırsan mənsiz?

Ceyranam, düzə gəlləm,
Otlaram düzə gəlləm,
Yüz il qəzəmət çəksəm,
Qurtarsam, sizə gəlləm.

İkinci qaçaq

Can, can, qurban olum o nəfəsinə!

Birinci qaçaq

Ay Musa, bir güldür məclisi yenə!
Danış, qurban olum, bildiklərindən!

Kürd Musa

Yox, Molla Nəsrəddin deyiləm ki mən.
Yaz ola, dovğa ola yarpızla,
Yay ola, sərin sular sal buzla,
Payız ola, pendir-çörək qarpızla,
Qış ola, isti otaq, bir qızla...

(*Gülüşürlər.*)

İkinci qaçaq

Ay can, ay can!

Birinci qaçaq

Yuxuna girsin!

İlyas

Eh, nə deyim Eldara,
Bizi saldı avara...
Yatağımız daş, qaya,
Ömrümüz getdi zaya.

Kürd Musa

Aşna! Deyən yenə sən
Yumurtası tərs gələn
Toyuq kimi ötürsən?..

İlyas

Eh... Ay Musa, düzü, mən
Soyumuşam bu işdən...

Kürd Musa

Bəs sən ağa, mən ağa,
İnəyimizi kim sağa?

İlyas

Batmaq olarmı xana?
O top, tüfəng, topxana
Zarafatdır, ya nədir?

Kürd Musa

Gədə lap divanədir,
Bir gözümə doğru bax!
Bilirsənmi, ay axmaq,
Könlü balıq istəyən
Gərək girsin dənizə.

İlyas

Mat qalmışam lap sizə.

Kürd Musa

Qorxutmasın səni xan,
Yapışıb boğazından
Boğarıq sərçə kimi.
Bir də, İlyas, məsəl var:
El yığılsa bir yerə,
Vallah, kərən sındırar...

Eldar gəlir.

E l d a r

Can, ay Musa, gözüm, Musa!
Sənə yoxdur sözüm, Musa!
Kürd qızından belə oğul?

(*Qolunu Musanın boynuna dolayır.*)

Ad mənimdir, hünər sənin...

K ü r d   M u s a

Yox bir...
Yox bir... sən dolama görək.

E l d a r

Vallah, düz deyirəm, pələngsən, pələng!
Nə qədər qurtardın sən məni dardan,
Qanı dizə çıxan vuruşmalardan.

Qaçaqlar çoxlaşır, Eldar onlara baxıb sevinərək.

Gözəl gələcəyi görürəm sizdə,
Dünyanın gücü var əllərinizdə.
Biz ayrı düşsək də aşnadan, yardan,
Gərək çəkinməyək borandan, qardan!
Bir də, ataların bir məsəli var
Şanada bal tutan barmağın yalar.
Belədir, ay Musa?

K ü r d   M u s a

Elədir, elə,
Hər damcı qüvvədir bir daşqın selə...

E l d a r

Bir ağ gün görmədi bizim sonalar,
Öldü diri gözlü yazıq analar.
Yeri şumlayan biz, onu əkən biz,
Böyük sarayları qurub tikən biz.
Qışın şaxtasında taxıl becərən,
Nə rahatlıq görən, nə yuxu görən
Bizik, biz! Yenə də öldük acından,
Asıldıq hər zaman dar ağacından.
Taladı qurd kimi eli darğalar,
Nə bəydə insaf var, nə xanda qan var.
Nə vaxt qurtaracaq pis gündən insan?!

K ü r d  M u s a

Ay Eldar! Doğrudan bu bəylər ki var,
Bir azca arpası çox düşən zaman
Yabı cinsi kimi şıllaq atırlar...

Gülüş.

E l d a r

İndi də dişini qıcamış Qacar...
İranı talayan o qart canavar
Gəlir sürüsilə bizi soymağa,
Tökdüyü qanlardan içib doymağa ...

Şaliko, kiçik gürcü və Tamara həyəcanla gəlirlər.

E l d a r

Kimsiniz, qardaşlar? Danışın, görək!

Ş a l i k o

Zalım Məhəmməd Qacar,
Bizi soyub taladı,

Of... o qanlı hökmdar
Bizi oda qaladı.
Çox vuruşdu gürcülər,
Bəzən basılır hünər.
Bu dəfə basdı Qacar,
Bizi əsir aldılar.
Qana döndü dağ, dərə...

E l d a r

Yaraşmayır basılmaq
Qəhrəman gürcülərə!

Ş a l i k o

Oldu, bir işdir bu da.

E l d a r

Sonra?

Ş a l i k o

Bizi əsir aldılar,
Ayrıldıq obamızdan,
Öz isti yuvamızdan,
Bu həsrətlə saraldıq,
Ancaq qaçıb qurtardıq
Zalımın əllərindən

E l d a r

Aha... Bildim...

Ş a l i k o

İndi sən
Qərib görsən də bizi,
Gərək hər üçümüzü
Salamat buraxasan!

E l d a r

(*gülür*)

Göz üstə yeriniz var,
Bizim əziz qardaşlar!
Tanıyıram o dağları,
Durna gözlü bulaqları.
Çox keçmişəm hər gölündən,
Gürcüstanın dost elindən
Var onlarda namus, hünər,
O yediyim duz-çörəklər
Unudulmaz bu dünyada,
Bir yaxşılıq getməz bada...
Ayə, ay uşaqlar!

(*Ağacdan asılmış toğlu cəmdəyinə işarə edərək.*)

Onu düşürün,
Tez olun, yaxşı bir kabab bişirin!

T a m a r a

Sağ olun, çən gəlir, hava qaralır;
Sonra gecikərik, gün də daralır...

E l d a r

İxtiyar sizindir, bizim bu dağlar
Sizin evinizdir, indi uşaqlar
Aparıb ötürsün sizi Tiflisə!

Ş a l i k o

Böyük bir yaxşılıq olar bu bizə.

E l d a r

Yox, yox! Bu borcumdur, borcumdur mənim!

(*Şalikoya*)

Bura bax, qardaşım mindi şah Qacar –
O sizi talayan dişi canavar
İndi də göz dikib Azərbaycana.

Ş a l i k o

Şahlar hökm verir gündə min qana.

E l d a r

Bəs biz? Biz neyləyək? – Yığışın, gəlin,
Qüvvəti çox olar birləşən elin.
Gəlin qardaş olsun tüfənglərimiz;
İlanın başını ayaqlayaq biz!..

Ş a l i k o

Doğrudur, qardaşım, üç günə qədər
Çatar köməyinə bizim dəstələr.

E l d a r

Sizə inanıram, var olun, gəlin,
Tozu da qalmasın qanlı heykəlin!

Ş a l i k o

Biz gedək, vaxt gecdir.

E l d a r

Dayanın bir az!
Musa!

K ü r d  M u s a

Bəli.

E l d a r

Bəri qulaq as!
Götür beş-altı atlı,
Atları quş qanadlı,
Qonaqları özün apar.
Bir də, Musa! Mən ölüm,
Gözlə, başına dönüm
Yolda-izdə bir xata
Toxunmasın bunlara.

K ü r d  M u s a

Uşaqsan?! Uşaqsan?!

Ş a l i k o

Sağ olun, qardaşlar!

E l d a r

Göz üstə, göz üstə!

Gürcüləri böyük hörmət və şadlıqla yola salırlar. Qoca bir qarı Eldarın yanına gəlir.

E l d a r

Qarı, hardan belə?

Q a r ı

Heç, oğlum, Eldar!
Bilirsən, köməksiz olur qarılar...
Var-yoxdan qalmışdı bircə inəyim,
Oydu göz dikdiyim, oydu köməyim.
Onu da bu gecə zorla aldılar,
Məni diri gözlü oda saldılar...

E l d a r

(*acıqlı*)

Kim aldı, ay nənə?

Q a r ı

Kim aldı? İlyas!

E l d a r

(*İlyasa qəzəblə baxaraq*)

Alçaq, utanmaz.

A r ş a k

(*Eldara*)

Gözüm su içməyir İlyasdan, düzü,
Beləsi güdaza tez verər bizi!..

E l d a r

Bu saat sal görüm tüfəngi yerə!

İlyas tüfəngi atır, başını yerə dikir.

E l d a r

Di get, yerin olsun o boş mağara,
Tüfəng yaraşmayır namussuzlara!..

(*Eldar cibindən pul çıxararaq qarıya verir.*)

Al, nənə! Özünə get bir inək al,
İndidən adını qoyuram "Maral".

Q a r ı

Sənə qurban olsun bu qoca nənən,
Dünyada kasadlıq görməyəsən sən!

Gedir.

E l d a r

(*acıqlı, İlyasa*)

Tfu... sənin üzünə! Buna bax, buna;
Mən də inanmışam namərd oğluna...

İ l y a s

Qələt eləmişəm, bir xatadır bu,
Bir də eləmərəm ömrüm uzunu.

E l d a r

(*tüfəngi İlyasa qaytararaq, azca mülayim*)

Axmaq! Koroğlunun bir təmiz adı
Xanlarda, bəylərdə tutar qoymadı.
Bir də bu qələti...

Əli bəy tez oraya gəlir, Eldarla görüşür. Hamı yığışıb ona qulaq asır.

Ə l i  b ə y

Eldar! Bir qulaq as, qulaq as, Eldar!
Basqına keçmişdi Məhəmməd Qacar.
Atam çıxmışsa da vəzirliyindən,
Deyir yad əllərə keçməsin Vətən.
Bilirsən, o yanır pərvanələr tək,
İndi nəyin varsa Əsgəranə çək.





Qacarla vuruşun arxa tərəfdən, –
Atamın fikrini söyləyirəm mən.
Qaldı xan... – həmişə əlimizdədir,
Vətənin gözləri indi bizdədir.
Bu yurda qoymayaq zalım Qacarı,
Talana getməsin ellərin varı!

Eldar

Çox gözəl, Vaqifə ərz elə ki, sən
Kənara çıxmaram onun sözündən

(*Öz dəstəsinə dönür.*)

Vətən torpağının böyük bir oğlu,
Vicdanı bir böyük eşq ilə dolu,
Bizi dəvət edir qışdan bahara –
Azadlıq uğrunda vuruşmalara!

Ura çəkib hücuma keçirlər.

Pərdə

## YEDDİNCİ ŞƏKİL

Dağlıqdır, arxada şiddətli top səsləri, tüfəng səsləri eşidilir. Dağ arxasından, Qacarın ordusu tərəfindən yandırılmış kəndin alovları göyə qalxır. Uzaqdan arvad-uşaq fəryadları eşidilir.

Qacar

(*dağ başından yanan kəndin alovlarını seyr edərək*)

Yan, yan, tərlanların yaşıl yuvası!
Ruhuma can verir ölüm havası...
Çıxsın asimana odlar, alovlar,
Göylərdən od töksün yerə ruzigar!

Yan, yan! Kömür olsun hər qaya, hər dağ,
Baş əysin hökmümə bütün Qarabağ!
Üzsün qan içində gəlinlər, qızlar,
Yerdə göyərçinlər, göydə ulduzlar.
Ana qarnındakı o qandanam mən...
Bütün kainata qan olsun kəfən!
Mənim vicdanım da, qəlbim də qandır,
Dünya qan üstündə bir xanimandır...

V ə z i r

Buyruq sizinkidir, adil hökmdar,
Sizdə fəzilət də, ədalət də var.

Q a p ı ç ı

(*Qacara yaxınlaşaraq*)

Şahim! Bağışlayın, hüzurinizə
Bir kəndli gəlmişdir, sözü var sizə.

Q a c a r

De, gəlsin!

Q a p ı ç ı

Gəl, ata, gəl, budur Qacar!

Qoca kəndli yaxınlaşır.

Q o c a

Sizə bir sözüm var, böyük hökmdar!
Mən bu yanan kəndin ağsaqqalıyam,
Ellərin dərdindən bir az halıyam.
Yanır od içində körpə uşaqlar,
Bizim kəndlilərin nə təqsiri var?

Əmr edin, dayansın yanğınlar, barı,
Xaraba qoymayın bu obaları!
Bu dağlar qoynunda aslan yatmışdır,
Burda koroğlular at oynatmışdır...

Q a c a r

(*hiddətlənərək qocanın səsini kəsir*)

Yaxşı! Sus, qoca köpək!

(*Kinayə ilə.*)

Burda koroğlular at oynatmışdır...

Qacar gedir.

Q o c a

(*Qacarın arxasınca*)

Ah, cəllad, bimürvət! İndi qulaq as,
Süleyman dünyası sənə də qalmaz.

(*Qalxıb gedir.*)

Qacar yenə qayıdır. Qaya başında dayanır. Bu arada Qacarın sərkərdəsi tələsik gəlir.

S ə r k ə r d ə

Şahim! Arxa cəbhə çox qorxuludur,
Elə bil, doğrudan cahan yoludur...
Eldarın dəstəsi gəlir irəli,
Qırır sərçə kimi bizimkiləri,
Odur yaxınlaşır! Gizlənin, barı...
Tutaq qabaqdakı qayalıqları,
Oralar çox bərkdir...

Q a c a r

Çəkin atları!
Bir bölük göndərin arxaya sarı,
Qabağı saxlasın gizlənincə biz.

S ə r k ə r d ə

Budur, burdadır ki, əsgərlərimiz.

Qapıçı gəlir.

Q a p ı ç ı

Şahim! Qarabağın şeyxidir gələn.

Q a c a r

De, gəlsin!

Şeyx bir dəstə əyan ilə gəlir.

Ş e y x

Ey şahim! Ey fəxri-vətən!
Sizin yolunuzu gözləyirdik biz,
Sizə duaçıdır nəsillərimiz...
Buyurun, qapımız açıqdır sizə;
Yurdu tapşırırıq əllərinizə.

Q a c a r

(*kinayə ilə*)

Yaxşı, bəs nə oldu, o İbrahim xan?

Ş e y x

Siz arxayın olun İbrahim xandan!
Bu gecə qaçmışdır o Dağıstana!

Q a c a r

Ha... ha... ha... Qaçmışdır kələbaş dana!
Yaxşı, qoşul bizə, bizimlə də get,
Bu vəhşi dağlarda bələdçilik et!

Ş e y x

Buyurun, buyurun!

Gedirlər. Bir bölük əsgər danışa-danışa qabağa gəlir.

T e y m u r

Əlimiz, dişimiz, tüfəngimiz qan,
Yorulub bezmədik vuruşmalardan...
Dünyadan doymadı şahların gözü,
Lap cana doymuşam bunlardan, düzü.

Ə s g ə r

Dava meydanında bir əsgərik biz,
Nə desə hazırıq, öz sərkərdəmiz,
Sən nə danışırsan?..

T e y m u r

(*kinayəli*)

Bir əsgərik biz!..

Yıxır evimizi öz əllərimiz...
Axmaq! Bu dediyin davalarda sən
Gülləyə rast gəlib it kimi ölsən,
Şahların keyfindən nə azalacaq?

Ə s g ə r

Orduya pozğunluq gətirmə, sarsaq!
Bizi qırıb tökür bir qaçaq Eldar.

T e y m u r

Nə qədər qırsa da, onun haqqı var;
Bu torpaq onundur!

Ə s g ə r

Aha!.. satqınsan!

Qılınc vuruşuna keçirlər. Əsgərlər toplaşıb, iki tərəf olub vuruşurlar. Bu halda Eldarın dəstəsi görünür. Vuruşma gedir. Teymur və bir neçə əsgər Eldar tərəfə keçirlər.

T e y m u r

Biz də sizinləyik, gəlin, qardaşlar!

E l d a r

And için qılınca!

Əsgərlər qılınca ad içirlər. Vuruşma davam edir. Qacarın əsgərləri qaçmağa məcbur olurlar. İlyas arxadan Eldarı vurmaq istəyir, tüfəng açılmır, ikinci dəfə atana qədər Kürd Musanın gülləsi onu yıxır.

E l d a r

Bu nədir, ay Musa?!

K ü r d  M u s a

Nolacaq?! Heyvan
Vurmaq istəyirdi səni arxadan.

E l d a r

Yaxşı, di durmayın, dayanmaq olmaz!

K ü r d  M u s a

Tələsmə, gözləyək burdaca bir az,
Arxada qalanlar gəlib çatsınlar.

Bu arada Əli bəy bir neçə adamla tələsik gəlir.

Əli bəy

Ayə, hardasınız?.. Eldar, ay Eldar!

Eldar

Əli bəy, sən hardan? Tez ol, bir danış!

Əli bəy

Eldar! Daha bizə ümid qalmamış,
Çəkilin meşəyə, çəkilin, Eldar!
Nahaq qırılmasın bizim adamlar.

Eldar

(*hirsli*)

Əli bəy! Nə olub? Bir danış, niyə,
Sən nə danışırsan? Necə, geriyə?

Əli bəy

Qaçdı tülkü kimi, dan...
Qaçdı İbrahim xan, açıldı yollar,
Bizə qəh-qəh çəkib güləcək Qacar.

Arşak

(*son dərəcə hiddətli*)

Ax! Namərd... Deməli, boş qaldı qabaq!

Eldar

Vətən torpağına xəyanətə bax!

Kürd Musa

Güllə qabağında canından qorxan,
Qurumsaq!

Eldar

Yox... yox... Basılmaz Vətən!
Hələ bu dağlarda ölməmişəm mən.
Durmayın, çəkilin tez meşələrə!
Bizim yuvamızdır bu dağ, bu dərə.
Böyük bir qüvvətlə yenə gələrik,
Qacarın üstünə biz də gülərik.

Eldar gedir, adamları da onun arxasınca geri çəkilirlər.

Pərdə

## DÖRDÜNCÜ PƏRDƏ

### SƏKKİZİNCİ ŞƏKİL

Qarabağ. Şuşa qalası. Xan sarayı. Qacarın kef məclisi. Məclisdə əyanlar, bəylər iştirak edirlər.

Qacar

(*böyük bir qürurla*)

Keçdi pəncəmizə gözəl Qarabağ,
Öpsün qılıncımı hər qaya, hər dağ,
Mən Qacar nəsliyəm, şahlar şahıyam,
Mən də yer üzünün bir Allahıyam.
Gərək biz qoymayaq daşı daş üstə,
Atın yığın-yığın leşi baş üstə!
Mənim vicdanım da, qəlbim də qandır,
Dünya qan üstündə bir xanimandır!..





Vəzir

Buyruq sizinkidir, adil hökmdar,
Sizdə fəzilət də, ədalət də var.

Şeyx

Ey böyük hökmdar! Ey ulu Qacar!
Sizdəki qüvvətə baş əyir dağlar.
Biz də sayənizdə ömür sürürük,
Bu fani aləmdə ağ gün görürük.
Sizə kömək olsun böyük Yaradan,
Bu müqəddəs kitab, müqəddəs Quran.

Qacar

Rəqqasələr gəlsin!

Rəqqasələr oynayır. Qacar onların birini öpür. Birdən qızın döşündən itələyərək.

Deyirlər şirindir busənin dadı,
O da kor bəxtimə qismət olmadı...

(*Xanəndələrə kinayə ilə.*)

Belə deyirlər ki, ağladır yeri
Sizin Qarabağın xanəndələri.
Hünəriniz varsa, biri "Rast" oxuyun!

Xanəndə

(*oxuyur*)

Gözüm yollarda qalmışdır, xəbər yox Kür qırağından,
Usanmaq bilməyir könlüm yaşılbaşlar sorağından.
O yerlər min xəyal eylər, təbiət şerə layiqdir,
Öpər bülbül səhər tezdən gülün yaqut dodağından.

Çəmənlər, yasəmənlər göz vurub, min cilvə göstərsə,
Durar könlüm, çıxar seyrə həyatın qəm otağından...
Keçər aylar, keçər illər, yaz, ey Vaqif, ömür azdır,
Düşər bir gün laçın könlün şeir-sənət marağından.

Q a c a r

Qəzəl Vaqifindir?

Ş e y x

Bəli, Vaqifin!

Q a c a r

Nə oldu? Onu tez tapıb gətirin!

Sərkərdə baş əyib çıxır.

Vəzir! Bu doğrudan böyük qüdrətdir,
Hər sözü, söhbəti canlı sənətdir.
Böyük təhlükədir bu şair bizə,
Sən nə fikirdəsən?

V ə z i r

Nə deyim sizə,
Buyruq sizinkidir, adil hökmdar,
Sizdə fəzilət də var, ədalət də var...

Ş e y x

Şahim! Təhlükədir Vaqif, doğrudan,
Onu gözünüzdən qoymayın bir an...
Deyir, qanunlarda yoxdur həqiqət,
Deyir ki, pərdədir bütün şəriət,
Nədənsə el-oba çox sevir onu,
Bilməyir bu qədər tərs olduğunu.

Bir də, bərk dostudur o qaçaq Eldar –
Sizin düşməniniz, bəli, o murdar!
Vaqif yaşadıqca – qorxudur bizə,
Şair görünməsin gözlərinizə!..

Q a c a r

Yazdığı cavabdan bilmişəm onu,
Dayan, sovuraram göyə tozunu!
Qoy gəlsin, əylənib gülüşək bir az,
Bizim dilimizi o bağlayammaz.

Təlxək hürə-hürə gəlir.

Q a c a r

Təlxək, yenə hürürsən?

T ə l x ə k

(*əyanları göstərərək*)

Şah sağ olsun, bu sürüyə
Bəs bir köpək deyil gərək?

Hamı gülür.

Q a c a r

Təlxək, söylə, məni çoxmu sevirsən?

T ə l x ə k

Şahim, yaranmadan qulunuzam mən...

Q a c a r

Bir de görüm, məni əsir alsalar,
Qaranlıq zindana tutub salsalar,
Neylərsən?

T ə l x ə k

Neylərəm? Neylərəm? Aman!..
Keçərəm yolunda baş ilə candan...
Sizi zindanlara salsalar əgər,
İnsan boğazlaram düz otuz nəfər...

Q a c a r

(*ayağa qalxıb qızıl kəmərini göstərərək*)

Təlxək, kəmərimin qiymətidir bu.

T ə l x ə k

Şahim! Elə mən də bilirəm bunu.
Kəmərdən qiymətli sizdə nə var ki?

Gülüş. Vaqifi gətirirlər.

Q a c a r

(*heyrətlə*)

Aha... baş əyməyir hüzurumda bu!

Ş e y x

Yoxdur vicdanında qanun qorxusu.

Q a c a r

(*Vaqifə*)

Şair, hökmdarın hüzurundasan!

V a q i f

Bunu sizsiz belə düşünürəm mən.

Q a c a r

Bəs baş əymədiniz?

V a q i f

Əymədim, bəli!
Əyilməz vicdanın böyük heykəli...

Q a c a r

Qılınclar toqquşub iş görən zaman,
Neylər dediyiniz quru bir vicdan?

V a q i f

Vicdan dedikləri bir həqiqətdir –
Beşiyi, məzarı əbədiyyətdir...

Q a c a r

Bəs zindan necədir, qaranlıq zindan?!

V a q i f

Soyuq məzara da zinətdir insan.

Q a c a r

Yenə göylərdədir şair xəyalın?

V a q i f

Əzəldən hüdudu yoxdur kamalın...

Q a c a r

Aha... sınayırdım idrakınızı,
Doğrudan bir şair görürəm sizi,
Xoşbəxt xəlq eləmiş sizi Yaradan!

V a q i f

Dünyada qalacaq yalnız Yaradan!..

Q a c a r

Çox gözəl, çox gözəl, inanın ki, mən
Sizin ruhunuzu sevdim ürəkdən.
Bu dövlət, bu cəlal, bu şanlı saray,
Göylərin büsatı o ulduz, o ay
Sizə tapşırılsın bu gündən gərək.
Ancaq bir şərtim var.

V a q i f

Buyurun görək!

Q a c a r

Gərək fars dilində yazsın sənətkar.

V a q i f

Azəri yurdunun oğluyam mən də,
Az-az uydururam yeri gələndə.

Q a c a r

Yaxşı, gəl əl götür bu inadından,
Bu qədər naşükür olmasın insan!

V a q i f

Aldada bilməmiş dünyanın varı
Bir məslək eşqilə yaşayanları!
Mən ellər bağında azad bir quşam,
Mənsəbə, şöhrətə satılmamışam!..

V ə z i r

Yaxşı da... Çarıqlı kiçik bir ölkə
Böyük Firdovsilər yaratdı bəlkə?..

V a q i f

Dayan! Bu bağçanın hər bir budağı
Üstündə min çiçək, min dil bitirmiş,
Sizin güldüyünüz çoban torpağı
Nizamilər, Füzulilər yetirmiş!

Q a c a r

(*kinayə ilə*)

Nizamiyə bax... Füzuliyə bax...

V a q i f

Günəşi örtsə də qara buludlar,
Yenə Günəş adlı bir qüdrəti var.

Q a c a r

Görünür Günəşə iştahan vardır.

V a q i f

Günəşdən gizlənən yarasalardır...

Ş e y x

Buna qulaq asmaq çətin peşədir.

V a q i f

Niyə, qulağınız çoxdan şəşədir –
Böhtan eşidəndə qızarıb yanar,
Doğru söz gələndə pambıq tıxanar.

V ə z i r

Sizin sözünüzün kəsəri azdır.

V a q i f

Oxuyan bülbüldür, dinləyən qazdır!

V ə z i r

Of... Məndə olsaydı bundakı hünər!..

V a q i f

Ağılsız köpəklər ulduza hürər.

Q a c a r

(*vəzirə*)

Di, ver cavabını, nə durmusan? Din!
Hə... yenə döyükür sarsaq gözlərin!..

V a q i f

Neyləsin, yazığın nə təqsiri var?
İşıq güclənəndə çaşar qarovlar...

Ş e y x

(*kinayə ilə*)

Şairə sənətdir tikanlı sözlər.

V a q i f

Sözdən qızarmaz ki, bozarmış üzlər...

Qapıçı daxil olur.

Q a p ı ç ı

Şahim, bir qoca var, gəlsin içəri?

Q a c a r

De, gəlsin.

Vidadi daxil olub təzim edir.

V i d a d i

Hakimin hökmü, hünəri
Onun vicdanilə qardaş olmalı!
Bizə qalmayacaq dünyanın malı...

(*Vaqifi göstərərək.*)

Şairdir... qəlbi var, şirin sözü var,
Böyük bir ölkənin onda gözü var,
O ölsə... dağlar da dil deyib ağlar,
Əfv edin... yaxşılıq qalır yadigar.

Q a c a r

Dinin düşmənidir, o, ölsün gərək!

V i d a d i

Xeyr! o Vaqifdir, eşqə gələrək
Bəzən qamçılayır zəmanəsini,
Allah da çox sevir şerin səsini.

Q a c a r

(*acıqlı*)

Allah da çox sevir? Allaha yalvar,
Onun məndən də çox ədaləti var,
Əgər bacarırsa, qoy sağ saxlasın...

V i d a d i

Siz hökmdarsınız...

Q a c a r

Yaxşı, qoca, mən,
Artıq əl çəkirəm ölüm fikrindən.
Ancaq kəsəcəyəm yazan əlini,
Bir də həcv deyən acı dilini.
Razısan?

V a q i f

Razıyam, böyük hökmdar!..
Mərhəmət sahibi olur ağalar.
Eyb etməz, sizə də çatar bir əvəz,
Qatır cinsisiniz, doğub törəməz.

Q a c a r

Vaqif, indi get,
Saray həyatını büsbütün tərk et,
Gərək yaşamasın qədrnaşünas!

V a q i f

Sənsə həqiqətin ağzına daş bas!
Mən az görməmişəm bu sarayları,
Burda göyə çıxan ahü vayları...
Görmüşəm şahların vəfasını mən,
Xanların zülmünü, cəfasını mən.
Görmüşəm zamanın min rüzgarını,
Dustaq anaların göz yaşlarını.

Nifrət! Qan çanağı taclara nifrət!
Var olsun azadlıq, bir də məhəbbət...

Çıxır.

Q a c a r

(*hiddətlənərək, Vaqifin arxasınca*)

Aparın, aparın onu zindana,
Göz dağı çəkdirin Azərbaycana!

V i d a d i

Qızılı udsa da qara torpaqlar,
Yenə qiymətini özündə saxlar...

Çıxır.

Q a c a r

Bəri bax, dayanma, burda Zülfüqar!
Vaqifi zindana sən özün apar,
Bir quş da səkməsin onun yanından!

Q a p ı ç ı

(*ikimənalı*)

Baş üstə, yatmaram gecəni bir an,
Əsən küləkdən də gözlərəm onu...

Q a c a r

Mənim vicdanım da, qəlbim də qandır,
Dünya qan üstündə bir xanimandır!..

V ə z i r

Buyruq sizinkidir, adil hökmdar
Sizdə fəzilət də, ədalət də var...

Q a c a r

(*dəlicəsinə*)

Dağılın, dağılın, boğuldum yenə...

Hamı çıxır.

Q a c a r

(*öz-özünə*)

Nə deyim, nə deyim tale deyənə?
Könlüm ayrılmayır xanimanından,
Gözlərim doymayır insan qanından.

(*Xəstə kimi özündən şübhələnərək.*)

Bu nədir, canımda üşütmələr var?
Aha... nə dərindir bu uçurumlar?..
Gözlərim qaralır... aman... ölürəm!..
Ha... ha... ha... Bu nədir? Yoxsa gülürəm?
Günahsız qanlarmı gözümə durur?

(*Özünün nəbzini tutaraq.*)

Yox, yox! Hələ qəlbim qaydayla vurur,
Xeyr, ölməmişəm hələlik sağam,
İndi mən ölümlə çarpışacağam!

Qılıncı çıxarır, qolları boşalır, qılınca dirsəklənərək taqətsiz bir vəziyyət alır.

P ə r d ə

## DOQQUZUNCU ŞƏKİL

Şuşa qalası. Qayalıqda zindan. Səhərdir, günəş yenicə qalxır. Vaqif divara şeir yazır, sonra da yazdığı şeri oxuyur. Əli bəy qulaq asır.

V a q i f

Mən cahan mülkündə mütləq doğru halət görmədim,
Hər nə gördüm əyri gördüm, özgə babət görmədim.
Aşinalar ixtilatında sədaqət görmədim,
Beyəti-iqrari-imani-dəyanət görmədim.

Müxtəsər kim, böylə dünyadan gərək etmək həzər,
Ondan ötrü kim, deyildir öz yerində xeyrü şər. –
Alilər xaki-məzəllətdə, dənilər mötəbər,
Sahibi-zərdə kərəm yoxdur, kərəm əhlində zər,
İşlənən işlərdə əhkami-ləyaqət görmədim...

(*Oğluna baxaraq.*)

Ah, oğlum, of, mənim qəhrəman oğlum!
Bu qədər qəm yemə, qurbanın olum!

Ə l i  b ə y

Eh... ata, nə qoyub, nə axtarırsan,
Zülmün qabağında ağlarmı insan?

V a q i f

Mərhəba, mərhəba, qəhrəman oğlum!
Bir gəl öpüm səni, pəhləvan oğlum!

(*Oğlunu qucaqlayıb bərk-bərk öpür.*)

Gözümün işığı, canım, ciyərim,
Bu nəmli torpaqlar olsa da yerim,
Mənim nə dərdim var, təki sən yaşa!
Of, Qacar... vicdanın döndümü daşa?

Əli bəy

Ata, bilirsənmi?

Vaqif

Nəyi? De, nə var?

Əli bəy

Hələ də çöllərdə qaçaqdır Eldar –
Sənin köhnə dostun vardı bir zaman;
Sən özün qurtardın onu zindandan.

Vaqif

Bilirəm, bilirəm.

Əli bəy

Yaz ki, Eldara,
Yaman bir gündəyəm, düşmüşəm dara,
Bir kömək əli ver!

Vaqif

Yazım, qoy yazım...

(*Cibindən dəftərçə çıxarıb yazır.*)

Gülnar

Tələsik gəlib qapıçının ovcuna pul basaraq, pəncərədən.

Əli bəy, Əli bəy!

Əli bəy

Ata, Gülnardır!

V a q i f

Sənin sevgilinin vəfası vardır!

G ü l n a r

(*əlindəki kiçik bağlamanı pəncərədən uzadaraq*)

Alın, ac qalmayın...

(*Ağlayır.*)

Ə l i  b ə y

Ağlama, Gülnar!

V a q i f

Qızım, hər gecənin bir gündüzü var,
Sənə halal olsun hər əməyimiz,
Yoxdur səndən özgə bir köməyimiz.
Ala bu məktubu, qoynunda gizlə,
Onu gözün kimi qoruyub gözlə,
Çatdır hardadırsa, qaçaq Eldara!

G ü l n a r

Siz arxayın olun.

(*Çaparaq gedir.*)

V a q i f

(*oğluna*)

Bir bax Gülnara,
Atalar sözüdür, yaxşı qulaq as:
Aslanın erkəyi, dişisi olmaz!
Ellər qurtaracaq bizi bu dardan,
Dünya ayırmasın səni Gülnardan!

Doğmuş günəşə şairanə bir göz gəzdirərək.

Odur, bax, günəşin rənginə bir bax!
Yanır kainata işıq saçaraq.
O günəş gəncliyin timsalıdır, bil,
Gəncliyin günəşi saralan deyil.
Can balam, parlasın ömrün günəş tək,
Nə can yanğısı gör, nə iztirab çək!

Əli bəyin başını sinəsinə doğru çəkərək onu oxşayır. Vidadi gəlir, qapıçı buraxmaq istəmir.

Zülfüqar

Olmaz, kişi, bir dayan,
Bizi işə salarsan.

Vidadi

Yox, mən onu görəm gərək,
Kor eləsin səni fələk
Məni geri qaytarsan!

Qapıçı qapını açaraq.

Zülfüqar

Di gəl, tez ol, tez qayıt ha!
Xəbər çatar birdən şaha.
Onsuz da çox qudurğandır,
Çörəyi qan, suyu qandır...

Vidadi daxil olur. Vaqifi qucaqlayır.

Vidadi

Nə qədər yalvardım yenə Qacara,
Dedi: – Get, səni də çəkdirrəm dara...

Sonra bütün gecə xəyala vardım,
Allaha üz tutub yenə yalvardım.
Onda da görmədim vicdandan əsər,
Doğru deyirsənmiş, aldanmış bəşər!
Bir kömək gəlməyir sizə əlimdən,
Sözüm yerə düşdü... niyə sağam mən?!

V a q i f

Qardaşım! Sən nahaq yalvardın ona,
Söz əsər eləməz qəlbi pozğuna...
Bir də, qorxmayıram mən heç ölümdən,
Dünyanın qəlbində qalacağam mən!

V i d a d i

Yox, yox, ölüm sənə yaraşmayır heç!

V a q i f

Vidadi! Gəl məndən birdəfəlik keç,
Qayıt kəndimizə, qorxuram səndən;
Barı, Vidadisiz qalmasın Vətən...

V i d a d i

Necə? Mən qayıdım? Bunu görməzsən,
Sən ölən torpaqda öləcəyəm mən!..

Qapıçı Vidadini çəkə-çəkə aparır. Vaqif fikrə gedir.

Ə l i  b ə y

Ata, lap heyranam Vidadiyə mən,
Doğrudan o sənə yanır ürəkdən.
Nə təmiz, nə böyük təbiəti var,
Ona bənzəsəydi bütün insanlar!..

V a q i f

Böyük təbiətlər yaranır az-az
Hər yerdə, hər zaman inci tapılmaz...

Pauza. Həzin musiqi səsi. Xuraman pəjmürdə və son dərəcə dalğın gəlir.

X u r a m a n

(*zəif bir səslə*)

Vaqif! Ey sərvərim, ey tacidarım!

V a q i f

(*acı bir fəryadla*)

Nə var, nə deyirsən, vəfalı yarım?

X u r a m a n

Uydum bu dünyada nazü nemətə,
Özüm də bilmədən uydum şöhrətə.
Bilmədim axırı zəhrimarımış...
Hər qızıl xəzinə bir şahmarımış...
İndi öz əlinlə gəl öldür məni,
Nə qədər alçaldım, alçaltdım səni...

V a q i f

(*daha şiddətli*)

Get, get, vəfasızsan bu dünya kimi!
Görünmə gözümə bir röya kimi...

Xuraman məyus və peşman qayıdır, uzaqdan onun qəmgin səsi eşidilir.

X u r a m a n

Bir ceyrandım, ürkütdülər yatağımdan,
Bir quş idim, ayrı düşdüm budağımdan,
Külək əsər, yarpaq düşər, çiçək solar...
Viran qalmış mənim bu can otağımdan.

V a q i f

(*bu nəğmədən mütəəssir olaraq*)

Budur, yer üzünün əşrəfi insan
Yaradır gündə bir hicranlı dastan.
Nəydi o yazığın, nəydi günahı?
İndi çöllərmidir onun pənahı?
İnsan! O müqəddəs bir kainatdır,
O saf qəlbi pozan yalnız həyatdır...

(*Tez pəncərədən.*)

Qapıçı, qapıçı, çağır gedəni!
Oğul! lap oyatdı o mahnı məni.
Bəzən yanılsa da gözəl bir mələk,
Ondan iyrənsə də, hər duyan ürək,
Buna müqəssirdir, şübhəsiz, zaman...

Q a p ı ç ı

(*qayıdaraq*)

Özünü qayadan atdı Xuraman!

V a q i f

(*başını əlləri arasına alaraq fəryadla*)

Of... partla, ürəyim! Yazıq Xuraman!
Bizim eşqimizi məhv etdi zaman...

P ə r d ə

## BEŞİNCİ PƏRDƏ

### ONUNCU ŞƏKİL

Meşə. Eldarın dəstəsi bu dəfə əvvəlkindən çox görünür. Eldar qaya başından dərəyə baxır, sonra ayağının altındakı qayaya baxaraq.

E l d a r

Budur Qız qayası – hicran yuvası!
Başından çox əsmiş ölüm havası.
Bağrını deşdikcə hər soyuq külək,
Ah çəkib, of demiş, köks ötürərək...
O hələ almamış bu dünyadan pay,
Dərdini duymamış nə ulduz, nə ay.
Ona həmdəm olmuş saralan şamlar,
Qəlbi hicran çəkmiş qərib axşamlar...
Of, yazıq analar, of, igid Vətən!
Nələr çəkməmişsən bu dünyada sən...
Qılınclar, nizələr, dəmir qalxanlar,
Sinəndə at çapan şahlar, xaqanlar
Səni parçaladı, diddi ətini,
Qəlbini, hissini, məhəbbətini...

A r ş a k

Eldar! Yenə fikrə cumubsan!

E l d a r

Arşak!
Bir gəl. bu qaralan dərələrə bax!

A r ş a k

Baxıram, nə var ki, susuzdur dərə.

E l d a r

Yaxşı bax, yaxşı bax o sümüklərə!
Görürsən? – Kəllələr, əllər, ayaqlar...

A r ş a k

Onları görməsə gözüm. ay Eldar,
Mənim bu çöllərdə nə azarım var?
Elə bil, od yağır yenə havadan...

E l d a r

Dərdini bilirəm, Sayat-Novadan
Bir ağız deməsən, dincələnməzsən.
De, başına dönüm, de gəlsin!

A r ş a k

Otur!

(*Sayat-Novadan oxuyur*)

E l d a r

Nə gözəl sözlərdir – duzlu, məzəli...
Aşığı yaradır ellər gözəli.

A r ş a k

Eldar, bəs nə oldu Məhəmməd Qacar?
De görək neyləyək, nə tədbirin var?..

E l d a r

Arada ellərin çox axdı qanı,
Kürd Musa axtarır İbrahim xanı;

Hardasa gizlənib, tapacaq onu.
Qacarla bitəcək davanın sonu.

A r ş a k

Ah! zəhərlədi bütün havanı,
Saz tutub söz deyən Sayat-Novanı
O qurd parçaladı, Tiflisdə, o qurd!
İlana bənzəyən o qara bulud!..

E l d a r

Didib dağıtsaydım zalım Qacarı...

A r ş a k

Gürcülər köməyə çatsaydı, barı!

E l d a r

Çatarlar, çatarlar!

T e y m u r

Gələn var, ehey!..

A r ş a k

Böyük bir dəstədir o gələn, Eldar!

E l d a r

Musa, bir yoxla tez!

A r ş a k

Olmasın Qacar!

T e y m u r

Aha, üstümüzü yaman aldılar...

E l d a r

Arşak, sən dərənin boğazında dur,
Teymur, Haça dağa...

T e y m u r

Gəlirlər, odur!

E l d a r

Keçinin əcəli yetişən zaman
Çoban çomağına sürtünər heyvan.

K ü r d  M u s a

(*qışqıra-qışqıra gəlir*)

Ay Eldar! Gürcülər gəldi, ay Eldar!

E l d a r

Necə, gürcülərdir?

K ü r d  M u s a

Onlardır, onlar!

E l d a r

(*gürcüləri qarşılayaraq*)

Bu dağlar sizindir, əziz qardaşlar!
Ellərin ağzilə öpürəm sizi,
O azadlıq sevən qəlblərinizi.

Görüşüb öpüşürlər.

Əyləşin, əyləşin, dincəlin bir az!

(*hamı əyləşir*)

Of... ötür qəlbimdə min sədəfli saz,
Çoxdan istədiyim bu qardaşlığın
Bu dağlardan böyük qüvvəti var.
Qoy indi tablasın Məhəmməd Qacar!..

Kabab-çörək gətirirlər, yemək başlanır.

E l d a r

(*Tamaraya*)

Bacım! Siz nə üçün gəldiniz yenə?

T a m a r a

Yaxın gəl, qulaq as qəlbim deyənə.
Bu ana qəlbidir, gəl onu sən yar,
Gör nə döyüntülər, nə ağrılar var!

E l d a r

Aha... dərdlisiniz, danışın, barı!

T a m a r a

Soldu gəncliyimin ilk yarpaqları.
Gözümün işığı bir balam vardı,
Yenicə-yenicə top oynadardı,
Onu parçaladı düşmən gülləsi;
Susdu bülbül kimi balamın səsi.
Sinəmə dağ çəkdi Məhəmməd Qacar,
Amandı, onu tap, mənə ver, Eldar!
Qoy boğsun o əli qanlı murdarı
Bir ana qəlbinin hıçqırıqları!..

Ş a l i k o

Eldar! Doğrudan da Məhəmməd Qacar
Tiflisi odlara qaladı keçdi;
Of! O sürək görmüş dişi canavar
Bizi quduz kimi daladı keçdi;
Yandı şəhərdəki böyük binalar,
Qucaqda körpəsi yandı analar.
Bax, bu gözlərimlə onları saydım,
Of... bircə Qacarı parçalasaydım!..

E l d a r

Kefini heç pozma, vətən qardaşı,
Əzilər dediyin ilanın başı.

A r ş a k

Şaliko, Şaliko! Qüvvət bizdədir,
Dünyanın cilovu əlimizdədir.

K ü r d  M u s a

Canım, qaraltmayın bir qanınızı,
Düşmən almayıb ki, dörd yanınızı,
Nə çox "Qacar" deyib söyləyirsiniz?
Elin basılmayan qalasıyıq biz.

E l d a r

Eləsə məşq ilə necədir aran?

K ü r d  M u s a

Varam, bərk dayan ha...
Sağalmaz yaran...

Eldar

Ha... ha... ha... buna bax,
Buna bax, Arşak!
Çıxar qılıncını, südəmər uşaq!

Arşak

Çalın, cəngi çalın!

Musiqi. Eldar və Kürd Musa qılınc döyüşdürürlər.

Kürd Musa

Dayan, kəklik əti yeməmisən sən!

Eldar

Sənə yedirtmişəm, gəlsin gözündən!

Musiqi. Qılınc döyüşü davam edir, iki tərəf olurlar. Şaliko qılıncını onların arasına tutur.

Şaliko

Canım! Zarafat bu boyda!..

Gülüş.

Tamara

Doğrudan, Eldar!
Qılınc döyüşündə məharətin var!

Kiçik gürcü

Bu dağlar mülkünün pələngi sənsən!

E l d a r

(*Gürcülərin birinin əlindəki çonquriyə baxaraq*)

Bu nədir?

G ü r c ü

Çonquri deyirik buna,
Sizin saz kimidir.

E l d a r

Yaxşı, çalsana!..
Xoşdur bu dağların sərin havası,
Çal, qarışsın onu gürcü havası!..

Gürcü çalır.

T a m a r a

(*Rustavelidən oxuyur.*)

Tərif edək Tamaranı, axıdaraq göz yaşları,
Əzəl başdan qəzəl deyib mədh etməmiş o dildarı,
Mürəkkəbim şəvə göllər, qələmim göl qamışları,
Bunlar duyan ürəkləri deşəcəkdir nizavarı.
Mən Rustaveli, bir eşq üçün can qoymuşam bu əsərə.
Mən Məcnunam orduların sərkərdəsi bir dilbərə,
Məhəbbətin dərmanı yox, üz tutsam da təbiblərə.
Ya can versin canan mənə, ya tapşırsın quru yerə.

E l d a r

Deyin, Rustaveli kimin adıdır?

T a m a r a

O, gürcü şerinin ilk ustadıdır.

E l d a r

Bəh-bəh, onu doğan nə bəxtiyardır,
Bizim Nizami tək kəlamı vardır.

Oyun... Uzaqdan tüfəng səsi eşidilir. Gülnar gəlir, hamı ayağa qalxır. Eldar özünü qabağa verir. Gülnar kəlağayını açaraq, Eldarın qarşısına atır və ona məktub uzadır, hamı heyrətə düşür.

G ü l n a r

Al, qardaşım, al, Eldar!
Vaqifin məktubu var!

Eldar məktubu alır və ucadan oxuyur, hamı diqqətlə dinləyir.

E l d a r

"Oxu, bu naməni, əzizim Eldar!
Qoy mənim dərdimi dinləsin dağlar.
Bir tərlan xəyallı qəlbi xəstəyəm,
Bir şeyda bülbüləm, daş qəfəsdəyəm...
Əzizim! Saldılar məni zindana,
Şəriət dillərdə oldu bəhana,
Gəl, dağıt, parçala bu daş qəfəsi,
Ölməsin şairin həqiqət səsi!
Sən də qurtarmasan Vaqifi dardan,
Yoxdur umacağım pərvərdigardan!"

Hər tərəfdən Qacarın ünvanına nifrət və söyüş səsləri eşidilir. Böyük bir həyəcan qopur.

E l d a r

Of.. Yenə beynimə sıçradı al qan!
Baxın, layiqmidir Vaqifə zindan!

Bu arada bir qoca kəndli bir dəstə kəndli ilə gəlir.

Q o c a

Eldar hansınızdır?

E l d a r

Mənəm, ay əmi!

Q o c a

Oğlum, adın düşüb bütün dillərə,
Bəlkə, gün ağladın bizim ellərə.
Sənə qiymətli bir baxşayışım var,
Mənə də atamdan qalıb yadigar...

E l d a r

O nədir, ay əmi?

Q o c a

(*yapıncının altından bir qılınc çıxararaq*)

Buyur! Misri qılınc deyərlər buna,
Sadiq yaşamışdır ana yurduna.
Böyük Koroğludan qalmış yadigar,
Budur, dəstəsində barmaq yeri var.
Al, oğlum! Göz üstə saxla sən bunu,
Yaşat ürəyində qoç Koroğlunu!
Sənə bata bilməz nə xan, nə paşa,
Yalnız yoxsulların eşqilə yaşa!
Vur! Vuran əllərin görüm var olsun,
Qacarın başına dünya dar olsun!

Eldar qılıncı alır, hörmət və məhəbbətlə ona xeyli baxır
və diz çökərək qılıncı öpür.

E l d a r

Qıratın yalında qıvrılıb yatan,
Xanların, bəylərin gözünə batan,
Zalıma göz dağı, bizə şan qılınc,
Azadlıq uğrunda vuruşan qılınc!
İndi dayansın Qacar!
Cəngi çalın hücum var!

Silahlar göyə qalxır, ura səsləri ucalır. Eldarın dəstəsi hücuma keçir.

P ə r d ə

## ON BİRİNCİ ŞƏKİL

Şuşa qalası.Cıdır düzü. Günəş batmaq üzrədir. İki nəfər çoban qayaya arxalanaraq oturmuşlar, onların biri ney çalır.

M u r a d

Qasım!

Q a s ı m

Nə var?

M u r a d

Canına azar!
Elə, belə gəlib, belə də getdik.
Nə bir günə çatdıq, nə kama yetdik...

Q a s ı m

Nə var? Bir de da...

M u r a d

Çor nə var, nə var!..
Bilirsən neyləyir Məhəmməd Qacar?!

Q a s ı m

Neyləyir?

M u r a d

Vaqifi öldürür Qacar...

Q a s ı m

Yox, əyə, bu boyda qansızlıq olar?

M u r a d

Sən öl, düz deyirəm!

Q a s ı m

Vay sənin... can... can...
Əyə, lap üşütmə qopdu canımdan.

M u r a d

Bəli, öldürürlər Molla Pənahı...

Q a s ı m

Görəsən, yazığın nəymiş günahı?

M u r a d

Deyirlər, Vaqifə demiş ki, Qacar,
Çarıqlı tayfadan nə şair olar?

O da həcv eləmiş o zülmkarı,
Buna acıqlanıb zalım hökmdar.

Q a s ı m

Murad!.. Əyə... sənin yaxşı səsin var,
Onun sözlərindən bir oxu, barı!

M u r a d

(*oxuyur*)

Xumar-xumar baxmaq göz qaydasıdır,
Lalə tək qızarmaq üz qaydasıdır.
Pərişanlıq zülfün öz qaydasıdır
Nə badi-səbadən, nə şanədəndir.

Q a s ı m

(*dizinə vuraraq*)

Vay, sənin gözlərin kor olsun, Qacar!
Bir gör, Vaqifə də heç adam qıyar!

(*Heyrətlə ətrafa baxaraq.*)

Murad, Murad, əyə, gətirirlər, bax!

M u r a d

(*Heyrətlə baxır və göylərə üsyan edir kimi.*)

Ey fələk! Ey dünya! Ey qanlı çanaq!

Şeyx bir dəstə adamla Vaqifi və oğlu Əli bəyi gətirir.

Ş e y x

Dayanın!

V a q i f

(*tənəli*)

Mümkünmü durub dayanmaq...

Ş e y x

Oğlum, sən Allahın qüdrətinə bax!

Ə l i   b ə y

Nə oldu, tez deyin, gəlsin cəlladlar!
Uzun mırıldama, satılmış alçaq!
Səni də udacaq bu qara torpaq!..

Ş e y x

(*ətrafa*)

Əstəğfürullah...
Kafirə bir bax!

V a q i f

(*qürub etməkdə olan günəşi həsrətli gözləri ilə seyr edərək, oğluna*)

Günəş qürub edir... sönür kainat.
Əzəldən belədir vəfasız həyat...

(*Günəşi göstərərək.*)

O, mənim ömrümün timsalıdır, bax!
Sönən bir varlığın xəyalıdır, bax!
Mən də yaradıldım, mən də parladım;
Gözəllər ağzından düşmədi adım...

İndisə yelkənim toxundu daşa,
Bir insan ömrünü vurmadım başa.
Oğul! Alışıram, yanıram, aman,
Səni öldürürlər mənim ucumdan!
Qoy uçsun başıma qayalı dağlar!..

Əli bəy

Ata!
Sənin günəş boyda bir vicdanın var –
Çiynində el dərdi daşıyacaqdır,
Bu dünya durduqca yaşayacaqdır!..

Vidadi

(*arxadan*)

Vaqif!

Vaqif

Vidadi, qardaşım, sənmisən, gəl, gəl,
Bizi ayrı saldı bimürvət əcəl!..

Vidadi

Kor olsun gözlərim, nələr görürəm!
Günəşi tutulmuş səhər görürəm...

Vaqifi və Əli bəyi çəkə-çəkə aparırlar.

Vaqif

Ağlama, qardaşım, sən yaşa, yarat!
Yaxındır gözlənən azad bir həyat.

V i d a d i

(*göylərin dərinliyinə əl qaldıraraq*)

Tfu, sənin taxtına, ey çərxi-fələk!
Daşdan yaranmamış, ətdəndir ürək!..

Cəlladlar gəlirlər.

Ş e y x

Kəlmeyi-şəhadət alın dilinizə!

V a q i f

(*oğlunu bağrına basaraq cəllada tərəf*)

Nə qədər olsa da, qanın var, cəllad!
İnsanın canından şirindir övlad,
Məni qorxutmayır bu vaxtsız əcəl.
İnsaf et, qabaqca məni öldür, gəl –
Gözlərim görməsin övlad qanını!
Uçurma könlümün xanimanını...

Ş e y x

(*kinayəli*)

Şair, rənginizdə bir sarılıq var?

V a q i f

Qafil gün batanda, rəngi saralar!

Ş e y x

Bu fani aləmi artıq unudun,
İndi üzünüzü qibləyə tutun!

Cəllad Əli bəyi çəkir, Vaqif onu buraxmır.

V a q i f

Of... Sənin gözlərin kor olsun, cəllad!
Sənə demədimmi şirindir övlad!

Şeypur çalınır, Qacar gəlir, yüksək bir yerdə dayanaraq.

Q a c a r

Ha... ha... ha... böyük şair!

(*Öz adamlarına.*)

İndi bərk durun!
Burda kəllələrdən bir qala qurun!
Göylərə dayansın qoy onun başı!
Dibindən çay kimi axsın göz yaşı.
Onun zirvəsinə yalnız və yalnız
Vaqifin başını qoymalısınız!

V i d a d i

Hökmdar! Yerlərə, göylərə bir bax,
Buludlar qaralır matəm tutaraq,
Vaqif bir oğludur əbədiyyətin,
Ölməz böyük dili şerin, sənətin...
Yalvarıram sənə, onu ver mana,
Əllərin batmasın günahsız qana!

V a q i f

(*Vidadiyə tərəf*)

Yalvarma, yalvarma, o cəllada sən!
Hələ baş əyməmiş bu böyük Vətən...

Q a c a r

(*Vidadiyə*)

Görürsən? O imiş qatı düşmənim,
Onu yandırsam da, haqqım var mənim,
Tez olun, cəlladlar!

V i d a d i

Yox, yox, qanın varsa, əmr et zülmkar,
Qoy mənim boynumu vursun cəlladlar!

(*Özünü cəlladlarla Vaqifin arasına salır.*)

Bu arada səs-küy qopur. Eldarın dəstəsi hücuma keçmişdir.
Vuruşma yaxınlaşır.

V ə z i r

Şahim, vuruşmağa gəlir ki, Eldar,
Gəl, qaçaq, gəl, qaçaq, xata toxunar!
Yox bir, basacaqdır gədənin biri
Göylərə hökm edən bir cahangiri!
Cəllad Əli bəyi vurmaq istərkən)

M u r a d

(*öz yoldaşına*)

Əyə, gəldilər!

Cəlladın başından çomaqla vurur, cəllad yıxılır. Eldar, Kürd Musa,
Gülnar və Şaliko qabaqda olmaqla, Eldarın dəstəsi görünür.

Q a c a r

(*öz adamlarına*)

Tutun, diri tutun, bu saat onu!

Vidadi Vaqifi qucaqlayıb bir tərəfə çəkir. Əli bəy Gülnarla görüşür, onun tüfəngini alıb, davaya qarışır. Şiddətli vuruşma gedir. Eldar qılınc davasında saray adamlarını yara-yara gedir.

Q a c a r

Özüm vuruşmağa qarışam gərək!

Eldar irəli gəlir. Şeyx və vəzir qaçırlar, Əli bəy şeyxi vurub qayadan salır.

E l d a r

(*Qacara müraciət edərək*)

Ehey, bəri bax!..
Arxadan vurmaq
İgidə yaramaz!

Q a c a r

Dayan, yaramaz!
Mən Qacar nəsliyəm, şahlar şahıyam,
Mən də yer üzünün bir Allahıyam!..

E l d a r

Gəl, gəl, çulu cırıq kəndliyəm mən də.
Şahla vuruşuram yeri gələndə...

Şiddətli qılınc vuruşması gedir.

Q a c a r

Mənlə vuruşmağa Koroğlu gərək!

E l d a r

(*kinayə ilə*)

Bəh... bəh... nə söz var ki, pələngsən, pələng!

Eldar Qacarı yaralayır, ancaq vuruşma yenə davam edir. Birdən Eldarın qılıncı əlindən düşür.

Q a c a r

(*dayanaraq gülür*)

Bəh... bəh...
Anan gəlsin indi tüstünə!

E l d a r

Yapıncının altından misri qılıncı çıxararaq.

Dayan! Misri qılınc gəlir üstünə...

Q a c a r

(*çaşaraq*)

Nə?.. Nə?.. Misri qılınc? Nə? Nə? Koroğlu?

Eldar Qacarı yenə qılıncla vurur. Qacarın qılıncı düşür. Qapıçı əlində sıyırma xəncər gələrək, onu arxadan vurur.

Q o c a k ə n d l i

(*Qacarın meyitinə rişxəndlə baxaraq*)

Bu dağlar qoynunda aslan yatmışdır,
Burda Koroğlular at oynatmışdır.

E l d a r

Əzildi, şahmarın zəhərli başı,
Dağıdın sarayı, bütün daş-qaşı
Paylayın aclara və yoxsullara,
Bu gün bayram olsun bütün qullara!

Ş a l i k o

Qardaşlar, bu ölən yalnız Qacardır,
Qacarlar dünyada hələ də vardır.
Onların kökünü kəsəcək yalnız
Bizim bu basılmaz qardaşlığımız!

Təlxək gəlir, Qacarın meyitinin ətrafında at kimi hərlənir, ona rişxəndlə baxaraq.

T ə l x ə k

Sizi, doğrudan da, əsir alsalar,
Qaranlıq zindana tutub salsalar,
İnsan boğazlaram düz otuz nəfər.

(*Bərk-bərk gülür.*)

Vidadi və Vaqif daxil olurlar. Hamı hörmətlə onlara baş əyir.

E l d a r

(*Vaqifə müraciət edərək*)

Möhtərəm şairə salamlar olsun!
Bu dünya durduqca o da var olsun!

V i d a d i

Aha, uzanmışdır bizim şiri-nər,
İran torpağını ləkələyənlər.

V a q i f

(*Vidadiyə*)

Ey Vidadi, gərdişi-dövrani-kəcrəftarə bax,
Ruzigarə qıl tamaşa, karə bax, kirdarə bax!
Əhli-zülmü necə bərbad eylədi bir ləhzədə,
Sən bizim dağlar pələngi qəhrəman Eldara bax!

Eldar hörmətlə Vaqifin əlindən öpür, xalq onu böyük sevinc və təntənə ilə ölüm meydanından çıxarır.

P ə r d ə

# FƏRHAD VƏ ŞİRİN

*5 pərdəli 20 şəkilli mənzum dram*

İŞTİRAK EDƏNLƏR

| | |
|---|---|
| Fərhad | – məşhur Azərbaycan heykəltəraşı |
| Xosrov | – İran hökmdarı |
| Məhin Banu | – Azərbaycan hökmdarı |
| Şirin | – Məhin Banunun qızı, Fərhadın sevgilisi |
| Şapur | – rəssam, Xosrovun əyanlarından |
| Məryəm | – Bizans hökmdarının qızı, Xosrovun arvadı |
| Azər baba | – Fərhadın atası, müdrik bir qoca |
| Vəzir | – Xosrovun vəziri |
| Fitnə | – azərbaycanlı qız, Şirinin yaxın sirdaşı |
| Şiruyə | – Xosrovun oğlu |
| Ozan | – el aşığı |

Əsgərlər, kəndlilər, əyanlar, qızlar və b.

## BİRİNCİ PƏRDƏ

### BİRİNCİ ŞƏKİL

Qədim Azərbaycan. Bərdə padşahlığı. Uca və sənətkarlıqla işlənmiş bir qala. Bu qalanın tikilib qurtarması münasibəti ilə böyük xalq bayramıdır. Ozanlar çalır, qızlar, oğlanlar rəqs edirlər.

Azər baba

(*üzünü xalqa tutaraq*)

Baxın, bu möhtəşəm gözəl hasara
Bu böyük sənətə diz çöksün hamı.
Bu məclis, bu büsat, bu el bayramı
Qoy meydan oxusun qəsbkarlara!

Ucalsın yurdumuz öz hünərilə,
Halal zəhmətilə, alın təriylə.
Qoy azad yaşasın bəxtiyar ellər,
Bizim bu ceyranlı, turaclı çöllər.
Qoy bir də yuxusuz qalmasın Vətən,
Düşmən atlarının ayaq səsindən!..

H a m ı

Qoy bir də yuxusuz qalmasın Vətən,
Düşmən atlarının ayaq səsindən.

Məhin Banu bir dəstə adamla gəlir. Hamı ehtiramla ona baş əyir.

B a n u

(*Azər babaya tərəf gedir. Onun əlindən öpür*)

Çox mübarək olsun bu bayramınız
Kef çəkib şadlanın, gülün hamınız!

S ə s l ə r

Sağ ol, Məhin Banu, sağ ol, hökmdar!

B a n u

Gözəl yurdumuza göz dikənlər var.

(*Əlini qayaya uzadaraq.*)

Fərhadın qurduğu bu qala, bu dağ
Köksünü düşmənə sipər tutacaq.
Qoy xoşbəxt yaşasın odlar ölkəsi,
Burdan kəsilməsin toy-bayram səsi!

A z ə r   b a b a

Səninlə bir eldə xoşbəxt olaq biz,
Qara gün görməsin gözəl ölkəmiz!
Sənin tədbirindir yaradan bunu,
Doğrudan sevirsən ana yurdunu...

B a n u

Xeyr, Fərhadındır bu böyük hünər,
Bu dağlar başında duran qələlər
Onun sənətilə yaranmış, bəli,
Onun hünəridir, onun əməli!
Bəs Fərhad hardadır?

A z ə r   b a b a

Bu saat gələr,
Gözə çox görünməz hər böyük hünər.

B a n u

Çağırın hardasa, çağırın onu,
Gəlsin, qucaqlayıb onun boynunu
Öpmək istəyirəm üzündən, gəlsin,
Onun şərəfinə alqış yüksəlsin!

S ə s

Budur, özü gəlir.

Maraqla baxırlar. Fərhad gəlir, baş əyir, hamı ona əl çalır.

B a n u

Fərhad, igid balam, mənə yaxın gəl,
Üzündən mən öpüm, hamıdan əvvəl!

Fərhad gəlir. Banu onun üzündən, Fərhad da Banunun əllərindən öpür

B a n u

Bu böyük sənətin qarşısında mən –
Var ol! – söyləyirəm sənə ürəkdən;
Qurduğun qalalar versin baş-başa,
Bu dünya durduqca bəxtiyar yaşa!..

F ə r h a d

(*təzim edərək*)

Dünyada yaratmaq borcumdur mənim;
Belə dərs vermişdir böyük Vətənim.
Bir də... İlham verir mənə məhəbbət,
Onun meyvəsidir bu iş, bu sənət.
Mənə çox görməsin qoy onu dövran,
Eşqimin yolunu kəsməsin hicran.

B a n u

De, kimdir, de, kimdir sevdiyin sənin?

Fərhad susur.

A z ə r  b a b a

Sevdiyi gözüdür bizim Vətənin.

B a n u

Şirinmi, qızımmı?

A z ə r  b a b a

Özüdür, bəli,
O dağlar maralı, ellər gözəli...

B a n u

O mənim qızımdır halaldır sana,
Sizi tapşırıram Azərbaycana
Tacım da, taxtım da qurbandır sizə,
Mən alqış deyirəm bu eşqinizə!..

A z ə r   b a b a

Ulu Hürmüz! Günəş parlat havada,
Özün aşiqləri yetir murada!

H a m ı

Ulu Hürmüz! Günəş parlat havada,
Özün aşiqləri yetir murada!

B a n u

Sağ ol, Azər baba! Əskik olma sən,
Fərhad igidsə də, atası sənsən.

A z ə r   b a b a

Hər namuslu oğul, hər namuslu qız
Elin balasıdır, elindir yalnız.
Gəl, oğlum, yaxın gəl, yaxın gəl bir az,
Bu dünya görmüşə yenə qulaq as!

Fərhad Azər babaya yaxınlaşır. Azər baba sol əli ilə onun boynunu qucaqlayıb sağ əli ilə qalanı göstərir.

A z ə r   b a b a

Gözəldir, canlıdır qurduğun hasar,
Lakin diqqət yetir, bir nöqsanı var.
“Hər elmi öyrənmək istədikdə sən,
Çalış ki, hər şeyi kamil biləsən.

Kamil bir palançı olsa da insan,
Yaxşıdır yarımçıq bir papaqçıdan”

F ə r h a d

Doğrudur, ata can! Nöqsanım nədir?

A z ə r  b a b a

Bu böyük sənətin bir kaşanədir,
Ancaq... o qalanın zirvəsinə bax,
Yastıdır... üstünə qar yığılacaq.
Lakin qılınc belli qurulsa hasar,
Üstündə göllənməz nə yağış, nə qar.

F ə r h a d

Doğrudur... Laxladar yağış bəndləri.

A z ə r  b a b a

Dünya binasını qurandan bəri
Öyrənmək dalınca getmişdir bəşər.
Sudan dürr çıxarmış, daşdan da gövhər!
Lakin öyrənməyi ar bilən bir şəxs
Dünyada mərifət qazana bilməz.

F ə r h a d

Doğrudur, ata can! sənsən ustadım,
Sənin şöhrətindir, mənim də adım.

(*Azər babanın əlindən öpür.*)

A z ə r  b a b a

Di, gəlin. toplaşaq o çəmənzara,
Ozanlar səs salsın uzaq dağlara!

Ş a p u r

Qoy qırx gün uzansın kef məclisimiz,
Yaşayaq, yaradaq, xoşbəxt olaq biz...

Ozanlar çalır, məclis böyük bir səadətlə gedir. Sağ tərəfdən Xosrov və Şapur oxlu, kamanlı gəlirlər.

X o s r o v

Şahim, deyirəm ki, dayanaq bir az,
Bu yerlər seyrsiz, səfasız olmaz.

Ş a p u r

Şiruyə, Şiruyə... Atları bağla!

(*Ətrafa göz gəzdirərək.*)

Doğrudan nə böyük bir təmtəraqla,
Cəlalla qurulmuş burda təbiət?..
Baxdıqca, gözəldir bu canlı sənət.

B a n u

Hələ, o səhralar, sarı sünbüllər,
Böyük bir dövlətdir pambıqlı çöllər...
Şahim, bu yerlərə diqqət ilə bax,
Gövhər mədənidir burdakı torpaq.
Hər daşın altında bir xəzinə var,
Xoşbəxtdir bu yerə sahib olanlar.

X o s r o v

Bilirəm, sözünün mənası nədir,
Bizə bu səyahət bir bəhanədir...
Gərək pəncəmizə keçsin bu dağlar,
Bu ceyranlı düzlər, almalı bağlar...

Ş a p u r

Lakin bu qalanın bürclərinə bax,
Çətindir bu yeri orduyla almaq.

X o s r o v

Nə qədər möhtəşəm bir qaladır bu,
Deyirsən batammaz İran ordusu?

Ş a p u r

Məncə, mümkün deyil belə bir hünər,
Bir tədbir tökərik keçdikcə günlər...

X o s r o v

Bilirəm, siyasət güclüdür səndə.

Ş i r u y ə

(*onların yanına gələrək*)

Şapurun fikrinə şərikəm mən də,
Batmaz bu qalaya ordu qüvvəsi.

Şərqi səsi gəlir.

Q ı z l a r

El bilir ki, sən mənimsən,
Yurdum, yuvam məskənimsən,
Anam – doğma vətənimsən,
Ayrılarmı könül candan,
Azərbaycan, Azərbaycan!..

X o s r o v

Nə qədər gözəldir qızların səsi,
Gəlin qulaq asaq.

Ş a p u r

Burda hər səhər
Dəstəylə gəzişir atəşpərəstlər.
Azadlıq sevəndir bu xalq əzəldən,
Bir də musiqidən, şerü qəzəldən
Burda ilham alır hər dünya görən.

X o s r o v

(*heyrətlə*)

Şapur, o insandır, yoxsa bir mələk?

Ş a p u r

Kimi deyirsən ki?

X o s r o v

Qabaqca gələn?

Ş a p u r

Qızdır, özünü də tanıyıram mən.

X o s r o v

Kimdir?

Ş a p u r

O Şirindir... Onun səsidir,
Odlar ölkəsinin şahzadəsidir.

X o s r o v

Nə qədər ilahi bir candır, aman,
Elə bil od qopdu bütün canımdan.

Ş i r u y ə

(*ətrafa*)

Doğrudan gözəldir... vuruldum ona.
Şah qızı layiqdir bir şah oğluna.

X o s r o v

Ceyrana bənzəyir yerişi... Şapur!..

Ş a p u r

Şahim... Sözlərindən mətləb oxunur...

Ş i r u y ə

Nə qədər gözəldir həmin sərvinaz.

X o s r o v

Ata olan yerdə oğul danışmaz!

Şiruyə təzimlə çəkilib gedir.

Ş a p u r

Şahlara layiqdir, doğrudan, o qız.

X o s r o v

Səncə, nə göstərir bizə baxtımız?

Ş a p u r

Şirini birtəhər ala bilsək biz ,
Bərdəni alarıq müharibəsiz.
Yoxsa. bu qalaya yaxın düşülməz.

X o s r o v

Gəl, burda gizlənək, yaxınlaşır səs,
Onlar seyrə gəlir bu qələləri.

Ş a p u r

Sənə qismət olsun o gözəl pəri!

Gizlənirlər. Şirin, Fitnə vurduqları ovlar da əllərində bir dəstə qızla gəlirlər. Onlar oxlu və kamanlıdırlar.

F i t n ə

Yoruldum, ay qızlar, oturaq bir az!

Ş i r i n

Dur, dur, ov vaxtında yorulmaq olmaz!

F i t n ə

Nə olub, ayağım daş-zad deyil ki...

Ş i r i n

(*qalaya diqqətlə baxaraq*)

Sənət abidəsi, seyr edin, qızlar!
Nə qədər ilahi bir görkəmi var...
Gör nələr törədir dünyada hünər.
Həyata ziynətdir hər böyük əsər.

F i t n ə

Fərhad nə yaratsa, bilirəm, gerçək,
Sənin gözlərinə xoş görünəcək...

Ş i r i n

O niyə?

F i t n ə

Nə bilim, sevənlər bilir.

Ş i r i n

(*gülür*)

Odur da, adına Fitnə deyilir,
Hər sözə bir cürə məna verirsən.

F i t n ə

Nolar həqiqəti danışanda mən?

Ş i r i n

Səncə, Fərhadı mən sevirəm, demək?..

F i t n ə

Nolar, sevmək üçün deyildir ürək?..

Ş i r i n

Yoxsa iştahın var... sevirsən sən də?

F i t n ə

Nolar, günah olar biz də sevəndə?
Qaş məndə, göz məndə, buxaq da məndə,
Dünya dağılmaz ki, biz də sevəndə?

Ş i r i n

Axı, Fitnə bacı, çox qarasan sən,
Qaralar keçərmi onun qəlbindən?

F i t n ə

Ağzının dadını nə bilir kişi,
Cibə tökərlər ki, qara kişmişi...

(*O, Şirinin boynunu qucaqlayaraq.*)

Fərhada layiqdir belə bir cavan,
Belə, Fitnə bacın gözünə qurban!
Belə, o gün olsun toyunda süzüm.

Ş i r i n

O hələ açmamış qəlbini mana...

F i t n ə

Nolar, ondan qabaq sən açılsana!
Xəncərinin qaşı yerəmi düşər?

Ş i r i n

Neyləyim, ixtiyar məndədir məgər?!
Kimsə dərk eləməz can möhnətini,
Bilməz qabaqcadan öz qismətini.
Neçə səmtə əsir bir gündə külək,
Görək, taleyimiz nə göstərəcək?..

Uzaqdan Ozanın səsi gəlir. Diqqətlə qulaq asırlar.

Ş i r i n

Ozanın havası gözəldir, Fitnə!

F i t n ə

Gedək, biz də gedək kef məclisinə!

Qızlar gedirlər. Xosrovla Şapur arxadan çıxaraq, onların dalınca baxırlar.

X o s r o v

“Kimsə dərk eləməz can möhnətini,
Bilməz qabaqcadan öz qismətini”.
Şapur! Dəryadır ki, ondakı kamal...

Ş a p u r

Kimdə ağıl varsa, bilinər dərhal.

X o s r o v

Bəs indi neyləyək, elçi göndərək?

Ş a p u r

Elçiyə dil verməz o azad mələk
Azacıq möhlət ver Şapura, şahim,
Şirin səninkidir, ey qibləgahim!

X o s r o v

Nəylə, nə hünərlə, nədir vasitən?

Ş a p u r

Özün bilirsən ki, bir rəssamam mən,
Çəkərəm əksini var qüdrətimlə,
Şaha layiq olan məhəbbətimlə.
Şirin görən kimi sənə vurular,
Sənin payın olar o nazlı nigar.

X o s r o v

Ha... ha... ha... Afərin, Şapur, afərin!..
Daşa da dil verər sənin hünərin.
Şirin öz qəlbini verərsə mana,
İran sahib olar Azərbaycana...

Ş a p u r

Bəs mənim qismətim?

X o s r o v

Sən də o zaman
Odlar ölkəsinə vali olarsan.
Razısan?

Ş a p u r

Var olsun böyük hökmdar!
Lakin unutma ki, bu əhd, bu iqrar
Gərək başa yetsin!

X o s r o v

Əmin ol buna!
Bələdsən Xosrovun kim olduğuna...

Şapur ona təzim edir.

Gedək, yaxşı keçdi səyahətimiz,
Şikar gözəl oldu, uduzmadıq biz...

Gedirlər. Şiruyə yüyürərək Şirin gedən tərəfə boylanır, sonra o da gedir.

P ə r d ə



## İKİNCİ ŞƏKİL

Bərdə yaylaqları. Səhər açılmaq üzrədir. Azərbaycan göylərinə məxsus bir təravət. Turaclar ötüşür. Get-gedə günəş üfüqdən baş qaldırır. Qızlar ikibir, üçbir Şirinin çadırının qarşısında toplaşırlar. Fitnə çadırdan içəri baxaraq, qızlara:

F i t n ə

Hələ oyanmamış... yatır şəhriyar,
Kim bilir, başında nə macəra var?

B i r i n c i  q ı z

O ki tez durardı yuxudan səhər?

F i t n ə

Neyləsin... Gec yatır indi gecələr.

İ k i n c i  q ı z

Nə üçün gec yatır?

F i t n ə

Çünki dərdi var,
Gec yatıb, gec durar dərdi olanlar.

B i r i n c i  q ı z

Onun nə dərdi var?

F i t n ə

Dərdi var, bəli...
İndi pərişandır ellər gözəli
Bilsəniz, nə qədər incədir qəlbi,
Ona dərd yaraşmır.

İkinci qız

Ay Fitnə bacı,
Şirinin nə dərdi, nə ehtiyacı?

Fitnə

Onun gözlərinə bu axır zaman
Bir xəyal görünür, bir canlı insan,
Dil açıb danışır o xəyal bəzən,
Şirini ox kimi vurur qəlbindən.
Qızcığaz tutmayır bir yerdə qərar...
Gəlin şərqi deyək, indi oyanar.

Qızlar oxuyurlar.

Oyan, oyan gözəl pəri...
Unut getsin bu qəmləri.
Oyan, öpsün ağ üzündən
İlk baharın xoş səhəri.
Oyan, oyan. gözəl pəri...

Şirin çadırdan çıxır; o, xeyli dalğındır. Qızlara baxaraq.

Şirin

Həmişə şad görüm üzünüzü mən,
Bir ağrı keçməsin ürəyinizdən.

Fitnə

Səninlə bir yerdə!

Səslər

Bir yerdə, bəli!
Var olsun şahımız, ellər gözəli.

Ş i r i n

Əyləşin, doldurun piyalələri!

(*Qızlar əyləşirlər, piyalələri doldururlar.*)

Xəyala düşdüyüm o gündən bəri
Dağ kimi şişmişdir ürəyimdə qəm,
Qaranlıq görünür gözümə aləm.

F i t n ə

Dərdin ürəyimə, gözün qurbanı...

Ş i r i n

Yaxşı, bəs səhərin tərifi hanı?

F i t n ə

Qoyursan?
Başımı itirmişəm ki...

İ k i n c i   q ı z

Danış, bir söhbət aç məclisimizə.

F i t n ə

(*əlindəki piyaləni qaldıraraq, ayağa durur.*)

Budur gözəl səhər, budur piyalə,
Ətri qızıl güldür, rəngi də lalə.
Qafil, qədrini bil gözəl gəncliyin,
Budur qanad verən zövqə, xəyalə...

İ k i n c i   q ı z

Gəncliyi eşq ilə keçirsən əgər,
Həyatın hər dəmi dünyaya dəyər.

Şüur hakim olan hər bir məclisə
Tanrı səcdə qılıb mələk baş əyər.

F i t n ə

(*daha da qızışaraq*)

Azaddır əzəldən odlar ölkəsi,
Azadlıq neyidir hər qəlbin səsi...

(*Piyaləni bir qızın piyaləsinə vurur.*)

İçək... xoşbəxtliyə dastan bağlasın
Səhər bülbülünün ilk zümzüməsi.

Qızlar piyalələri qaldırıb içirlər.

B i r i n c i  q ı z

Sağ ol, Fitnə bacı... Günün ağ olsun!

A z ə r  b a b a

(*arxa tərəfdən gələrək*)

Ömrünüz daima kef-damağ olsun,
Odlar ölkəsinin azad qızları.
Öpsün alnınızdan bahar ruzgarı...

Ş i r i n

Buyur, Azər baba, qonaq ol bizə,
Böyük şöhrət olar məclisimizə.

A z ə r  b a b a

Sağ olun, mən də çox keflər görmüşəm,
Hər bulaq başında dövran sürmüşəm.

Növbə sizinkidir, çağırın, çalın...
Düşməndən, şadlıqla intiqam alın.
Bu gün çox razıyam ziyarətimdən,
Yenə də Hürmüzə yalvardım ki, mən,
Azacıq xoş keçsin bu ilki ruzgar,
Yoxsa məhv olacaq yenə taxıllar.
Çörəksiz bir ölkə hər vaxt ac olar,
Düşmənə daima o möhtac olar...

(*Şirinin dalğın olduğunu hiss edərək.*)

Şirin, gözəl qızım, nə düşünürsən?

Ş i r i n

Heç zad, Azər baba...

A z ə r  b a b a

Yox, görürəm mən,
Görürəm dalğınsan, gizləmə, danış!

Ş i r i n

Məndə danışmağa tutar qalmamış...

A z ə r  b a b a

Şirin, gözəl qızım, görürəm ki, sən
Həddindən ziyadə xəyalpərvərsən;
Çox şirin olsa da xəyal neməti,
Axırda çox olur qəmi, möhnəti.

Ş i r i n

Lakin, Azər baba, xəyalsız ömür
Qanadsız quş kimi yazıq görünür.

Xəyaldır dünyada ən böyük əsər;
Bu aylı, ulduzlu, günəşli göylər
Xəyalla görünür bu qədər gözəl,
Xəyal səhnəsidir bu hökmi-əzəl.

A z ə r   b a b a

Sən Azər babana yaxşı qulaq as,
Bil ki, nəsihətim faydasız olmaz.
Böyük bir kitabdır həyat dəftərim,
Yazmaqla qurtarmaz təcrübələrim.

Şirin əlilə qızlara işarə edir, hamı dağılır, yalnız Fitnə qalır.

Ş i r i n

Deyin, Azər baba, bilin ki, hər dəm
Mən sizin balanız, kiçiyinizəm.
Sizdən dərs öyrənir odlar ölkəsi,
Sizdədir hər elmin həqiqət səsi.

A z ə r   b a b a

Qızım, xəyal ki, var, bir xəzinədir,
Bəs bu xəzinənin sərvəti nədir?
Xəyal qanad verir qəlbə, vicdana,
Xəyal daşları da gətirir cana,
Lakin xəyalın da dəhşətləri var...

Ş i r i n

(*heyrətlə*)

Necə? Dəhşətləri?

A z ə r   b a b a

Bəli... xəyallar
Bəzən həqiqətə boyalar vurur,
Tərlan əvəzində sərçə uçurur.

Ş i r i n

Nə sərçə?

F i t n ə

Sərçə də... bu boz sərçələr...

A z ə r   b a b a

Azacıq səbr edib dursanız əgər,
Sözümün sirri var.

Ş i r i n

Buyurun görək!

A z ə r   b a b a

Xəyal mələk kimi gülümsəyərək,
İnsanı göyə də qaldıra bilir;
Odur ki, adına xəyal deyilir.

Ş i r i n

Bu ki, çox gözəldir!..

A z ə r   b a b a

Gözəldir... ancaq...
Göydə nə çadır var, nə dayanacaq,
Adamın gözləri qaralır birdən,
Enir başı üstə durduğu yerdən.

F i t n ə

(*onun sözünü kəsərək*)

Sınıb şül-küt olur qabırğaları.

Ş i r i n

Bəs neçin göyləri yaratdı Tanrı?
O ki ən dühalı bir sənətkardır.

A z ə r  b a b a

Onun yaratdığı torpaq da vardır,
Sən torpaqdan yapış, burdadır qüvvət.
Göylərdə gördüyün o zövq, o sənət
İnsan xəyalının sonsuz yoludur,
İnsansa torpağın, suyun oğludur.

Ş i r i n

Sağ ol, Azər baba, sözlərin haqdır;
Hər vaxt qulağımda dərs olacaqdır.

A z ə r  b a b a

(*ayağa qalxaraq*)

Di, salamat qalın, ancaq, unutma,
Torpağı tərk edib, göylərdən tutma!

Gedir.

F i t n ə

Gördün nə danışır?..

Ş i r i n

Ondakı kamal
Nə qədər dərindir...

F i t n ə

Qulaq as, dərs al!

Ş i r i n

Nələr öyrətmədi bizə bu qoca,
Ürəyi təmizdir, xəyalı uca.

Birinci qız qaçaraq gəlir.

B i r i n c i  q ı z

Ay qızlar, ay qızlar, gələn var, gələn!

Ş i r i n

(*heyrətlə*)

Kimdir ki?

B i r i n c i  q ı z

Fərhada oxşadıram mən.

Ş i r i n

Fitnə... get qarşıla... gətir hörmətlə,
Ona layiq olan bir məhəbbətlə.

Fitnə gedir.

Ş i r i n

(*öz-özünə*)

Kim bilir mənə nələr deyəcək...
Aman... Eşqə düşən o böyük ürək
Birdən sızıldasa... neyləyim, Allah!
Nədir işlətdiyim bu sonsuz günah?
Neçin dərdə saldım igid Fərhadı,
Bir elə ziynətdir Fərhadın adı.

Fərhadla Fitnə gəlir. Fərhad kənarda dayanaraq.

F ə r h a d

Odlar ölkəsinin Şirin gözəli!
Nə qədər xoşbəxtəm.

Ş i r i n

Buyurun, gəlin.
Sizdə qüvvəti var hökmi-əzəlin.

Fərhad yaxına gəlir, əlini köksünə qoyub, Şirinə baş əyir.

F ə r h a d

Sizi görmədiyim həsrətli çağlar
Qəlbimin başında bir bülbül ağlar.
Ahımdan yaranan dumanlı dağlar
Mənim həsrət çəkən xeyməgahımdır.

Ş i r i n

Yurdumda ən böyük bir sənətkarsan,
Sən öz sənətinlə hər yerdə varsan.
Qəlbə qanad verib, ruhu oxşarsan,
Hər nə yaratdınsa – qibləgahımdır...

F ə r h a d

Bir Allah bilir ki, sənindir hünər,
Sənin kamalından dərs alır göylər...
Mən sənin eşqinlə çapdım dağları,
Cənnətə döndərdim qayalıqları.
Mən sənin eşqinlə yetdim kamala,
Alqış hüsnündəki böyük cəlala!
Alqış bu mənası gözəl varlığa!
Alqış bu sevdalı bəxtiyarlığa!

(*Səhnənin kənarına çəkilir.*)

Ş i r i n

(*dərin həyəcanlar keçirir, üzünü yuxarı tutaraq*)

Ah, Allah, nə idi günahım mənim?
Od tutub alışır, yanır bədənim!
Gör kimdir könlünü bağlayan mana,
Nə olar, qəbimə işıq salsana!..
Sən yaratmadınmı eşqin oğlunu;
Kor olsun gözlərim, görməyim onu...

Şirin taqətsiz halda əyləşir, başını əlləri arasına alır. Fərhad bu halı görüncə mütəəssir olur, çox dayanmaq istəmir. Fitnə Şirinin yanına gəlir, onun saçlarını əllərinə alaraq oxşayır.

F i t n ə

Şirin... zəif olmaz bu qədər insan.
Bir toxta, əzizim!

Ş i r i n

(*məyus və xəyaldan ayrılmış kimi*)

Hanı ixtiyar?
Canımda qalmadı bir səbrü qərar.
O ki eşqə layiq bir qəhrəmandır,
O məni çox sevir xeyli zamandır.
Mən niyə sevmirəm, sevmirəm onu,
Öz ana yurdumun böyük oğlunu?
Bəlkə, doğrudan da bu faciədir?

F i t n ə

Bilmirəm, bunların mənası nədir?
Sev də... əllərini tutan ki, yoxdur.

Ş i r i n

Məni bağrına bas, yaman soyuqdur.

(*Fitnə onu qucaqlayaraq*)

Mənə sev deyirsən?

F i t n ə

Sev də... nə olar?

Ş i r i n

Bayaq demədimmi, – hanı ixtiyar?

F i t n ə

İxtiyar özündə... başıma xeyir...

Ş i r i n

Sən bilməyirsən ki, tale nə deyir.

F i t n ə

Kül olsun taleyin başına, əşi!..
Bizə qalmayıb ki, dünyanın işi?..

Ş i r i n

Düzdür... bizsiz verir dünya hökmünü.

Xosrovun əksi arxadan görünür.

Ş a p u r

Lakin unutmayın o keçən günü.

Qızlar heyrətlə arxaya baxıb, ayağa dururlar

F i t n ə

Bu yenə gəldi ki, başıma xeyir...

Ş i r i n

Dayan, qoy yenə də görək nə deyir.

Ş a p u r

Dedim... unutmayın o keçən günü,
Çox möhkəm yaradır dünya hökmünü,
Gəlin, ürəyimdə bir şam yandırın,
Dünyanı yenidən işıqlandırın!

Ş i r i n

De, kimsən, nəçisən, nədir məramın?
De, mənası nədir bu xoş kəlamın?

Ş a p u r

Mən sənin muradın, sən mənim ömrüm;
Dünyada keçməsin sənsiz bir günüm!..
Sənin sorağınla düşdüm çöllərə,
Düşdüm qərib kimi qürbət ellərə,
Gəl indi qovlama məni qapından
Bilirəm, təmizdir səndəki vicdan.

Xosrovun əksi yenə geri çəkilir. Şirin onun arxasınca

Ş i r i n

Getmə, dur!.. Getmə, sən ey nazlı xəyal!
Cəlladım olub da, gəl canımı al!..

(*Şirin qəşş edib yıxılır...*)

F i t n ə

(*qaçaraq*)

Ay haray!.. Ay haray!.. Bura yığışın!..

Şapur pirani bir dərviş libasında şur üstündə oxuya-oxuya gəlir.

Ş a p u r

Gəzib dolandıqca dünya mülkünü,
Qəbrə dəfn edərik hər keçən günü.
Göyün də, yerin də öz pərdəsi var,
Aləmdə hər sirrin açma üstünü!..

(*Şirin yavaş-yavaş özünə gəlir, Şapur ona yaxınlaşaraq.*)

Neçin dərdlisiniz, ey nazlı mələk?
Kef çəkin, şadlanın gülümsəyərək.
Daima dərd çəkib xəyala getsə,
İnsan möhnətinə tablamaz ürək...

Ş i r i n

Siz nədən bildiniz ki, dərdliyəm mən,
Xəbər verirsiniz lap ürəyimdən.

Ş a p u r

Hay... hay... mənmi nədən bilirəm bunu?
Bəs sənətim nədir ömrüm uzunu?

Ş i r i n

Nədir sənətiniz?

Ş a p u r

Bərkahinəm mən,
Dünyada sirr qaçmaz nəzərlərimdən,

Hər dərdə aşnayam, hər qəlbə tanış,
Mənim bilmədiyim bir şey qalmamış.
Nə toy, nə yas olar dünyada mənsiz,
Daima gəzirəm yurdsuz, vətənsiz...
Məndədir şad xəbər, hər qara xəbər,
Məndən nicat tapır dərdə düşənlər;
Qışımda bahar var, baharımda qış...

Şirin

Eləsə, sizdəki qüdrətə alqış!
Mənim də qəlbimdə böyük dərdim var...

Şapur

Cahanda hər dərdə dərman tapılar.
Bilirəm qəlbini yeyən qüssəni,
Bir naşı zənn etmə cahanda məni.

Şirin

(*heyrətlə*)

Nədən bilirsiniz? Hələlik ki mən
Dərdi açmamışam öz ürəyimdən.

Şapur

Dedim ki, hər sirrə tanışdır sinəm.
Mənəm tanrıların elçisi yerdə,
Ayağım yerdədir, başım göylərdə.

Şirin

Aman, kahin baba... de, dərdim nədir?

Şapur

Dərdin nə xəyaldır, nə əfsanədir,
Sənin gözlərinə görünən o şəxs
Canlı bir insandır, isti bir nəfəs...

Ş i r i n

Aman... kahin baba, sən ki bilirsən...

Ş a p u r

Dedim ki, hər sirrin atasıyam mən...

Ş i r i n

Bəs kimdir, nəçidir, gördüyüm xəyal?
Nədir bu duyduğum dərdli həsbi-hal?

Ş a p u r

Ha... ha... xəyal deyil gördüyün o ər,
Dünyalar boydadır ondakı hünər.
O şahlar şahıdır, taxtı-tacı var,
Ona yer üzünün ehtiyacı var...

Ş i r i n

O şahlar şahıdır?

Ş a p u r

Özüdür, bəli!..
İran torpağının odur məşəli.
Adına hər yerdə Xosrov deyirlər,
Bu "Günəş" deməkdir... hər axşam, səhər
Bütün kainata o günəş parlar,
Onun şöləsindən şəfa taparlar...

Ş i r i n

(*şad və məftun bir tövr ilə*)

Doğrudan, gözəldir o səhər kimi,
Qəlbə süzülürdü nəğmələr kimi.

Nə qədər mənalı gözləri vardı,
Bəs fikri nə idi? Kimi arardı?

Ş a p u r

O sənin arxanca gəlmişdir, yəqin,
Mələklər deyir ki, odur qismətin.

Ş i r i n

Demək ki, qismətim odur cahanda?.
O mənim qəlbimi aldı bir anda;
Bəs nə tez görünüb batdı o səhər?
Aman!.. Qəlbimdəki bu döyüntülər..

Ş a p u r

(*yaxasındakı qızılgülü götürərək*)

Al, qızım, bu gülü əlində saxla,
Üç dəfə nəfəs al, sonra da qoxla!
O vaxt döyüntülər qəlbindən gedər,
Xəyalın göyləri ziyarət edər.
Dünya gözlərində gülümsəyərək,
Ney kimi dil açar hər gül, hər çiçək...

Şirin gülü alaraq üç dəfə qoxlayır.

Ş i r i n

Nə gözəl ətri var, lap ilk bahardır.

Ş a p u r

Onda məhəbbətin mənası vardır.

Ney çalınır.

Ş i r i n

Doğrudan ney səsi... Kahin baba... qoy,
Qoy öpüm əlindən.

Ş a p u r

Öp, qızım, bu toy,
Bu bayram sənindir, mübarək olsun!
Parlasın taleyin, günəş tək olsun!

Ş i r i n

Aman, kahin baba... ceyran qaçır ki,
Bıy... bıy... ağaclar da çiçək açır ki...
Ah... dünya nə qədər gözəlləşdi, bax!
Elə bil qəlbimə günəş doğacaq.
Vay, yuxum gəldi ki...

Ş a p u r

Qorxma, bir az yat!
Yazılmış alnına başqa bir həyat...

Şapur Şirinin başını qolu üstə alıb əyləşir. Şirin bir ah çəkib yuxuya gedir.

Ş a p u r

Qızım... Şirin qızım...

Cavab gəlmir, sevinclə.

"Gül" bihuş etdi...
Mələk də tədbirlə yuxuya getdi...

Şirinin başını yavaşca yerə qoyaraq, onun üzünə baxır.

Doğrudan gözəldir, gözəldir, ancaq
Hər gözəl bir şaha qismət olacaq...

O, əl vurub öz adamlarını çağırır, adamları gəlir.

Ş a p u r

Tez olun, götürün! Birbaş İrana!

Şirini götürüb aparırlar. Şapur yalqız qalaraq, ətrafa boylanır.
Sonra Şirinin çadırına mənalı bir fitnəkarlıqla baxaraq.

Qoy bu da dərd olsun Azərbaycana!

Şapur adamlar gedən tərəfə qaçır. Səhnə boşalır, hava qaralır. Uzaqda atəşgədələrin şamları yanır. Fitnə qaça-qaça səhnəyə gəlir. Hər tərəfi böyük bir təlaşla axtarır. Camaat axın-axın gəlir, Azər baba ilə Fərhad da gəlir.

F i t n ə

O yoxdur...

A z ə r b a b a

Durmayın, gəzin, igidlər!..

İgidlər dəstə ilə hər tərəfi axtarırlar. Fərhad bir tərəfdə külüngə dayanaraq pərişan bir halda durur. Azər baba uzaqdakı atəşgədələrə tutaraq, diz çöküb dua edir.

A z ə r b a b a

Ulu Hürmüz!.. Saxla bizi bəladan,
Nələr çəkdi tarix boyu bu vətən...
Bu vətən ki Zərdüştlərin yurdudur,
Hər igidi bir yenilməz ordudur.
Ulu Hürmüz!.. Ayağa qalx səsimdən,
Kömək üçün çağırıram səni mən...

P ə r d ə

## ÜÇÜNCÜ ŞƏKİL

Atəşgədə. Qürub vaxtıdır. Sağ tərəfdə böyük və əzəmətli bir öküz heykəli. Öküzün qaşqasında dümağ təpəli var. Əhali atəşgədəni mühasirəyə almışdır. Azər baba öküz heykəlinin qarşısına gələrək başını sığallayır.

A z ə r   b a b a

Qolunda gücü var qara torpağın,
Bərəkət gətirir sənin ayağın.
Yerimi şumlayıb əkən də sənsən,
Ağır barxanamı çəkən də sənsən.
Hər sirrin yenidir, hər mənan dərin,
Qəlbə mehribandır qumral gözlərin.
İnsanlıq səninlə çatır çörəyə,
Sən çarə tapırsan hər bir diləyə.
Get, ulu Hürmüzə yalvar ki, bir də
Ölüm və xəstəlik olmasın yerdə!

H a m ı

Get, ulu Hürmüzə yalvar ki, bir də
Ölüm və xəstəlik olmasın yerdə!

Məhin Banu başında bir dəstə adam gəlir. Hamı ona təvazölə baş əyir.

B a n u

Axşamınız xeyir, igid balalar!

A z ə r   b a b a

Axşamınız xeyir, böyük hökmdar!

Banu camaatın arasından Azər babanın yanına gələrək ehtiramla onun əlindən öpür.

B a n u

Söylə, Azər baba, nə fəlakətdir?

A z ə r   b a b a

Fəlakət özü də bir cür adətdir;
Özü də insanla əkiz yaranmış,
Qışında bahar var, baharında qış.

B a n u

(*fəryadla*)

Hanı Şirin balam?.. Nə oldu qızım?
Bir söylə, söndümü tale ulduzum?

A z ə r   b a b a

Bir az arxayın ol, o ulduz sönməz,
Dünyanın məhvəri tərsinə dönməz.
Tapşırdım, hər yanı igidlər,
Bu gün gətirərlər ondan bir xəbər.

B a n u

Aman...Tablamayır qəlbim hicrana.
Özün bilirsən ki, anayam, ana...

A z ə r   b a b a

Bəli... Ana qəlbi bir pərvanədir,
Bilirəm, övladdan ayrılmaq nədir...
Dünya bir evdirsə, övlad işıqdır.
Oğul arxadırsa, qız yaraşıqdır...

B a n u

(*ağlayaraq*)

Bəs hanı? Söndümü mənim işığım?
Hanı gözəl balam, can yaraşığım?

A z ə r   b a b a

Dedim ki, dünyanın məhvəri dönməz,
Xəyanət aləmi versə də bada,
Dünyanın başında tufan qopsa da,
Odlar ölkəsinin ocağı sönməz!..

B a n u

Gözümü dikdiyim Şirindir yalnız,
Bütün yurdumuza şöhrətdir o qız.
Bu gün-sabahımdır... Mən ölsəm əgər,
Gözəl yurdumuzu yadlar qəsb edər.
Şirini tez tapın, tez qərar verək,
Bu gündən şah olsun o gözəl mələk!

C a m a a t

Razıyıq... razıyıq... olsun hökmdar!
Göylər qucağında o tutsun qərar!

A z ə r   b a b a

Şirin ana yurdun doğma qızıdır.
Bizim bəxtimizin dan ulduzudur.
Ana vüqarilə fəxr edər vətən,
Xəyanət görmərik onun əlindən.
Bu qoca dünyada bir adət də var:
Qadın olan yerdə ədalət var!..

Fərhadla bir dəstə igid gəlir.

B a n u

Aman, Fərhad, igid balam, nə xəbər?

Fərhad sükut edir.

Tez ol, danış, bağrım başı od tutar,
Hanı Şirin? Hanı qızım? Nə səs var?

F ə r h a d

Çöllərə düşdüyüm o vaxtdan bəri
Dolandım dağları, meşəlikləri;
Nə vaxtdır gündüzü qatıb gecəyə,
Gəldim aslanlarla pəncə-pəncəyə.
Neçə orman yıxdım, neçə dağ yardım,
Hər yoldan ötənə bəzən yalvardım,
Əridi ahımdan dağların qarı,
Sinəmdə qaldırdım qayalıqları,
Boylandım göylərin yeddi qatına,
Dənizə baş vurub, girdim altına.
Hər daşın bağrına bir külüng çaxdım,
Şirlərin, divlərin qarnına baxdım,
Yenə də tutmadım ondan bir xəbər,
Nə yerlər danışır, nə də ki göylər...

Ortalığı pərişanlıq və həyəcan alır.

B a n u

(*üzünü atəşgədəyə tutaraq böyük bir həyəcanla*)

Ulu Hürmüz... söylə nədir günahım?
Noldu balam, noldu mənim pənahım?

A z ə r   b a b a

Səbr elə, hər şeydən ümid gözəldir,
Hər müşkül işi də ümid düzəldir.

B a n u

Yox, daha qalmadı səbrü qərarım,
Özümdə deyildir öz ixtiyarım.

(*Üzünü əhaliyə tutaraq.*)

Odlar ölkəsinin mərd igidləri...
Bilin, tapılmasa o gözəl pəri,
Canımdan nəfəsim çıxacaq birdən.
Dağılın, axtarın onu hər yerdən!

Topal irəli gələrək.

T o p a l

Şahimiz, gördüm ki, mərhəmətlisən,
Odur ki, sirrimi açacağam mən.

B a n u

Nə sirdir? Tez danış, tez danış, oğlum!
Qorxma, açıq söylə, qurbanın olum!

T o p a l

Şirinin yerini mən bilirəm tək.

F i t n ə

Bıy, bıy, canım Topal, bir danış görək!

Fitnə Topalı qucaqlayıb öpür.

B a n u

Yerini bilirsən? Di tez ol, danış!
Danış ki, dözməyə qüvvəm qalmamış...

T o p a l

On beş, iyirmi nəfər
İrandan gəlmişdilər.
Məndən soruşdu biri
Şahzadənin yerini.
Göstərdim yaylağını,
Sonra da ovlağını...

B a n u

Onlar apardı qızı,
Apardı baxtımızı...

F ə r h a d

Rəzalət... rəzalət... xəyanətə bax,
Qoy olsun! Xosrovun o tacı-taxtı
Mənim külüngümə tablamayacaq!..

B a n u

Gəl, oğlum, yaxın gəl!

Fərhad ona yaxınlaşır, Banu Fərhadın alnından öpərək.

Fəxrimiz sənsən!
Səninlə fəxr edir anamız Vətən.
Topla igidləri başına tezdən.
Böyük bir orduyla keç ölkəmizdən,
İran torpağında tufanlar yarat,
Xosrovun tacını ayaqlara at!

Hamı nəzərini Fərhada çevirmişdir. Pauza.

A z ə r  b a b a

De, oğlum!.. Dillərin dastanı oğlum!
Neçin fikrə getdin, qurbanın olum?

F ə r h a d

Yenə də axacaq min günahsız qan,
Budur, düşündürən məni, atacan...

B a n u

Qoy axsın o qanlar, sellərə dönsün,
Qoy Kəyan taxtının ocağı sönsün!
Dava meydanında qısalt dilini,
Qurtar öz eşqini, öz sevgilini!..

F ə r h a d

O indi qəfəsdə çırpınır, aman,
Qəlbimə qüvvət ver, böyük yaradan!
Didib parçalayım o daş qəfəsi,
Bir də ağlamasın cananın səsi!

A z ə r   b a b a

Get, oğlum, get, sənə uğurlar olsun!
Taleyin qüvvətli, eşqin var olsun!
Döyüş meydanında ürəyi daş ol!..
Xainə rəhm etmə, haqqa yoldaş ol!..

S ə s l ə r

Gedək, qalxan tutub, qılınclar çalaq,
Gedək, yağılardan intiqam alaq!

F ə r h a d

(*üzünü igidlərə tutaraq*)

İndi qulaq verin mənə, igidlər,
Meydanda sınanır kimdədir hünər.
Gedin hazırlaşın gün doğanadək,
Əlli min nəfərlik ordu götürək.
Döyüş meydanından qaçsa bir nəfər,
Gərək parçalasın onu igidlər!

H a m ı

Döyüş meydanından qaçsa bir nəfər,
Gərək parçalasın onu igidlər!

B a n u

Var olun, var olun, igid balalar!
Yaxşı yol göstərsin sizə ruzigar!
Düşmənlə qoç kimi durun üz-üzə,
Sizi tapşırıram ulu Hürmüzə!

A z ə r   b a b a

İgidlər! Dərələr, dağlar olsa da,
Üstündən atılın şirü nər kimi.

F i t n ə

Qızlar, gəlin biz də lopa yandıraq,
Dünya işıqlansın ilk səhər kimi!

Gedir.

Fərhad atəşgədənin zirvəsinə qalxaraq, Bərdə şəhərinə boylanır.

F ə r h a d

(*gəzinərək*)

Əlvida!.. Əlvida, qurduğum şəhər,
Göylərə baş vuran dik minarələr,
Əlvida!.. Sevdiyim nazəndə Vətən!
Mən şərbət içmişəm sənin əlindən.
Halaldır əməyin, halaldır südün.
Hər bulaq başında bitən söyüdün,
Hər qoca çinarın öz vüqarı var.
Hər aşiq qəlbinin bir nigarı var...

B a n u

Fərhad, ümidimiz sənədir yalnız,
Səninlə parlayır bizim baxtımız.

Hava qaralır.

F ə r h a d

Əlvida, anamız odlar ölkəsi,
Əlvida, eşqimin ilahi səsi!

Azər baba bir əlində çörək, bir əlində su evdən çıxaraq gəlir.

A z ə r   b a b a

Al, oğlum, bir loxma kəs bu çörəkdən!

Fərhad çörəyi öpüb, ondan bir loxma ağzına alır.

Bu da abi-həyat... iç, oğlum, bunu...
Şirvan bulağının suyundandır bu.
Bu adi su deyil, abi-həyatdır,
Bunun hər damcısı bir kainatdır.
Ölməz bu dünyada bunu içənlər,
Ölməz el uğrunda candan keçənlər.
Get, oğlum!.. Yoluna uğurlar olsun!
Bu dünya durduqca eşqin var olsun!

Fərhad piyaləni alıb içir, göy üzü açılır.

P ə r d ə

## İKİNCİ PƏRDƏ

### DÖRDÜNCÜ ŞƏKİL

Xosrovun sarayı. Şirin başını əlləri arasına alıb yalnız oturmuşdur. O, qayət pərişan bir halda ətrafa göz gəzdirir.

Ş i r i n

Ah, Allah... nə böyük zülmün olarmış!
Başımın nə yaman bəlası varmış.
Eldən uzaq düşdüm, vətəndən iraq,
Bir daş qəfəsdəyəm, ürəyim dustaq...
Burda nə həmdəmim, nə sirdaşım var,
Bir özüm, bir qəlbim, bir göz yaşım var;
Hələ də bilmirəm günahım nədir?
Dünya gözlərimdə bir viranədir...

Məryəm qayət qəzəbli bir halda daxil olur.

M ə r y ə m

(*kinayəli*)

De, sənsənmi? Aha... ovlanan şikar!
O dillər dastanı nazənin nigar?

Şirin arxasını divara dayayıb Məryəmə heybətli gözlərlə baxır.
Məryəm Şirinə yaxınlaşaraq, onun gözünün içinə baxır.

M ə r y ə m

Neçin kiriyirsən, möhtərəm qonaq?
Hələ bir sən bunun həyasına bax!..

Hirsli-hirsli evin o biri başına keçir.

Ş i r i n

Deyin, siz kimsiniz, Allah eşqinə?

M ə r y ə m

Mən kiməm? Vaxtilə nazlı bir sənəm,
Bizans padşahının qızı Məryəməm!
Onun cəlalına baş əyir göylər...

Ş i r i n

Bura ki İrandır.

M ə r y ə m

Bəli, İrandır.
Ərim də ən böyük bir hökmrandır.

Ş i r i n

Əriniz kimdir ki?

M ə r y ə m

Tülkülüyə bax!
Bir qız da Məryəmi ələ salacaq...
Necə kimdir ərim?

Ş i r i n

Bilməyirəm mən...

M ə r y ə m

Nə dara çəkərəm səni dilindən...

Ş i r i n

Təqsirim nədir ki?

M ə r y ə m

Nədir? Xəyanət!
Sən bir evlər yıxan afətsən, afət!

Ş i r i n

Bir ev yıxmamışam bu dünyada mən,
Daima yaxşılıq gəlmiş əlimdən.
Mən həyat aşiqi, vicdan səsiyəm,
Odlar ölkəsinin şahzadəsiyəm...

M ə r y ə m

(*kinayə ilə*)

“Mən həyat aşiqi, vicdan səsiyəm,
Odlar ölkəsinin şahzadəsiyəm...”
Bəs hanı vicdanın?

Ş i r i n

Bu nədir, Allah?
Nəydi bu dünyada tutduğun günah?..

M ə r y ə m

Xosrovun arvadı ola-ola mən,
Almaq istəyirsən onu əlimdən?!
Bir bunu görməzsən... Hələ mən sağam,
Bu Kəyan taxtına od vuracağam!..

Ş i r u y ə

(*görünür*)

Sevgilim budursa, ən xoşbəxt mənəm,
Gərək mənim olsun bu gözəl sənəm!

Ş i r i n

(*heyrətlə Məryəmə*)

Nə dedin? Xosrovun arvadı da var?

M ə r y ə m

Bəs necə? Kişi də arvadsız olar?
Özüm də anayam... Oğlum sağ olsun!

Ş i r i n

Qoy olsun, bəxti də hər vaxt ağ olsun.

M ə r y ə m

Şiruyə, Şiruyə!

Şiruyə irəli gəlir.

Budur, bax, bu boyda oğlumdan utan!..

Ş i r u y ə

Elə bil od çıxdı yenə canımdan.

O, səfehcəsinə çırtıq vura-vura, gülə-gülə qayıdır.

M ə r y ə m

De görüm, gəlməkdən nədir məqsədin?
Zorla gətirdilər, özün istədin?

Ş i r i n

Nə üçün verirsən bu sualları?
Mənim vicdanıma şahiddir Tanrı.
Necə gəldiyimdən yoxdur xəbərim
Burda ağlar keçir mənim günlərim.
Bir qərib könüllü xəstəyəm, inan!
Mən ayrı düşmüşəm doğma yurdumdan...

M ə r y ə m

(*yumşaq bir tövr ilə*)

Şirin, bir qulaq as, bir zaman mən də
Gül kimi gülərdim çöldə, çəməndə.
Mən də gözəl idim lap sənin qədər,
Ağıldan gedərdi məni görənlər.
Xosrovun vəfası olsaydı bir an,
Boyun qaçırmazdı öz peymanından.

O mənim qəlbimi alıb oynatdı,
İndisə gül kimi qoxlayıb atdı...

(*Məryəm ağlayır.*)

Ş i r i n

Ağlama... ağlama, talesiz ana,
Mən ki bir rəqibə deyiləm sana.

M ə r y ə m

Şirin, gözəl bacım, Tanrını dinlə,
Uçurma evimi sən əllərinlə!
Bil ki, yaman olar ana fəryadı,
Lənətə gələydi Xosrovun adı!..

(*Şirinin üzündən öpərək*)

Görürəm, təmizdir, safdır ürəyin,
Toruna düşmüsən sən də fələyin.
İnan, gözəl afət... inan ki, burda
Taleyin parlayıb gülməyəcəkdir,
Amandır, qəlbini vermə o qurda;
Sənin də qədrini bilməyəcəkdir.

(*Məryəm böyük bir həyəcanla çıxır.*)

Ş i r i n

(*öz-özünə*)

Ah, nələr var imiş dünyada, nələr,
İçimdə kimsəsiz bir quzu mələr...
Söylə, bir hardasan, Fərhad?!

(*Taqətsiz bir halda oturur.*)

Şapur daxil olub Şirinə baş əyir.

Ş a p u r

Gecəniz xoş keçsin, gündüzünüz şad!
Salam gətirmişəm Xosrovdan sizə.
Şah gəlmək istəyir hüzurinizə.

Ş i r i n

İlahi... nə qədər tanışdır bu səs...

Ş a p u r

Necə?... Gözəl pəri... bu ola bilməz!
Biz ki görüşürük birinci kərə.

Ş i r i n

Sizi and verirəm sonsuz göylərə
Söyləyin kimsiniz?

Ş a p u r

Mən bir sənətkar...
Xırdaca olsam da, öz şöhrətim var.
Şahın rəssamıyam, Şapurdur adım,
Təbiət olmuşdur böyük ustadım.
Kimə oxşatdınız səsimi birdən?

Ş i r i n

Bir kahinin səsinə.

Ş a p u r

Nə kahin?

Ş i r i n

Heç... heç...

Ş a p u r

Yox canım, mən hara, kahinlik hara?
O ki fırıldaqdır başdan ayağa...

Şapur qarnını tutub, uğununcaya qədər gülür.

Ş i r i n

Əfv edin, görünür, yanılıram mən.

Ş a p u r

Nə olar... nə olar... küsmərəm sizdən.

(*O, Şirinə təvazölə baş əyir.*)

Şeypur çalınır.

Ş a p u r

Aha, şah həzrəti buyurun, yəqin
Siz onu hörmətlə, qəlblə dinləyin!

Xosrov böyük bir vüqar və təmkinlə daxil olur.

X o s r o v

Odlar ölkəsinin şahzadəsinə.
Qəlbində çırpınan sevda səsinə
İran torpağından salamlar olsun!

Xosrov Şirinə təvazölə baş əyir. Şirin də eyni təvazölə baş əyərək.

Ş i r i n

İran hökmdarı daim var olsun!

Xosrov Şapura göz eləyir, o bayıra çıxır.

X o s r o v

Nə qədər xoşbəxtəm görəli sizi.
Tanrım başa vursun diləyinizi.
Nə əmriniz varsa, hazıram canla.
Bir səadət quraq əhdi-peymanla!
Olaq hər qüssədən, hər qəmdən azad.
Günümüz xoş keçsin, könlümüz də şad.

Ş i r i n

Sizin nə dərdiniz, mənimkidir qəm –
Mənim gözlərimdə ağlayır aləm...

X o s r o v

Mənimmi nə dərdim?
Dostumdur möhnət...
Gədayə döndərdi məni məhəbbət.

Ş i r i n

Hansı məhəbbətdir sizi qəhr edən?

X o s r o v

Bir sizə vermişəm öz qəlbimi mən!

Ş i r i n

Bəs Məryəm, bəs ağlar gözlü o ana?

Xosrov həyəcan keçirir.

Bayaq qulaq asdım ürəkdən ona.
O ana qəlbinin odlu naləsi.
Tapdanan bir eşqin pərişan səsi
Fəlakət törədər...

X o s r o v

Qoy olsun, ancaq
Mənimki Məryəmlə baş tutmayacaq!

Ş i r i n

Bilmək istərdim ki, nədir səbəbi,
Oynatmaq olarmı canlı bir qəlbi?

X o s r o v

Neçin verirsiniz bu sualları?
Onsuz da sərt əsir ömrün ruzgarı.
Onsuz da qəlbimin tufanları var.

Ş i r i n

(*təvazölə*)

Eləsə... əfv edin, böyük hökmdar,
Mənə göstərməyin bu fəlakəti.
Yaşatmaq lazımdır hər səadəti!..

X o s r o v

(*ətrafa*)

Ah... onun kamalı dənizdən dərin.
Qəlbində çırpınır qəlbi göylərin...

(*Şirinə dönərək*)

İndi qulaq asın...
Mən açıq desəm.
Bizans padşahının qızıdır Məryəm.
Bir vaxt bürümüşdü məni düşmənlər.
Gündə min fəlakət, min qara xəbər.
İran torpağına hücum çəkərək,
Göydən od tökürdü başıma fələk.

O vaxt hər tərəfə mən əl-qol atdım.
Bizans dövlətilə dostluq yaratdım.
Bu dostluq şərtiylə Məryəmi aldım.
Eşqsiz yaşayıb, vaxtsız qocaldım.
İndi siz bilin ki, günahım nədir...

Ş i r i n

Yazıq... doğrudan da bu faciədir.

X o s r o v

İyirmi il keçir o vaxtdan bəri,
Yazıq taleyimin sınıq şəhpəri
Yerlərdə, göylərdə tutmayır qərar,
Gözümdə qalmışdır bütün arzular...

Ş i r i n

Bəs nə cür oldu ki, indiyədək siz
Yaşaya bildiniz ruhsuz, eşqsiz?

X o s r o v

Məryəmlə yaşamış yalnız bədənim,
Ancaq yaşamamış ürəyim mənim...

M ə r y ə m

(*qəzəbli daxil olacaq*)

Sən yalan deyirsən, böyük hökmdar,
Eşqimə and içib vermişdin qərar,
İnandım sözünə mən taleyi kəm,
Lakin unutma ki, mən də Məryəməm –
Bizans dövlətidir arxamda duran!
Beşdaş oynamasın mənimlə dövran.
Oğul anasıyam, nə qədər sağam,
Bu Kəyan taxtına od vuracağam!

Şiruyə tələsik içəri girir.

Ş i r u y ə

Nə var? Nə haraydır?

M ə r y ə m

(*Xosrova*)

Oğlundan utan!

(*Şiruyəyə dönərək*)

Ah, oğlum... görürsən neyləyir atan?
Sənə süd vermişəm bu döşlərimdən,
Yuxusuz gecələr keçirmişəm mən,
O ki gözlərimdə qoydu kamımı,
Al ondan, özün al intiqamımı!..

X o s r o v

(*qılıncını çıxararaq*)

Məryəm!.. Bu torpaqda mənəm hökmdar,
Mənim də öz hökmüm, öz qanunum var!..

O, Məryəmin üstünə hücum çəkir.

Ş i r i n

(*aralığa girərək*)

Məni doğrudan da sevirsənsə sən,
Qılıncı yerə at, düşsün əlindən!

Xosrov qılıncını yerə atır, taqətsiz bir vəziyyət alır.

P ə r d ə

## BEŞİNCİ ŞƏKİL

Yenə həmin yerdir. Səhər vaxtıdır. Pəncərələrdən günəş düşür. Şiruyə divardakı qılıncları bir-bir belinə taxıb yoxlayır. O, fişqırıq çalır, arabir güzgüdə öz boyuna baxıb gülür.

V ə z i r

(*daxil olaraq*)

Salam, şahzadəmiz!

Ş i r u y ə

(*güzgüdə məşğul kimi*)

Hə... gəldin, vəzir?

V ə z i r

Mənəm... Dayanmışam əmrə müntəzir.

Ş i r u y ə

Bilirsənmi nə var?

V ə z i r

Xeyr, bilmirəm.

Ş i r u y ə

Bir nazəndə pəri, bir gözəl sənəm...

O, çırtıq vurub oynayır, vəzir gülür.

V ə z i r

Murada yetirsin sizi qoy Allah.
Şöhrətin şahzadə, özün qəhrəman...

Atandan sonra da sənindir İran.
Nə var ki, hər kimi istəsən, əgər
Gəlib bir qul kimi sənə baş əyər...

Ş i r u y ə

Hər kimi istəsəm?

V ə z i r

Əlbəttə, şəksiz!
Arxanda dağ kimi durmuşuq ki, biz
Ancaq incimişəm atandan bir az,
Adam bu qədər də vəfasız olmaz...

Ş i r u y ə

Nə olub, nə var ki?

V ə z i r

Nolacaq? Anan
Bizans torpağına qayıdan zaman
Göz yaşı tökürdü...

Ş i r u y ə

Qayıdıb gələr,
Şirini mən allam, işlər düzələr...

V ə z i r

(*düşündükdən sonra*)

Şirini? Afərin belə kamala!
Bir tanrım yetirsin səni vüsala!
Afərin!.. Afərin!..

Ş i r u y ə

Bu sirri saxla!
Çalış, Şirini də arabir yoxla...

V ə z i r

Bıy, bu nə sözdür ki, düzü atandan
Mən çox incimişəm... O axır zaman
Lap məni salmışdır gözdən, nəzərdən...
Xəbərin yoxdur ki, təzə xəbərdən?

Ş i r u y ə

Nə olub?

V ə z i r

Atayın vəfasına bax!..
Deyirlər, Şapuru vəzir qoyacaq.

Ş i r u y ə

Şapuru? Şapuru?

V ə z i r

Şapuru, bəli...
Gör nələr oynayır taleyin əli...
Otuz il burda mən olmuşam vəzir,
Otuz il durmuşam əmrə müntəzir,
Şaha sədaqətlə işləmişəm mən,
Xəyanət çıxmamış hələ əlimdən.
İndisə, yaşımın bu ötgün vaxtı
Məni çölə atır bu Kəyan taxtı...

(*Vəzir hiyləgərcəsinə ağlayır.*)

Ş i r u y ə

Ağlama... ağlama, şah olanda mən
Vəzir qoyacağam səni yenidən!

V ə z i r

Şahlığı tez gərək alasan ələ...

Ş i r u y ə

Atam ki ölməyib, yaşayır hələ?

V ə z i r

Özün bil, başqa bir söz də deyirlər...

Ş i r u y ə

Başqa nə deyirlər?

V ə z i r

Çox pisdir xəbər...

Ş i r u y ə

Yaxşı hər nədirsə, bir danış görək?

V ə z i r

Niyə daş tökməyir başıma fələk.

Ş i r u y ə

A kişi, bir danış!

V ə z i r

Dilim gəlməyir...

Ş i r u y ə

Yaxşı, danış bir!..

V ə z i r

Deyirlər ki, Şapur şahlıq istəyir...
Bəli, vəzirliyə keçəndən sonra
Özünü padişah elan edəcək...

Ş i r u y ə

Bəs belə... bəs belə...

V ə z i r

İndisə gedək.
Bir tədbir tökərik keçdikcə zaman,
Mən də çox çıxmışam imtahanlardan!..

Xosrov pərişan halda Şapurla daxil olur, vəzir və Şiruyə ona baş əyirlər, vəzir çıxır. Xosrov Şiruyənin boynun qucaqlayıb, üzündən öpür.

X o s r o v

İçək... xumarlansın qoy gözlərimiz!
Bir qonaq gəlmişik bu dünyaya biz.
Bu meylə, məzəylə keçinən hər dəm
Böyük bir dövrandır, böyük bir aləm...
İçək... belə deyir bizə loğmanlar:
Şərab olan yerdə nə dərd, nə qəm var...

Ş a p u r

Məncə, bu düz deyil, böyük hökmdar!
Dünyada hə şeyin öz məqamı var.
Şərabın nəşəsi bir anlıq olur,
Əbədi qalansa, insanlıq olur...

X o s r o v

İnsanlıq, insanlıq... nəşədir o da,
Başqa bir əyləncə yoxdur dünyada.
Onsuz da fanidir hər şeyin sonu...
Bir şahla gədanın kim olduğunu
Torpaq sormayacaq qəbirdə bizdən,
Eləysə... qalmayaq öz kefimizdən!..

Ş a p u r

Lakin məni əfv et, böyük hökmdar!
Dünya kef üstündə tutmamış qərar,
Nəşəli keçsə də, hər bir əyləncə,
Ayıq baş hər şeydən ucadır, məncə...

X o s r o v

Baş ayıq olanda çox fikirləşər...
Fikirdən qocalır dünyada bəşər.
Dövran nə qədər ki hələ bizdədir,
Fürsət nə qədər ki əlimizdədir,
İçək, nəşələnək, mehriban dostlar,
Dünya mey üstündə tutmuşdur qərar!

İçirlər. Rəqqasələr gəlib oynayırlar. Onlar Xosrova baş əyib gedirlər. Xosrov onlardan ən gözəlini saxlayıb öpür.

Ş a p u r

Şahim... unutma ki, hökmdarsan sən.

X o s r o v

Gözəl dost... Nə gördüm bu dünyada mən?
Nə verdi Xosrova bu hökmranlıq?
Azadlıq verdimi mənə bir anlıq?

Keçdi düyünlərdə ömrümün çoxu,
Daşdan-daşa dəydi bəxtimin oxu,
Zülmə alışdırdı məni ixtiyar,
Axır lənətlədi məni ruzigar...
Şirin də – bir qız da sevməyir məni!
Sularda – qərq olur ömrün yelkəni.

Ş a p u r

Lakin oradadır hər dərdə çarə,
İmanla yetişər aşiq nigarə...

Vəzir gəlir baş əyir.

V ə z i r

(*əlindəki məktubu göstərərək*)

Böyük bir fəlakət baş vermiş, şahim,
Söylə, əmrin nədir, ey qibləgahim?

X o s r o v

Fəlakət? Bayquşsan doğrudan da sən,
Xeyir söz çıxmayır sənin dilindən...

V ə z i r

(*həyəcan keçirir.*)

Zamanın hökmüdür...

X o s r o v

Nə var? Nə xəbər?

V ə z i r

Bizans dövlətindən gələn elçilər
Məktub gətirmişlər...

X o s r o v

Aç, oxu görək...

V ə z i r

(*oxuyur*)

Ey Xosrov adlanan böyük hökmdar!
Nə oldu dostluğa verdiyin qərar?
Bu əhdü peymanı ayaqladın sən,
Qaçdın oğru kimi öz dediyindən;
Axırda qovladın qızım Məryəmi,
Üstümə güldürdün bütün aləmi.
Bu gündən hazır ol, hərbə girişək,
Taxtını, tacını mən alam gərək!..

X o s r o v

Ha... ha... ha... Əbləhin iştahına bax,
Mənimmi tacımı, taxtımı almaq?
Ah, Məryəm... Məryəmdir bunları quran,
Görək kimə verər vəfasız dövran.

V ə z i r

Belə tez verməyin bu hərbə qərar,
İran ordusunu qırmışdır azar.
Ordudan dağılıb qaçan da çoxdur,
İndi hərb etməyin mənası yoxdur.

X o s r o v

Səncə, təslim olum? Budur qərarın?

V ə z i r

Özünsən sahibi hər ixtiyarın,
Yalnız vəziyyəti danışıram mən.

(*Baş əyib çıxır.*)

X o s r o v

Xeyir söz çıxmayır sənin dilindən!
Şapur, ağıllı dost, sən danış barı!
Qoşun göndərəkmi Bizansa sarı?

Ş a p u r

Ümidi verməyin hələlik bada,
Hər dərdin çarəsi vardır dünyada,
Qoyun Şapur başı düşünsün bir az.

X o s r o v

Sənin məsləhətin faydasız olmaz,
Bunu dəfələrlə sınamışam mən,
Zərər çəkməmişəm məsləhətindən.

Şiruyə gəlir.

Gəl, oğul, vəliəhd sənsən İrana;
Qoymaq istəyirlər onu virana.

Ş i r u y ə

O hansı alçaqdır, söylə, atacan?

X o s r o v

O alçaq Məryəmdir, sənin öz anan,
Məndən də, səndən də intiqam alır,
İran da Bizansın əlində qalır.

Ş i r u y ə

Bəs belə, bəs belə, vəfasız Məryəm!
Mən ona bir daha öz anam desəm
Qoy dilim qurusun!..

X o s r o v

Dilin var olsun!
Oğul atasıyla bəxtiyar olsun!
Bu taxt da, tac da sənindir, oğlum,
Bizansa gəl verme, qurbanın olum!..

Ş i r u y ə

Özüm gedəcəyəm bu hərbə, özüm,
Budur son qərarım, budur son sözüm!

X o s r o v

Şapur, görürsənmi, balam qoçaqdır,
Mənim qisasımı o alacaqdır!

Ş a p u r

Bir az tələsməyin, böyük hökmdar,
Mən verə bilmərəm hələlik qərar...

Ş i r u y ə

Söylə, sən nəçisən? Vəliəhd mənəm,
Mənim düşmənimdir bizanslı Məryəm.

Ş a p u r

Məryəm çox igiddir ondakı hünər,
Məncə, min kişilik orduya dəyər;
Odur ki, ehtiyat lazımdır bizə!

Ş i r u y ə

Ehtiyat ləkədir şah nəslimizə,
Bir də sən, qarışma bu işlərə gəl!

Ş a p u r

Mən sizə bir dostam hər şeydən əvvəl...

X o s r o v

Vəfalı bir dostdur Şapur əzəldən,
Ondan öz əlini heç vaxt üzmə sən!

Ş i r u y ə

Atacan, alışır sinəmdə ürək,
Məryəmdən intiqam mən alam gərək.
İzn ver, Bizansa orduyla gedim,
Taxtını, tacını tarimar edim.
İzn ver, atacan!

X o s r o v

Verdim, yaxşı yol!
İran ordusuna sən sərkərdə ol!
Qoy Bizans torpağı məzara dönsün,
Qoy ulduzu batsın, günəşi sönsün!

Şiruyə baş əyib gedir. Vəzir daxil olur.

X o s r o v

Belə...
Düz gəlməyir mənimlə dövran;
Nə bu taxt olaydı, nə də bu İran!
Şirin də verməyir könlünü, görək,
Görək, qanlı fələk nə göstərəcək?

V ə z i r

Şahim! Darıxmayın, vaxtı var, gələr,
Dünyada səbr ilə hər şey düzələr...

X o s r o v

Səbr ilə... səbr ilə...
Vəzir, söylə bir,
Söylə, bu dünyada neçə cahangir
Razı yaşamışdır öz taleyindən...

V ə z i r

Şahim, bu suala çox acizəm mən;
Heç kəs şöhrətindən razı deyildir...
Yalnız deyirlər ki, İskəndər Kəbir
Razı yaşamışdır öz taleyindən...

X o s r o v

Yalandır, yalandır, tarixi bilsən,
Onun da bəxtini görərsən qara,
Çünki şöhrət hara, səadət hara?..
Götür məni... dağ boydadır hər qəmim,
Nə dostum var, nə dərd bilən həmdəmim,
Nə olsun ki, çox böyükdür şah adım,
Öz ömrümü məhəbbətsiz yaşadım,
Bu dərd məni ağrıdacaq qəbrədək:
Şah olmadım ağız dolu gülərək...

V ə z i r

Aman, şahim, üzür sizi xəyallar,
Pəncənizdə İran boyda ölkə var.
Qəlbinizdən hər nə keçsə düzələr,
Bir qız nədir? Sizə yüz min qız gələr...

X o s r o v

Mən onsuz da qızları çox yoxladım,
Yüz minini çiçək kimi qoxladım.
Nə olsun ki, heç birini sevmədən;
Həsrət qaldım bu dünyada eşqə mən.

V ə z i r

Həyat eşqsiz də keçər, hökmdar,
Bir də, bədbəxt olur aşiq olanlar.
Məcnunu, Leylini gətirin yada,
Onların nəsibi noldu dünyada?
Taxtınız, tacınız daha gözəldir,
Hər bir ehtiyacı mənsəb düzəldir...

X o s r o v

Yox, vəzir, doymuşam şöhrətdən daha,
Qəlbimdə üsyan var bu gün Allaha!..

V ə z i r

Doymaq olmaz bu dünyada mənsəbdən,
Qoy var olsun Kəyan taxtı bir də sən!

Şapur daxil olur, şaha təzim edir.

X o s r o v

Yaxın gəl, kənarda dayanma, Şapur!
Sənin gözlərində dostluq oxunur.
Qəmlər dəryasında boğulduqca mən
Dərdimi anlayıb duyan bir sənsən...

Vəzir həsədlə həyəcan keçirir.

V ə z i r

Məncə, hökmdarın dostları çoxdur...

X o s r o v

Adları çoxsa da, özləri yoxdur!..

V ə z i r

Dostu yaman gündə sınarlar, ey şah
Mənim vicdanıma şahiddir Allah,
Sizin uğrunuzda candan keçərəm,
Şərbət əvəzinə zəhər içərəm...

X o s r o v

Şapur, vermədimi Şirin bir qərar?

Ş a p u r

Bir cavab verməyir böyük hökmdar!

X o s r o v

Nədir susmağının səbəbi, səncə?

Ş a p u r

Bu işdə tələsən uduzar, məncə.

V ə z i r

Doğrudur, hər zəfər vaxtında gələr,
Dünyada səbr ilə hər şey düzələr.

X o s r o v

Nə qədər böyükmüş ondakı vüqar,
Mənə baş əyərkən dumanlı dağlar,
Mənim qılıncımı öpürkən göylər,
Şöhrətim etməyir o qəlbə əsər.

Ş a p u r

Şirin nifrət edir hər bir şöhrətə,
Bir də alışmamış hələ qürbətə,

Hələ öyrənməmiş bizə gözləri,
Odur ki, dərd çəkir o gözəl pəri.
Hər axşam, hər səhər dilində vətən,
Şikayət eləyir öz taleyindən.

Vəzir

Şahim... Qadınlarda bir qaydadır bu:
Naz sevər nazlanar ömrü uzunu.
Qoy atılıb düşsün sonra yumşalar,
Dünyada hər şeyin öz məqamı var...

Xosrov

Yox, daha qalmadı səbrü qərarım,
Özümdə deyildir öz ixtiyarım.
Bir qız da... bir qız da rədd edir məni,
Bu xəbər tutmuşdur bütün ölkəni.
Bu iş baş tutmazsa, düzəlməzsə, mən
Gərək baş götürüb qaçam bu yerdən!..

Vəzir

Şahim, tarixləri vərəqləyib bax...
Yaramaz bu qədər rəhmdil olmaq.
Şirin nəçidir ki, bir qızdır, bir qız...
Ona bircə dəfə təpinsən yalnız,
Bil ki, qorxusundan ödü saralar,
Bir az qüvvət göstər, böyük hökmdar!

Xosrov

(*azca fikrə getdikdən sonra*)

Bu düzdür, görürəm yumşaldıqca mən
Bir daş, daş asılır onun dilindən.
Qoy olsun... qüvvət də bir imtahandır!

V ə z i r

Hər qüvvət sahibi bir qəhrəmandır.

Ş a p u r

Düz deyil, qüvvətin, zorun yeri var,
Qüvvətə güvənər aciz olanlar.
Məhəbbət işində qüvvət yaramaz,
Yenə deyirəm ki, səbr edin bir az...
Bir də, o, Şirindir... Uçsa da dağlar,
Əyilməz qüvvətə ondakı vüqar.
Ustalıq... Ustalıq aparar yalnız!

V ə z i r

Şahı əllərində oynadır bir qız...
Mən dözə bilmərəm bu fəlakətə,
Belə bir ustalıq ziddir adətə.

Vəzir Şapura həsədlə baxa-baxa çıxır. Şapur sol tərəfdəki pərdənin arxasında gizlənir. Şirin qayət pərişan, lakin vüqarla daxil olur.

Ş i r i n

(*şaha təzim edərək*)

Sizə sözüm vardır, böyük hökmdar!

X o s r o v

Buyurun, buyurun, nə əmriniz var?

Ş i r i n

Əmr sizinkidir... qanun sizdədir,
Mənim də taleyim əlinizdədir...

X o s r o v

Yox, Allah bilir ki, qarşınızda mən
Özümün rütbəmdən və mənsəbimdən
Heç söz də açmaram...

Ş i r i n

Alicənablar
Gücə arxalanmaz, məncə hökmdar!..

X o s r o v

Səninçin ayrıldım gözəl Məryəmdən,
Uğrunda keçərəm bütün aləmdən;
Gəl inad göstərmə eşqimə qarşı,
Əyilir qarşında bir hakim başı...

Ş i r i n

Xoşdur hörmətiniz, razıyam sizdən,
Yazıq ki, qorxuram bu eşqinizdən.

X o s r o v

Yox, bu ola bilməz... dünya dönsə də,
Bizə işıq verən günəş sönsə də,
Sönməz sinəmdəki bu eşq odları...

Ş i r i n

Zavallı Məryəmi yad edin barı,
Vəfasız çıxdınız siz ona birdən,
Nə üzlə inanım eşqinizə mən?

X o s r o v

Məryəmi bir daha gətirmə yada...
Bir şey ki, qayıdan deyil dünyada,
Onu xatırlamaq kimə gərəkdir?

Ş i r i n

Ondan öz oğlu da əl çəkəcəkdir?

X o s r o v

Oğul atanındır, belədir qayda,
Anaya qızdan da yetişməz fayda.

Ş i r i n

Bu doğru deyildir... böyük hökmdar,
Gözü yolda qalan doğma anam var,
Mən öz yurdumuza qayıdam gərək!

X o s r o v

Göydən od töksə də başıma fələk,
Buraxa bilmərəm mən səni əldən,
Qismətim bir sənsən hökmi-əzəldən.

Ş i r i n

Bəs mənə döşündən süd verən ana?
Mən bir vəliəhdəm, oğulam ona.

X o s r o v

Bu iş çox asandır... sən qal İranda
Qarışsın İrana Azərbaycan da!

Ş i r i n

Nə deyim... bu sizcə belədir, bəlkə.
Lakin düşünün ki, böyük bir ölkə
Yamaq ola bilməz heç bir torpağa,
Dağlar da, daşlar da qalxar ayağa...

X o s r o v

Eşqin xatirinə mümkündür bu da.

Ş i r i n

Eşq üçün canımı salsam da oda,
Yalnız öz nəfsimə çatar ixtiyar,
Mənim yurdumunsa öz aləmi var

X o s r o v

Azacıq sakit ol... hirslənmə, Şirin!

Ş i r i n

Şahim, siyasətdir bu dediklərin,
Məncə, məhəbbətin bir bəhanədir.

X o s r o v

Yox... yox... könlüm evi bir vinadədir,
Qalsam da dünyada yurdsuz, vətənsiz,
Bir gün yaşamayım aləmdə sənsiz!
Taxtım da, tacım da qurbandır sana!..

(*Qılıncı verərək.*)

Bu qılınc... canımı özün alsana!

Ş i r i n

Qalxın, alçalmayın, inanıram mən,
Bu son sözləriniz gəldi ürəkdən...

Ş a p u r

Dayanın... fəlakət üz verdi bizə...

X o s r o v

Söylə, nə fəlakət?

Ş a p u r

Sərhədimizə
Fərhadın qoşunu hücum çəkmişdir.

Ş i r i n

Fərhadın?

X o s r o v

Tez ol bir, yaxşı danış bir!

Ş a p u r

Dağılır ordumuz onun səsindən,
Deyirlər dağ uçur hər nərəsindən.
Çox yaman gətirdi, bəxtimizə bax,
O bütün İranı viran qoyacaq...

Ş i r i n

Onun qollarında yerin gücü var,
Yəqin anam vermişdir bu hərbə qərar.

X o s r o v

Qoy qılınc qurşasın bütün igidlər;
İranda qalmasın gərək bir nəfər.
Mənim də qərarım belədir, ancaq!

Ş a p u r

Məncə, bu siyasət baş tutmayacaq.

X o s r o v

Bəs sən nə deyirsən?

Ş a p u r

Möhlət ver bir az,
Şapur siyasəti faydasız olmaz...

Şapur təzimlə baş əyir.

P ə r d ə

## ÜÇÜNCÜ PƏRDƏ

### ALTINCI ŞƏKİL

İran sərhədi. Müharibə cəbhəsidir. Topalla bir nəfər əsgər vuruşur.

T o p a l

Dayan... çarığımın bağı açıldı.

O əyilib çarığını bağlamaq istəyəndə, düşmən onu vurmaq istəyir.

T o p a l

Bir dayan deyirəm, kişi deyilsən?

Ə s g ə r

Xeyr, dava vaxtı bir əsgərəm mən!

T o p a l

(*onun ağzını yamsılayaraq*)

"Xeyr, dava vaxtı bir əsgərəm mən!"
Elə bil qan damır sir-sifətindən,
Di gəl... hə... mənə də Topal deyərlər.

Vuruşurlar, Topal onu vurub yıxır.

T o p a l

Elə, dava vaxtı bu imiş əsgər?..

Topal məğrurluqla gəzinir, ölmüş əsgərə dönərək.

Hə... aşna, necədir əhvalın sənin?
Deyəsən, taxtaya döndü bədənin?

(*Onu əlilə yoxlayır.*)

Bıy... bu ölübdür ki, bir din, ay oğlan!
Aman, ulu Hürmüz... keç günahımdan!

Fitnə iki nəfər əsgərlə vuruşa-vuruşa gəlir. Topal qılıncını götürüb əsgərlərdən birini vurur, o biri qaçır.

Topal

Gördün lələşini? Qorxdular məndən.
Bir də Topal demə, pəhləvanam mən...

Fitnə

Kül olsun başına... bundan qorxdular!
Bəs mən?

Topal

Sən igidsən, ey nazlı nigar.
Aşiqəm səndəki hüsnü camala,
O yaqut dodağa, o xəttü xala...

Fitnə

Kəs, axmaq... sən bunun iştahına bax!

Topal

Mən ölüm, gəl biz də ər-arvad olaq!

Fitnə

Sən də kişisən ki?

Topal

(*özündən xoflanaraq*)

Necə ki... nə var?

F i t n ə

Döyüş meydanında kişi olanlar
Eşqdən danışmaz... qabağıma düş!

T o p a l

(*özünü yerə vuraraq*)

Gəl... gəl öldür məni, gəl al canımı,
Halal eləyirəm sənə qanımı.

Fitnə köksünü ötürərək.

De, niyə ah çəkdin, ey nazlı canan?

F i t n ə

Bir an da çıxmayır Şirin yadımdan.
O indi qürbətdə həsrət çəkir tək,
Özümü Şirinə çatdıram gərək!

T o p a l

Yollar qorxuludur, ey nazlı sənəm!

F i t n ə

Qoy olsun, bu yoldan dönə bilmərəm.
Dağları-daşları ayaqlayaraq
Onu tapmalıyam!

T o p a l

Cəsarətə bax!

Şapur sol tərəfdən gəlir.

F i t n ə

De, kimsən? Nəçisən?

Ş a p u r

Canlı bir insan!
Söyləyin, hardadır Fərhad qəhrəman?

F i t n ə

Fərhadmı, Fərhadı sən tanıyırsan?

Ş a p u r

O mənim dostumdur, həm də qardaşım,
Köhnə yoldaşımdır, köhnə sirdaşım.
İndi mən Fərhadla görüşəm gərək!

T o p a l

İndi cəbhə yarır o qızmış pələng,
Yaxın düşmək olar?

Ş a p u r

Göstərin onu,
O müqəddəs eşqin böyük oğlunu!

Fərhad vuruşa-vuruşa sağ cinahdan gəlir. O, çox cəlddir. Şapur onu görür.

F ə r h a d

Haydı, nərə çəkib keçin irəli,
Odlar ölkəsinin mərd igidləri!

Ş a p u r

Fərhad, bir əl saxla!

F ə r h a d

De, kimsən... Şapur?!
Əziz dost... sənmisən?

Ş a p u r

Əhdimiz budur:
Dar gündə əl verib kömək göstərək.

F ə r h a d

Nə xoşbəxt döyünür sinəmdə ürək.

(*Onlar qucaqlaşıb öpüşürlər.*)

F ə r h a d

On ildir, on ildir ayrılalı biz...

Ş a p u r

Lakin ayrılmamış ürəklərimiz.
Belə bir dostum var...

F ə r h a d

Xoşbəxt ol, qardaş!
Çünki sən rəssamsan, mən heykəltəraş.
Birdir sənətimiz, ürəklərimiz.

Ş a p u r

Eyni zamanda da dost olmuşuq biz;
İgidlər dostluğa vəfasız olmaz.

F ə r h a d

(*düşünərək*)

Əyləşək... sözündə məna var bir az,
Mənim vəfasızlıq deyil sənətim,
Şahiddir öz qəlbim, öz məhəbbətim,
De görüm, sözünün mənası nədir?
Sənin bu nitqinə nə bəhanədir?

(*Şapur susur.*)

Neçin dinməyirsən?

Ş a p u r

Bəxtimdir mənim...
Fərhad qardaşımdır, İran vətənim...
Dağıdır yurdumu dostum, qardaşım.
Bütün xalq içində alçalır başım.

Fərhad fikrə gedir.

Mənim xatirimə rəhm et İrana,
Onu öz əlinlə qoyma virana!

F ə r h a d

İranı dağıtmaq məqsədim deyil,
Davam Xosrovladır, bunu sən də bil.
O mənim eşqimi oğurlamışdır,
Hələ bağrım başı boranlı qışdır...

Ş a p u r

Mən bura gəlməzdim... Şirin göndərdi,
Onun da başından aşmışdır dərdi.

F ə r h a d

Şirinmi? O özü göndərdi səni?

Ş a p u r

Bəs necə? O özü göndərdi məni.

F ə r h a d

Nə deyir, bəs onun məqsədi nədir?

Ş a p u r

Deyir ki, bu hərbə nə bəhanədir?

F ə r h a d

Bəs necə, Şirindir vəliəhdimiz,
Onu qurtarmaqçın vuruşuruq biz.

Ş a p u r

Deyir ki, tökülən qanlar nahaqdır.

F ə r h a d

Bəs belə, "tökülən qanlar nahaqdır?..."
Cəbhələr dağıdıb, ordular aldım,
Dağların bağrına vəlvələ saldım,
Nə üçün, kim üçün dastan yaratdım?
Əlimlə qan töküb günaha batdım?!
Osa, bir şöhrətçin məni unutdu,
Görünür, Xosrovun əlindən tutdu...

Ş a p u r

Orduya əmr ver çəkilsin geri,
Qırma nahaq yerə gəl igidləri...
Xosrov deyirdi ki, gəlsin barışaq,
Qan kimi qaynayıb biz də qarışaq.

F ə r h a d

Barışaq, barışaq!.. Düşünən bir şəxs
Namərd bir düşmənlə barışa bilməz.
Şirin çıxmayınca o daş qəfəsdən,
Cəbhə paltarımı soyunmaram mən!

Ş a p u r

Qardaşım, bu inad məncə nahaqdır,
Xosrov ki Banuyla barışacaqdır.

Vaxt ikən ordunu geriyə çək sən,
Qoy yaxşılıq gəlsin bizə əlindən.

F ə r h a d

Dövlət başçıları danışanadək,
Mənim müharibəm davam edəcək!

(*Qılınca söykənərək.*)

Ulu Hürmüz... ulu Hürmüz... günahımdan keç barı,
Yaman əsdi başımızdan ömrün acı ruzgarı.
O, doğrudan, atılmışsa sarayların qucağına,
Yağış-yağmur tökülməsin ana yurdun ocağına.
Ağlamasın odlar yurdu, ağlamasın qoy vətən,
Qoy parlasın taleyimiz qaranlıqlar içindən!..

P ə r d ə

## YEDDİNCİ ŞƏKİL

Şirinin qəsri. Ay işığı. Şirinlə Fitnə eyvanda oturmuşlar.
Şirin kitab oxuyur, Fitnə cəng çalıb oxuyur.

Ş i r i n

(*diqqətini kitabdan ayırır*)

Çal, çal dilə gəlsin cəngin simləri!
Uçsun buludlara xəyal şəhpəri.
Çal, gəzsin aləmi qanadlı nəğmən!
Mələklər yığışıb öpsün əlindən!
Çal ki, dolaşıqdır hökmü zamanın,
Qəlbində sevdası var asimanın,
Çal, rəqsə başlasın bütün kainat,
Şad olsun insanlıq, sevinsin həyat!..

F i t n ə

(*musiqini saxlayaraq*)

Sevin, sən də sevin, sən də gül, Şirin,
Bu dünya dediyin, ömür dediyin
Köçəri bir qudur...

Şirin qoynundan bir parça kağız çıxararaq, onu həzin-həzin oxuyur.

Ş i r i n

(*Fitnəyə*)

Yazıq... yazıq anam köçdü dünyadan.

F i t n ə

Bir gün öləcəkdir bir gün yaranan,

Ş i r i n

Yox, onu öldürdü mənim həsrətim,
Ah, mənim xəyalım, mənim möhnətim...
Onu son nəfəsdə görsəydim barı!
Doyunca öpsəydim o dodaqları!..
Ana... ana – deyib bir ağlasaydım,
Qəbrinə bir dəstə gül bağlasaydım!..

F i t n ə

Təqsir özündədir... xəyala uydun,
Doğma ananı da o gündə qoydun.

Ş i r i n

Düzdür... Azər baba dedi vaxtında,
Başqa yazı varmış mənim baxtımda...
Düzdür... məhv elədi məni xəyallar,
Aman, nə dəhşətli bir taleyim var.

F i t n ə

Fərhad çıxmamış ki, hələ yadından?

Ş i r i n

Səcdəyə layiqdir ondakı vicdan.

F i t n ə

Eləsə, zəhmət çək Fərhadı sev sən.
Eşqin şərbətini sən iç əlindən!

Ş i r i n

Bəs Xosrov?

F i t n ə

Xosrovu sevən çox olar,
Fərhadın nə taxtı, nə də tacı var.

Ş i r i n

Xosrov da taxtından, tacından keçir,
Görmədin, ayrıldı Məryəmdən yazıq.
Məhəbbət görmədi məndən azacıq.
Onun da taleyi gətirir qara,
Günəşi qərq olur qaranlıqlara.

F i t n ə

Bəlkə, ikisini birdən sevəsən?

Ş i r i n

Hələ verməmişəm qərarımı mən.
Xosrov hökmdardır, Fərhad qəhrəman,
Onları üz-üzə qoymuşdur zaman.

Kimin sinəsində böyüksə ürək,
Onun məhəbbəti qalib gələcək!

F i t n ə

Eləsə... Xosrovdan iştahını çək,
Fərhad öz eşqilə qalib gələcək!

Ş i r i n

Ver çalım, dağılsın başımdan fikir,
Xəyal zəhər kimi məni əridir...

Cəng çalır. Fərhad bağçaya gəlir, musiqini dinləyir.

F ə r h a d

Bir hicran oxunur cəngin səsindən,
Canan barmağının titrəməsindən.
Bəlkə də, yad edir sevgilim məni,
Düşünür başımdan gəlib keçəni?!
Bəlkə də, qəlbinə doğmuşdur səhər,
Eşqimi duymuşdur o nazlı dilbər.

(*Fərhad eyvana yaxınlaşaraq.*)

Axşamınız xeyir!..

Şirin və Fitnə ayağa qalxırlar. Fitnə yüyürərək eyvandan düşür.
Fərhadın boynuna sarılaraq.

F i t n ə

Fərhad... qardaşım!

F ə r h a d

Çox sağ ol, vəfalı könül sirdaşım!

Ş i r i n

(*eyvandan*)

Yaxın gəl, azacıq yaxın gəl, barı,
Dağıt qəlbimdəki iztirabları...

F ə r h a d

Mən bu lütfə qarşı çox minnətdaram,
Bu sonsuz dünyada nə qədər varam –
Sənin qulluğunda hazıram canla,
Hazıram əvvəlki əhdü peymanla!

(*Baş əyir.*)

Ş i r i n

Buna inanıram, doğrudan da sən
Böyüksən dünyanın hər nemətindən.
Odur ki, fikrinlə bəzi gecələr
Çırpınır ürəyim sabaha qədər.
Azacıq səbr elə...

F ə r h a d

Səbrim hələ var...
Dənizə axsa da tükənməz sular,
Tükənməz eşqimin can xəzinəsi...

Ş i r i n

Duyuram səsində həqiqət səsi.
Göylər işıq saçsın istiqbalına,
Yetiş hər arzuna, hər vüsalına!

F i t n ə

Bu dərdin dərmanı səndədir, Şirin
Söz olub qalmasın bu dediklərin,

Könül ver Fərhada, intizardadır,
O bir aslan kimi indi dardadır.

Ş i r i n

Daşmı zənn edirsən mənim qəlbimi,
Qırılır qəlbimdə rübabın simi.

O, eyvanın sütununa başını qoyub fikrə gedir.

F ə r h a d

Sənə yaraşmayır qəm yemək, Şirin!
Axırı şadlıqdır bu məhəbbətin.
İndi Bisütunla girirəm hərbə,
Görək nə göstərir bu müharibə?..

Ş i r i n

Necə, Bisütunla, bu nədir, danış?!

F ə r h a d

Neyləyim, başqa bir çarə qalmamış.
Bisütun dağını mən yara bilsəm,
Bu yaxın zamanda qurtara bilsəm,
Xosrov əl çəkəcək o zaman səndən.
Şərtimiz belədir... söz vermişəm mən.

Ş i r i n

Bunu Xosrov deyir?

F ə r h a d

O deyir, bəli.
Görək neyləyəcək taleyin əli.

Ş i r i n

Bir insan qüvvəti neylər o dağa;
Zaman qarışıqdır, getmə uzağa!

F ə r h a d

Əfv et, söz vermişəm, sözündən dönən
Hər insan oğluna ar olsun gərək!
Bağlanan bir şərtdən çəkinsəm əgər,
Eşqin qüdrətinə aciz deyərlər.

Ş i r i n

Yox, layiq görmərəm mən bunu sana,
Ölümdən pis olar töhmət insana.
Bəs indi neyləyim?

F ə r h a d

Xeyir-dua ver!
Ayağım altında titrəməsin yer,
Günəş işığını məndən kəsməsin,
Başımdan qara yel gəlib əsməsin.
Gözümdən daima çəkilsin yuxu,
Qəlbimə girməsin şübhə və qorxu.
Gül dodaqlarınla xeyir-dua ver,
Ayağım altında titrəməsin yer!..

Ş i r i n

Xeyir-duaçıyam sənə hər zaman!
Get, zəfərlə qayıt bu imtahandan.
Daşlara dəyməsin oxun, kamanın,
Sənin dostun olsun hökmü zamanın,
Hər insan qüvvəti, hər qaya, hər dağ
Qarşında diz çöküb titrəsin zağ-zağ.
Yazılsın alnına min zəfər səsi,
Adınla fəxr etsin Odlar ölkəsi!

F ə r h a d

Əlvida, gecəniz xeyirə qalsın!

Ş i r i n

Get, hünər bayrağın göyə ucalsın!

Fərhad baş əyib gedir. Fitnə onun arxasınca su atır. Şirin taqətsiz bir halda bağçadakı ağacın gövdəsinə söykənir.

F i t n ə

Bu da bir ayrılıq, bu da bir hicran!
Qan gedər qəlbimin damarlarından...

Ş i r i n

Nə qədər mənalı, təvazökardır,
Ah... onda nə böyük iradə vardır...
Odlara düşsə də çəkilməz geri,
O torpaq oğlunun göylərdir yeri.

F i t n ə

Halal süd əmmişdir ana döşündən,
Yaranmış qəlblərin ilk görüşündən.
Tarixlər deyəcək kim olduğunu,
Lənətə gələsən, sevməsən onu!

(*Fitnə acıqlı evə gedir.*)

Ş i r i n

(*dua edir*)

Ulu Hürmüz... Sən yaratdın Fərhad adlı igidi,
Neçin onu dərdə saldın, de, günahı nə idi?
Onun eşqi bir dənizdir, nə olar ki, ondan sən
Öz əlinlə bir damlacıq ürəyimə səpəsən.

Hava qaranlıqlaşır, bir az sonra səhərdir. Şeypur çalınır. Şapur qabaqca gəlir, Şirinlə Fitnə eyvana çıxırlar.

Ş a p u r

Sizi görmək üçün gəlir hökmdar,
Artıq nə səbri var, nə qərarı var,
Bir az da hirslidir, düşünün bunu,
Bir də, unutmayın şah olduğunu!

(*Baş əyir.*)

Ş i r i n

Özünü şah kimi göstərsə əgər,
Şaha da şahanə cavab verərlər.

F i t n ə

Ah, belə dilinə qurban olum mən.

Ş a p u r

Xosrov alicənab bir hökmdardır,
Onun vicdanı da, eşqi də vardır,
Çalışın, çıxmasın o əlinizdən!

F i t n ə

Çox zəhmət çəkməyin, razıyıq sizdən.

X o s r o v

(*daxil olur. Şirinə baş əyərək*)

İran torpağında doğan səhərdən
Sənə salam olsun, bəxtiyar gözəl,
Mən eşq əsiriyəm, mərhəmətə gəl...

Ş i r i n

Bu hörmətə qarşı çox minnətdaram!

X o s r o v

Bu dünya mülkündə nə qədər varam
Yerindən qoparaq dönsə də aləm,
Mən öz dediyimdən dönməyəcəyəm!

Ş i r i n

Şərt bağlamışsınız Fərhad ilə sən,
Nəticə çıxmamış bağlanan şərtdən,
Nə deyə bilərəm?

X o s r o v

Mənə bəllidir...
Bağladığım şərt də bir təsəllidir.

Ş i r i n

Necə ki?

X o s r o v

Atsam da onu odlara,
Tutub boğazından çəksəm də dara,
O yenə aləmdə sağ qalacaqdır,
Onun qüdrətindən ölüm uzaqdır.

Ş i r i n

Bir addım atsanız bu şərtdən kənar,
Bu, eşq aləmində namərdlik olar..
Şaha layiqmidir belə bir pis ad?

X o s r o v

Onsuz da gözümdə heçdir bu həyat,
Bil ki, qarşındakı bir hökmdardır,
Əlimdə qanun da, qüvvət də vardır...

Ş i r i n

Qüvvətmi göstərmək fikirindəsən?

Ş a p u r

Yox... Yox... xəta çıxdı şahın dilindən,
İpəkdən yumşaqdır onun ürəyi,
Bir sənsən dünyada fikri, diləyi...

X o s r o v

Dil tökmə!..Qüvvət də dostumdur mənim.
Qısqanclıq odunda yanır bədənim.
Bu nə dövrandır ki, bir memar gəda
Rüsvay edəcəkdir məni dünyada.

(*O, qəzəblə gəzinir.*)

F i t n ə

O, gəda deyildir... böyük hökmdar,
Hər insan qəlbinin öz aləmi var.

X o s r o v

Mənim də ürəyim deyil oyuncaq,
Bil ki, son qərarım qılıncdır, ancaq...

Ş i r i n

Məhəbbət qüvvətlə yaşamaz qoşa...
Eşqə atılan ox tez çıxar boşa...
Əzəldən dünyada bir qanun da var:
Ürəyə hökm etmək ürəklə olar!..

X o s r o v

Mənim də sinəmdə o ürək vardı,
Zamanın suları yuyub apardı.
İndi söz qılıncın və qüvvətindir,
Bütün günahlar da məhəbbətindir...

Ş i r i n

Fəqət Fərhadda da o qüvvətdən var,
Onun qarşısında diz çökür dağlar.
İldırım əriyir hər nərəsindən,
Şahlar da tac tökür onun səsindən,
Lakin... Bir gün belə Fərhadın başı,
Məğrur dayanmadı sevdaya qarşı.

F i t n ə

Həqiqi aşiqlər belə yaranar.

X o s r o v

Verdiyin son qərar... nədir son qərar?

Ş i r i n

Verdiyim qərarmı? Açıqdır, məncə,
Bir qadın ürəyi deyil əyləncə!
Nə qədər canlıyam, nə qədər varam,
Ölsəm də qüvvətə təslim olmaram!
Bu gündən sevirəm, sevirəm onu,
Öz ana yurdumun igid oğlunu!

X o s r o v

(*qəzəblə*)

Qoy olsun, göylər də ildırım töksün,
Dünyanın qəlbini tufanlar söksün,
Mənim ki taleyim gətirdi qara...

Ş a p u r

(*onun sözünü kəsərək*)

Şahim, bir son qoyub iztirablara,
Azacıq soyudun bu hirsinizi,
Şirin bu sözlərlə sınayır sizi...

Nə qədər acıymış sizin diliniz,
Pərişan olmuşdur öz sevgiliniz.

Ş i r i n

Xeyr, aldatmışdır məni şeytanlar.
Ah... yalançı kahin, səni ruzigar
Görüm bu dünyada külə döndərsin,
Cəhənnəm oduna səni göndərsin!

Şapur iztirab keçirir.

Sizə son cavabım belədir yalnız,
Təhqirlə, təhdidlə sevilən bir qız
Qəlbini tapşırmaz Allaha belə...

X o s r o v

Eşitdin? Eşitdin? Bu gündən belə...
Alov püskürəcək ağzım dünyada,
Çoxlarının yurdu gedəcək bada.
Qoy olsun! İnan ki, nə qədər sağam,
Bu eşqin evinə od vuracağam!

Xosrov hirsli gedir, dalınca da Şapur.

Ş i r i n

(*Fitnənin boynunu qucaqlayaraq*)

Mən indi bildim ki, böyükdür Fərhad,
Onun şöhrətinə yaraşır bu ad!
Ömrüm də, eşqim də halaldır ona –
Odlar ölkəsinin böyük oğluna!..

Fitnə sevinərək, Şirinin üzündən öpür.

P ə r d ə

## SƏKKİZİNCİ ŞƏKİL

Bisütun dağı. Fərhad dağ döşündə Şirinin əksini nəqş edir,
Şapur kahin libasında gəlir. Salam verib görüşəndən sonra.

Ş a p u r

Orda qılınc vurur Bizansla İran,
Sənsə dağ yarırsan...

F ə r h a d

Belədir insan,
Bir yandan uçurur, bir yandan qurur,
Gah ləkə yaradır, gah zinət vurur...

Ş a p u r

İranmı, Bizansmı qalib gələcək?

F ə r h a d

Dəyişir səmtini cəbhə külək tək;
Bizans dövləti də qüvvətlidir, bil,
Onunla çarpışmaq çox asan deyil.

Ş a p u r

Yaxşı, bu hay-küylə qurduğun nədir?

F ə r h a d

Nə saray, nə də ki, həbsxanədır;
Bu bir abidədir məndən yadigar,
Gəlib dolandıqca dövran, ruzigar,
Dünyanın özü də qocalacaqdır,
Biz ölüb getsək də, bu qalacaqdır.

Ş a p u r

Eh... sən də nə qoyub, nə axtarırsan,
Mən öləndən sonra dünya dağılsın!

(*Əyləşir.*)

F ə r h a d

Qorxma, sən ölsən də dünya yox olmaz,
Artıq adamların sayı çox olmaz...
Şöhrətçin hər haqqın ziddinə gedən,
Qəlbini, beynini qurd kimi yeyən,
Günəşin üzündə ləkə var deyən...

Ş a p u r

(*əsnəyərək*)

Başa düşməyirəm...

F ə r h a d

Baş olsun gərək...

Ş a p u r

Nə olub, qazandır bizim başımız?

F ə r h a d

Yox, baba, başınız qazan deyildir,
Qazanda su qaynar, başdasa fikir...
Bir dur, yaxına gəl, bu lövhəyə bax,
Bizdən bu dünyaya zəhmət qalacaq.

Ş a p u r

Sağ ol, mən gedirəm, yolum uzaqdır.

(*Şapur öskürə-öskürə gedir.*)

F ə r h a d

Yaxşı yol!

(*O, kənara çəkilib, əksə baxır.*)

Gün kimi üzün parlaqdır,
Eşqiylə ömrümü güldürən sənəm,
İndi həsəd çəksin qoy sənə aləm;
Qoy gül camalından günəş yüksəlsin,
Ulduzlar hüsnünə salama gəlsin!

(*Öz külüngünü götürərək.*)

Təslim ol, təlsim ol, Bisütun dağı!
Parlasın eşqimin sönməz ocağı.

O, yarılmış dağa daxil olur. Dağın içində külüng səsləri eşidilir. Sol tərəfdən Şiruyə bir dəstə ilə gəlir. O dağın üstünə qalxaraq müharibə meydanına baxır.

Ş i r u y ə

Odur, o Məryəmdir, hünərə bir bax!
İran orduları geri qaçaraq
Təslim olurlar ki...
Ah... Məryəm... ana!
Ölməyib əllərim çatsaydı ona,
Üzərdim başını bir sərçə kimi!..

M ü c a h i d

Şiruyə, ağlarsa bir ana qəlbi,
Ölkədə bir qara matəm yaranar,
Dünyada hər şeyin dərəcəsi var.

Ş i r u y ə

O, ana deyildir, alçaqdır, alçaq!
Yaxın gəl, bu sonsuz qırğınlara bax;

Odur, o Məryəmdir onu törədən.
Onun oğlu deyil, düşməniyəm mən!..

(*Birdən gözləri əksə sataşır.*)

Aman... nə gözəldir, sanki mələkdir,
Kim bilir kefini kim sürəcəkdir!..
Görək nə yazmışdır mənə qismətim,
Mənim də qəlbimdə var məhəbbətim,
Ah, Şirin... bir gecə sənə çatsaydım,
Qoluna baş qoyub, bir an yatsaydım...

Getmək istəyərkən, Şapur onları qarşılayır.

Şiruyə

Aha... sən burdasan, danış, nə xəbər?

Şapur

Baş-başa gəlmişdir bütün cəbhələr,
Qorxuram basılsın yurdumuz İran.
Odur, Qara dağı aşır bizanslar,
Ağ göl yanında da orduları var,
O taya əvvəlcə yetişməsək biz,
Suda qərq olacaq əsgərlərimiz!

Şiruyə

Bəs Bisütun dağı tezmi qurtarar?

Şapur

Yox, canım bu dağın uzun işi var.
Hələlik Bisütun yarılanadək,
O yandan, Ağ göldən hücuma keçək.

Şiruyə

Gedək!

Gedirlər. Sol tərəfdən Məryəm bir dəstə iranlı ilə vuruşa-vuruşa gəlir. İran ordusu böyük tələfat verir. Məryəm öz qılıncı ilə böyük qəhrəmanlıqlar göstərir. Birdən gözləri Şirinin əksinə sataşır.

M ə r y ə m

(*əksi süzərək*)

Yurdumu-yuvamı dağıdan afət!
Qiyamət qopacaq, hələ, qiyamət!

(*Öz adamlarına.*)

Gedin, tez Fərhadı çağırın ordan!

S ə s l ə r

Şahzadə, bu dağa girərmi insan?

M ə r y ə m

Tez ol, çox danışma!

(*İki nəfər dağa daxil olur.*)

Yarılsa bu dağ,
İran şahlığına kömək olacaq –
Onlar ordusunu çəkəcək səf-səf,
Bizans torpağının üstünə tərəf.

(*Məryəm yenə əksə yaxınlaşaraq.*)

M ə r y ə m

Nə böyük sənətlə nəqş olunmuş, ah!
Onun taleyinə parlayır sabah.
Onu Xosrov sevir... Fərhad can verir...
Mənsə talesizəm, yaram qan verir...
Qoy olsun, intiqam istər ürəyim,
Gözlərimdə qaldı hər bir diləyim.

Fərhad çıxır. Məryəm kənara çəkilərək

Məryəm

De görüm, bu dağı neçin yarırsan?

Fərhad

Dağları çapmağa yaranmış insan!

Məryəm

Sözümə cavab ver, igidsənsə sən!

Fərhad

Yalan çıxmamışdır hələ dilimdən.

Məryəm

Yalandır dediyin, uydurmalardır,
Bu dağı yarmaqda nə fikrin vardır?

Fərhad

Eşqin qüdrətinə bir imtahandır,
Bu da bir dövrandır, hökmi-zamandır.
Şirinin eşqiylə düşdüm möhnətə.
Siz də alqış deyin bu məhəbbətə.

Məryəm

Xeyr, nə eşq var, nə sadiq insan,
İran ordusuna sən yol açırsan.
Bütün siyasətlər bəllidir mana.
Budur, bax, əllərim batmışdır qana,
Çıxar qılıncını!

Fərhad qılıncını çıxarır. Məryəm onun üzərinə hücum çəkir.

Fərhad

(*dayanaraq*)

Səni and verirəm ulu Hürmüzə,
Mənimlə bir daha gəlmə üz-üzə!

Məryəm

Aha, qorxaq igid, nə oldu adın?
Hünəri buydumu məşhur Fərhadın?

Məryəm onu qovur, Fərhad qılıncla özünü müdafiə edir.

Qaçma qabağımdan, mən də Məryəməm,
Ölümdən qorxmayır bu taleyi kəm.

Fərhad

(*öz qılıncını ataraq*)

Yalvarıram sənə, qalxmayır qolum,
Qoyma ki dünyada günahkar olum!
Ömrümdə qadına əl vurmamışam,
Mələklə üz-üzə heç durmamışam.

Məryəm qılıncını qınına qoyaraq fikrə gedir.

Məryəm

Düşmənim olsan da mərdmiş ürəyin.
Görünür, qəzası buymuş fələyin...

Şiruyə

(*arxa tərəfdən gələrək*)

Aha, burdasan ki, vəfasız qadın,
Lənətə, nifrətə layiqdir adın!

M ə r y ə m

Ah, oğul, dar gündə köməyim ol, gəl!
Özün dur arxamda hamıdan əvvəl,
Sənə döşlərimdən süd vermişəm mən...

Ş i r u y ə

Xəbərin vardırmı xəyanətindən?
Təslim ol, təslim ol, fitnəkar iblis!
Bu gündən nə ana, nə oğuluq biz!..

M ə r y ə m

Mənmi təslim olum? Bunu görməzsən!
Xosrovun yanına qul getmərəm mən.
Südüm haram olsun bu gündən sana...
Köməyin budurmu yazıq anana?

Ş i r u y ə

"Köməyin, köməyin..." Təslim ol, xain,
Məni aldadammaz bu dediklərin!
Bizans dövlətinə satmaqla bizi,
Sən məhv edəcəksən şah nəslimizi.

M ə r y ə m

Bəs belə, yaxın gəl, ananı öldür,
O xain atanın üzünü güldür.
Di gəl, nankor bala, gəl vuruşaq biz,
Tarixdə söylənsin bu faciəmiz.

Şiruyə hücum edərək, Məryəmin üstünə qılınc çəkir,
Fərhad onun qılıncını vurub salır.

F ə r h a d

Bir dayan, binamus, vicdanın varmı?
Oğul da anaya əl qaldırarmı?

Məryəmin qılıncı biixtiyar əlindən düşür, o qayət pərişan və taqətsiz bir hal alır, hamının nəzəri ondadır.

Məryəm

Dedim, oğlum alar intiqamımı,
O da gözlərimdə qoydu kamımı!
Kimə arxalanmaq, kimə inanmaq?
Görünür, qismətim bu imiş ancaq.
Öl, Məryəm, bağlandı taleyin yolu,
Bədbəxt bir ananın öz doğma oğlu
Ona qılınc çəkir, göylər tökülsün,
Qoy bütün kainat üstümə gülsün!
Qoy dağlar yıxılsın mənim naləmdən,
Əsir düşməkdənsə, ölməliyəm mən!..

Məryəm xəncərlə özünü vurub, yıxılır.

Fərhad

Salın bayraqları, bir qaydamız var:
Qəhrəman ölərsə, bayraq sallanar.

Məryəmin cənazəsi üstünə bayraq sallanır.

Fərhad

(*onun qarşısında diz çökərək*)

Nə qədər mərdanə bir ölümdür bu,
Həyatın, varlığın nə olduğunu
Ölüm də bildirir dünyaya bəzən,
Ölsən də, ölümdən yüksəkdəsən sən!
Ah, talesiz qadın, talesiz ana,
Nə deyim, nə deyim mən bu dövrana!..

Pərdə

## DÖRDÜNCÜ PƏRDƏ

### DOQQUZUNCU ŞƏKİL

Xosrovun otağı. Sağ tərəfdə onun yerdə salınmış yataq yeri.
Xosrov və vəzir daxil olurlar.

X o s r o v

Çoxmu keçmiş gecədən?

V ə z i r

Sizinləyəm hələ mən,
Qəm yeməyin hökmdar...

X o s r o v

Çox yorğunam, yuxum var.

V ə z i r

Rahat olun, böyük şah,
Dərdinizə bir Allah
Kömək olsun hər zaman!..

X o s r o v

Tüstü çıxır başımdan...
Elə bil uçurumlar
Ağız açmış qarşımda.
Bəlkə də bir tufan var
Mənim qoca başımda?..

V ə z i r

Bəzən olur insanda
Qara, qorxunc xəyallar,

Ancaq yatıb-qalxanda
Unudulur bu hallar.
Yatın, dincəlin bir az!

X o s r o v

Hələ dayan, qulaq as.
Fərhad çapsa o dağı
Taleyimin ocağı
Sönəcəkdir, eləmi?

V ə z i r

Şahim... unut bu qəmi,
Fərhad gələn zamanda
Başqa bir imtahan da
Ona təklif edərsən.

X o s r o v

Xeyr, söz vermişəm mən,
Sonuncu imtahandır,
Şahidimiz zamandır!
Kişi qaçmaz sözündən!

V ə z i r

(*yalandan köks ötürərək*)

Eləysə... Şirini alacaq Fərhad.

X o s r o v

Sus... Odlar töksə də bütün kainat,
Əlimdən vermərəm Şirini bir an!
Gülərlər üstümə mənim hər yandan.
Hamı ağız açıb deyər ki, bir bax,
Hökmdar əllərdə oldu oyuncaq...

V ə z i r

Elədir... elədir, böyük hökmdar,
Mən bir az yanıldım... Bir də düşmanlar
Sizə dil çıxarıb güləcək, şəksiz,
Kaş düşməyəydiniz bu oyuna siz...

X o s r o v

Eyb etməz, olsa da bəxtim oyuncaq,
Yoxdur xilqətimdə peşiman olmaq...
Tale nə yazırsa, qoy yazsın mana,
Mənə də süd vermiş igid bir ana.
Başımda çaxsa da odlu şimşəklər,
İnan ki, sonuncu nəfəsə qədər
Qılınc vuracağam bu meydanda mən,
Qisas alacağam öz taleyimdən!

Bayırda səs-küy qopur.

Ş a p u r

Fəlakət, fəlakət!

X o s r o v

Bu nədir, nə var?

Ş a p u r

Fəlakət, fəlakət... hanı hökmdar?

(*Şapur daxil olur.*)

Ah, dilim tutmayır deməyə, şahim!..

X o s r o v

De, nə müsibətdir?

Şapur

Qara bir xəbər,
Qara bir xəbərlə gəldi gedənlər...

Xosrov

Deyirəm, nə varsa, müfəssəl danış!

Şapur

Neyləyim, canımda tutar qalmamış,
Deyirlər ki, Fərhad qurtarır dağı,
Həm də salamatdır əli, ayağı...
Qayalar uçduqca başına bəzən,
Yenə tərpənməyir durduğu yerdən,
Ayağı altında diz çökür dağlar,
Onun qollarında Allah gücü var.

Xosrov məyus olur, onun qolları yanına düşür.

Xosrov

Qəlbimə dammışdı bu qara xəbər,
Yeyirdi qurd kimi içimi qəmlər...
Mən məğlub oluram... dərd nə böyükdür,
Gövdəmin üstündə başım bir yükdür.

(*O, başını tutub taxta əyləşir.*)

Pauza.

Şapur

Məni də qəhr edir bu məğlubiyyət.

Vəzir

(*ətrafa*)

Əlbəttə... gözündə qalacaq niyyət...

Ş a p u r

Dünyanın qəribə oyunları var,
Şöhrətsiz, mənsəbsiz sadə bir memar
Bizə qalib gəlir öz qüvvətilə.

V ə z i r

(*ətrafa*)

Xeyr... qalib gəlir məhəbbətilə.

X o s r o v

(*ayılaraq*)

Şapur, vəfalı dost... yanır bədənim,
Əriyir mum kimi varlığım mənim.
Söylə bir, başqa bir çarəmiz varmı?
Başqa bir tədbir də mümkün olarmı?

Ş a p u r

Yox, şahim, sonuncu imtahandır bu.

X o s r o v

Yox, demə, bu töhmət ömrüm uzunu
Tarix kitabımda bir ləkə qalar.

Ş a p u r

Çox qəzəblənməyin, böyük hökmdar,
Yaxşısı budur ki, azca yatın siz.
Yatın ki, dincəlsin əsəbləriniz...

X o s r o v

Demək ki, bağlanır qurtuluş yolu...
Azəri yurdunun bir memar oğlu

Şaha qalib gəlir... qoy olsun, ancaq
Mənim son nərəmdən tufan qopacaq!

O, hirslə divardakı qılıncı götürərək.

Yenə də qoy qılınc düşsün meydana,
Yenə də əllərim boyansın qana,
Mən ki, yetişmədim kama dünyada,
Qoy qismət olmasın Şirin Fərhada!

(*Onun əlləri titrəyir.*)

Ş a p u r

Şahim, sakit olun... fikriniz nədir?

X o s r o v

Çəkil... könlüm evi bir viranədir...
İntiqam... intiqam alacağam mən.

Ş a p u r

Kimdən alırsınız?

X o s r o v

Ondan... Şirindən!
Qayıdıb tapmasa Fərhad onu sağ,
O kimin eşqilə külüng vuracaq?
O vaxt sərçə kimi boğaram onu,
Anlayar qarşımda qul olduğunu!

V ə z i r

Şahim, bu hünəri alqışlar vətən,
Qılınc qüvvətlidir hər nəsihətdən.
Vur onun başını... Şirin qalsa sağ,
Axırda Fərhada qismət olacaq!

X o s r o v

Lakin üşütməyə düşdü bədənim,
Titrəyir, titrəyir əllərim mənim.
Mən çox igidlərə qılınc çəkmişəm.
Çoxunun yurdunda bostan əkmişəm,
Ancaq qorxmamışdım heç vaxt bu qədər,
Elə bil mənimki deyil bu əllər.
Nə qədər gözəldir... Gözələ qıymaq!
Qoy olsun, əlacım bundadır ancaq!

(*O, çılğınlıqla çıxmaq istəyir.*)

Ş a p u r

(*onu qarşılayaraq*)

Amandır, rəhm edin bizə, hökmdar!

X o s r o v

Çəkil... Pozulmazdır verdiyim qərar!

Ş a p u r

Bəs dostluq? Bəs mənim dostluğum hanı?
Yoxsa unutdunmu əhdi, peymanı?

X o s r o v

Nə var, nə deyirsən?

Ş a p u r

Dayanın bir az...
Məncə, son imtahan faydasız olmaz...

V ə z i r

Şahim, verdiyiniz qərar gözəldir,
Allahlar əyəni qılınc düzəldir.
Artıq dayanmayın, intiqam alın,
Fərhadın bağrına tufanlar salın!

X o s r o v

Doğrudur...

Ş a p u r

Dayanın, böyük hökmdar!
Məncə acizlikdir belə bir qərar.
Silahsız bir qıza qılınc qaldırmaq
Şahlıq şöhrətinə ləkədir ancaq!

X o s r o v

Şapur... başqa bir yol qalmamış daha.
Səni and verirəm böyük Allaha,
Mənə mane olma...

Ş a p u r

Yox, tədbirim var,
Bu son tədbiri də eşit, hökmdar,
Şapur siyasəti deyərlər buna,
Siyasət arxadır şah ordusuna!

X o s r o v

Yaxşı, tədbirini danış, hər nəsə.

Ş a p u r

Lakin bu tədbiri salmayın səsə;
Fərhadın yanına qaçıb yenidən
Qara bir xəbərlə getməliyəm mən.

X o s r o v

Nə xəbər?

Ş a p u r

Biz dostuq, inanır mana.
Deyərəm, bir matəm düşdü İrana,
Deyərəm, dağları nahaq çapma gəl,
Səndən ayırmışdır Şirini əcəl.
Deyərəm, ölmüşdür o gözəl pəri,
Artıq yumulmuşdur eşqin gözləri.
O zaman Fərhadın partlar ürəyi,
Sonra başa gələr şahın diləyi.

Xosrov fikrə gedir.

V ə z i r

Birdən partlamadı onun ürəyi,
Başa gələcəkmi şahın diləyi?

Ş a p u r

Partlayar... Şirindir onun nəfəsi,
Şirinsiz kəsilər ağzında səsi;
O, Şirin eşqilə oldu qəhrəman,
Onsuz yer üzündə yaşamaz bir an.

X o s r o v

Şapur, əziz dostum, doğru deyirsən.
Doğrudur, başımı itirmişəm mən.
Qurduğun bu tədbir gözəldir, bəli,
Get, sənə yar olsun taleyin əli.
Bu tədbir baş tutsa... baş tutsa.. inan,
İrana baş vəzir sən olacaqsan!

Şapur təzim edir, vəzir həsədlə həyəcan keçirir.

Ş a p u r

Var olsun daima tacü taxtınız,
Parlasın günəş tək sizin baxtınız!
Artıq yola düşdüm... dayanmaq olmaz.
Bir həftəlik yoldur, geciksəm bir az,
Mən çatana kimi qurtarar dağı,
Sönər bəxtimizin odu, ocağı.

V ə z i r

Eləsə... dayanma... Əs ruzgar kimi,
Özünü tez yetir tufanlar kimi!
Ancaq yaxşı çalış, hərif inansın,
Qoy bağrı od tutub, alışıb yansın!

Ş a p u r

Siz arxayın olun, Şapurdur gedən.

Gedir.

X o s r o v

Sənin qüdrətinə inanıram mən.
O mənə yaxındır doğma qardaşdan,
Dostluğa möhkəmdir binadan, başdan.

V ə z i r

Doğrudur... O sizə çox mehribandır,
Xidmət də göstərir xeyli zamandır.
Yenə gözünüzdən tökülür yuxu,
Yatın, rahat olun... ehtiyacdır bu.

Xosrov tacını və libasını çıxarıb bir yanda qoyur,
sonra yatacaq yerinin pərdəsini qaldırır.

X o s r o v

Yaxşı, mən dincəlim.

V ə z i r

Dincəlin.

X o s r o v

Görək,
Sonuncu imtahan nə göstərəcək?..

Xosrov yataq otağına daxil olur.

V ə z i r

(*öz-özünə*)

Yat, böyük hökmdar, azacıq dincəl,
Lakin boğazından yapışmış əcəl.
Yat, şirin yuxu gör... Fərhad öləcək,
Şapur vəzir olub, iş düzələcək...
Yat, Zəm-zəm suyunda üzsün bədənin,
Öz oğlun olacaq qatilin sənin.

Ş i r u y ə

(*sol tərəfdən ehtiyatla daxil olur.*)

Yatdımı?

V ə z i r

Səbr elə, ehtiyat gərək...
Eşitdin neylədi o Şapur köpək?

Ş i r u y ə

Bəli, qulaq asdım, eşitdim bir-bir...

V ə z i r

Baş tutsa, vəzirlik əldən gedəcək,
Sən də ki Şirini uduzacaqsan.

Ş i r u y ə

Bir yoxla, yatdımı?

V ə z i r

(*pərdə arxasından*)

Böyük hökmdar...
Mən artıq gedirəm.

Cavab gəlmir.

Yatdı, Şiruyə!

Ş i r u y ə

Qəlbimdə şaxtalar, buzlar var kimi,
Qorxu didir məni canavar kimi...

V ə z i r

İgid qorxu bilməz... geri qayıtmaq
Sənin ölümünə yol açar ancaq!

Ş i r u y ə

Azacıq səbr elə, əllərim əsir,
Canımı bir qara üşütmə kəsir.

V ə z i r

Özünə toxtaq ver, ürək ver bir az,
Cinayət vaxtında gecikmək olmaz!

Şiruyə özünü toplayaraq pərdəni qaldırır, lakin vahiməli bir halda geri çəkilir.

Ş i r u y ə

Aman... sifətində nə dəhşətlər var!..
Onun başındakı ağarmış saçlar
Nə qədər mehriban görünür mana...

V ə z i r

Mən sonuncu dəfə deyirəm sana.
Yoxsa haray salıb qışqıraram ha!..

Ş i r u y ə

Dayan, and verirəm səni Allaha,
Qoy getsin qəlbimdən bu döyüntülər...

V ə z i r

Tez ol, tez, bir azdan açılar səhər,
İşıq cinayəti örtüb basdırmaz,
Mən dünya görmüşəm, mənə qulaq as!

Şiruyə yenə daxil olur. Bir azdan Xosrovun ah səsi eşidilir. Şiruyə əlində qanlı xəncəri qayıdır. Onlar divara qısılıb qulaq asırlar.

X o s r o v

Ah, namərd... kor tale... buydumu hökmün...

Sürünə-sürünə yataqdan bəri gəlir, oğlunu görüncə.

Ah, oğlum, öldürdü namərdlər məni,
Yaxın gəl, son dəfə bir öpüm səni!

Vəzir Şiruyəni arxadan təhrik edir, o yenə soxulub bir xəncər də vurur və dəhşətlə geri çəkilir.

X o s r o v

Aman... nankor balam... de, neylədin sən!
De, hansı namərddir səni öyrədən?
Halal eləyirəm sənə qanımı,
Tapşırıb gedirəm xanimanımı.
Son vəsiyyətimə qulaq as, ancaq,
O namərd sənə də xain çıxacaq.
Hər kimsə, aldanma, ona inanma,
Xəyanət oduna sənsə də yanma!

Ş i r u y ə

Aman... nə mənа var onun səsində,
O məni düşündü son nəfəsində...

Vəziri yaxalayıb pərdənin dalından çəkir.

Gəl, onun üzünə, gözlərinə bax,
Sən məni tovlayıb azdırdın, alçaq!
Al, bu da sənindir!..

Vəzir yıxılır.

X o s r o v

Əlin var olsun!
Atan əvəzində günahkar olsun.

Xosrov ölür. Şiruyə onun üzünə heyrətlə baxır, xəncər əlindən düşür.

P ə r d ə

## BEŞİNCİ PƏRDƏ

### ONUNCU ŞƏKİL

Bisütun dağı. Dağ yarılmışdır. Sağ tərəfdə qayanın döşündən şəlalə axır. Səhərdir, günəş xeyli qalxmışdır. Fərhad dağın içindən çıxaraq, yüksək bir zirvədə dayanır, alın tərini silir, xoşbəxtlik andıran həyəcanlar keçirir. O, külüngə dayanıb, Günəşə baxır.

F ə r h a d

Gül, ey nazlı səhər... sevdalı səhər!
Dünyanın qəlbinə axsın incilər.
Yenə də qüvvət ver mənə bir zaman,
Ta ki, qalib çıxım bu imtahandan!
Gül, ey nazlı Günəş... ana təbiət!
Nə qədər böyükdür səndəki sənət!
Bu sənət eşqilə yaşayıram mən,
Dünyalar əyilib keçir qəlbimdən...
Gül, ey böyük varlıq, ey təmiz aləm!
Gözəl camalına yaraşmayır qəm.
Dünya binasını qurandan bəri,
Hüsnünə şöhrətdir insan əlləri!
Gül, ey nazlı Günəş, sevdalı səhər!
Başından əsməsin qarlı küləklər!
Gül, ey nazlı Günəş, parlasın cahan!
Yerlərdə qalmasın ölümlə hicran!

Düşüb şəlalədə əl-üzünü yuyur, bir loxma çörək yeyir. Uzaqdan səs gəlir.

A z ə r b a b a

Fərhad... oğul! Fərhad... hardasan Fərhad?

Fərhad qulaq asır.

Cavab ver! Hardasan, hardasan, Fərhad?..

F ə r h a d

Atamın səsidir.

Fərhad cəld dağ başına qalxır, o yan, bu yana boylanır.

A z ə r  b a b a

Fərhad!.. Oğul, Fərhad!

F ə r h a d

Burdayam, burdayam, ata can, gəl, gəl!
Yenə atam gəldi hamıdan əvvəl...
Yenə öz atamdır məni yad edən,
Kim bilir, nə keçir onun qəlbindən?

Azər baba qırx-əlli nəfər azərbaycanlı ilə gəlir.

F ə r h a d

Ah, atam!

A z ə r  b a b a

Can bala!

(*Onlar görüşürlər.*)

Artıq qocaldım,
Günahım nədir ki, mən yalnız qaldım?

F ə r h a d

Gəl, ata, gəl əyləş, azacıq dincəl!

Əyləşirlər, Azər baba alın tərini silərək.

A z ə r   b a b a

Artıq dözməyirəm, evimizə gəl,
Övlad həsrətinə tablamaz ürək,
Gözümlə dünyada odlar görərək,
Səni böyütmüşəm, vəfasız çıxma,
Məni yalqız qoyub, evimi yıxma!

F ə r h a d

Ata, bu dünyada böyüyüm sənsən,
Bir sənin qarşında baş əymişəm mən.
Bil ki, alt-üst olub dönsə də cahan,
Sənin duaların çıxmaz yadımdan!
Səninlə fəxr edir varlığım bütün,
Səni yad etməsəm, anmasam bir gün
Göyün ildırımı başımda sönsün;
Ahım dağlardakı dumana dönsün!

A z ə r   b a b a

(*onun boynuna sarılaraq*)

Sənin pis gününü görməsin gözüm,
Sənsən ağzımdakı ən şirin sözüm.
Dillər dastanısan, qəhrəman oğlum!
Parlasın taleyin hər zaman, oğlum!
Lakin uzaqlaşdın ana yurdundan,
Vətəndən ayrılsa, qocalar insan.
Tez qayıt, sevindir bizim elləri,
Sənsiz pərişandır Muğan çölləri.

F ə r h a d

Nə qədər qürbətdə yaşasam da mən,
Könlüm ayrılarmı ana vətəndən?
Yaxşı yadımdadır o sıx meşələr,
Boynu bükük duran tər bənövşələr,
O axşam... o səhər... o çoban... o səs,
İnsan öz canını tərk edə bilməz!

A z ə r   b a b a

Şirindən nə xəbər, nədir son sözü?

F ə r h a d

Nolacaq... yoldadır onun da gözü,
Bu son imtahanı mən verə bilsəm,
Şirinin qəlbində toy qurar aləm.

A z ə r   b a b a

O sevirmi səni?

F ə r h a d

Sevir, ata can!..
Nə qədər təmizdir ondakı vicdan,
Aldanıb uymadı şöhrətə, ada,
Yaxşı bir ad qoydu o da dünyada.
Xosrovun tacına əyilmədi qız,
Eşqin qarşısında əyildi, yalnız...

A z ə r   b a b a

Ulu Hürmüz...onu salma nəzərdən,
Ayrılmasın taleyimiz səhərdən!
Mən bilirdim, səninkidir o nigar,
Yaşamağa məhəbbətin haqqı var.

F ə r h a d

Təslim ol... təslim ol... Bisütun dağı!
Parlasın eşqimin böyük çırağı!
Təslim ol! Yoldadır canan gözləri,
Qurbanı olduğum o gözəl pəri.
Dünyaya səs salsın bu son imtahan,
Haqqın qüdrətini hiss etsin cahan!

Fərhad dağ arasına girir, külüng səsləri eşidilir, o, qaya parçalarını yuxarı atır. Camaat qorxub ətrafa çəkilir.

A z ə r   b a b a

Ulu Hürmüz... özün qüvvət ver ona!
Gözəl eşqin bu qəhrəman oğluna!
Ulu Hürmüz, özün saxla onu sən
Zamanın dolaşıq hiylələrindən!

Dağ xırıltı ilə parçalanır. Hamıda sevinc və şadlıq həyəcanı görünür.

O z a n

Qurtardı... qurtardı son imtahan da ...
Nə böyük bir qüdrət varmış insanda...

Fərhad dağ başına qalxır, gülümsəyərək, camaata baxır, hamı onu alqışlayır.

T o p a l

Sağ ol! Üzümüzü qaraltmadın sən,
Var ol, min şərbət iç, eşqin əlindən!

O z a n

Sənin göstərdiyin bu böyük hünər
Dastan olacaqdır uzun əsrlər.

T o p a l

Gör nələr yaratdı bir eşqin səsi,
Səninlə fəxr etsin Odlar ölkəsi!

A z ə r   b a b a

(*Fərhadın yanına dırmanır*)

Can bala, doğrudan aləm yaratdın,
Sən öz hünərinlə murada çatdın.

Hələ göylərdəki Günəşə bir bax,
Sənin qüdrətindən ilham alaraq
O da qanadlanır, o da yüksəlir,
Sənə buludlar da salama gəlir.

Fərhadın alnından öpür. Fərhad isə onun əlindən öpür.

T o p a l

O səndən almışdır zövqü, ilhamı,
Sənin kamalına borcludur hamı.
Sən öz qucağında bəslədin onu.
Oğul, Fərhad, deyə səslədin onu.
Var ol, Azər baba, el bilir bunu,
Biz sənə borcluyuq ömür uzunu.

A z ə r   b a b a

İgidlər oynasın, çalsın ozanlar,
Min dastan bağlasın tarix yazanlar.
Dağları tərpətsin bu şadlıq səsi,
Var olsun anamız Odlar ölkəsi!..

Şənlik məclisi düzəlir.

O z a n

Xoşbəxt ol, əzizim, fəxrimiz sənsən,
Sənin şöhrətinlə sevinir vətən.
Mən də bu nemətdən az-çox yemişəm,
Eşit, şərəfinə dastan demişəm.

F ə r h a d

Buyur, Ozan baba!.. Minnətdaram mən,
El sözü səndədir, el aşiqisən.

A z ə r  b a b a

İndi meydan açın bizim Ozana.
Əlilə saz tutub şeir yazana.

Xalq ətrafa çəkilir, Ozana meydan verilir.

O z a n

(*dövrə vurub oxuyur*)

Qoy ellər bağçası laləzar olsun,
Hər keçən günümüz bir bahar olsun!
Hər evin dünyada bir ustadı var,
Bizim də Fərhadın əli var olsun!..

F ə r h a d

Nə qədər doğmadır bu nəğmə, bu saz!
Hər könül nəğməsi sevdasız olmaz.

O, külüngü götürərək, böyük bir həyəcanla dağın üstünə qalxır.
Uzaqdan səs gəlir.

Ş a p u r

Fərhad, qardaş, Fərhad!..

F ə r h a d

Tanışdır bu səs...
Yox... ola bilməz!

Ş a p u r

Fərhad... köməyə gəl!

F ə r h a d

Şapurdur, aman!..
Fəlakət sezilir qışqırığından...

Ş a p u r

Fərhad... mən ölürəm... köməyə gəl bir!
Gəl, dostum... qardaşım!..

F ə r h a d

Yuxu deyildir...
Haydı, gəlin, igidlər!

Fərhad bir dəstə igidlə gedir.

A z ə r  b a b a

Barı, qara bir xəbər
Gəlməyəydi bu anda,
İş qurtaran zamanda.

Hamı heyrətlə baxır. Fərhadla bir neçə igid Şapuru qolları üstündə gətirib, yavaşca yerə qoyurlar.

F ə r h a d

Özündən getmişdir... su gətirin, su!

Fərhad yaylığını çıxarıb, Şapurun alın tərini silir.

Ay aman, bu nədir, necə sirdir bu?

Su gətirilir, Fərhad onun üzünə su çiləyir.

Şapur, gözəl dostum... qardaşım, bir dur!

Səs gəlmir.

Ah onun üzündən matəm oxunur.
Bəlkə də, partlamış ürəyi birdən?..

(*Fərhad onun nəbzini tutur.*)

Yox, yox... ölməmişdir, yanılıram mən,
Şapur... danış, Şapur... nə faciədir?
Söylə bir, qardaşım, bu səhnə nədir?

Səs gəlmir, bir azdan

Ş a p u r

Fərhad... bir az su ver!

F ə r h a d

İç, iç, qardaşım!

Ş a p u r

Gövdəmin üstündə durmayır başım...

F ə r h a d

Şapur, özünə gəl, bir söylə, nə var?
Nədir qəlbindəki bu iztirablar?

Ş a p u r

Fəlakət... fəlakət!

F ə r h a d

Amandır, dillən...
Şirindən bir xəbər.

Ş a p u r

Ah, nə deyim mən!
Nə deyim zamanın bəd rəftarına,
Taleyin sərt əsən pis ruzgarına!..

F ə r h a d

Şapur, sözlərində məna var sənin,
Gizlətmə, qardaşım!

Ş a p u r

Kor olsun fələk!..
Gözümüz dünyada nələr görəcək!
Dilim də gəlməyir, lal olaydım kaş,
Kaş ki, asılaydı ağzımdan bir daş...

A z ə r  b a b a

Özünə toxtaq ver... danış hər nə var,
Onsuz da hökmünü verir ruzigar.

Ş a p u r

İran başdan-başa geyindi qara,
Bir zülmət pəncəsi çökdü dağlara.
Söndü gülər üzlü o günəş, söndü...
Ah... o gözəl varlıq torpağa döndü...

F ə r h a d

Aman!.. Bağrım başı od tutdu, aman!
Tökülür, başıma uçur asiman!...

A z ə r  b a b a

Söylə, Şirinmidir qaralıb sönən?
Onunmu qəlbidir torpağa dönən?

Ş a p u r

Of, insafsız fələk, insafsız əcəl,
Kaş ki, mən öləydim Şirindən əvvəl!
Öldü həsrətinlə, öldü o pəri,
Nə qədər axtardı səni gözləri.
Of... Niyə mən sağam...

Fərhad külüngə dayanaraq, başını aşağı salır, ildırım vurmuş kimi taqətsiz.

A z ə r   b a b a

Ey ulu göylər!..
Nə qədər ağırdır bu qara xəbər,
Siz, ey göy üzündə uçan mələklər,
Ey sirlər yuvası, sonsuz fələklər,
Xeyir-dua verin Şirinə siz də,
Ruhunu gəzdirin əllərinizdə.

F ə r h a d

(*ayılaraq*)

Yalandır, yalandır, bu ola bilməz!
Mələklər ölsə də, o ölə bilməz.
Ölməz məhəbbətin səsi cahanda,
Ona təslim oldu son imtahan da,
Xeyr... inanmayır idrakım buna,
Sevda pərisinin məhv olduğuna.

(*Şapuru yaxalayaraq.*)

And iç sədaqətə... and iç göylərə!

(*Birdən çəkilir.*)

Başıma fırlandı bütün dağ, dərə,
Gör nələr göstərdi bəxtin cilvəsi,
Elə bil, dayandı qəlbimin səsi,
Of... bəlkə röyadır bu qara xəbər,
Bəlkə də, xoşbəxtdir sevib ölənlər...

Ş a p u r

(*ağlaya-ağlaya*)

Nə mərhəmət vardı onun səsində,
Gör bir nələr dedi son nəfəsində:
Dedi ki, Fərhada get salam apar,
De ki, ayrı saldı bizi ruzigar.
Ah, dilim qurusun...

F ə r h a d

Dayan, ey külək!..
Ağlama, ey tufan, çaxma, ey şimşək!
Alışdı mum kimi, söndü varlığım,
Söndü hər əməlim, bəxtiyarlığım.
Ey Günəş... üzündən o pərdəni at!
Matəmə dönməsin qurduğun büsat!
Of... beynim... ürəyim! çəkil, ey bulut,
Ah, nələr danışır bu sonsuz sükut...
Əlvida, əlvida, böyük təbiət!
Əlvida, qəlbimdə ölən məhəbbət!..

O, külüngünü öz başına vurub yıxılır.

A z ə r b a b a

Ah, oğul!.. Belimi sındıran oğul!..

Hamı Fərhadın cənazəsi qarşısında diz çökür. Arxadan at ayaqlarının səsi gəlir, Şirinlə Fitnə atdan düşərək gəlirlər. Şapur onları görən kimi qaçmaq istəyir. Fitnə oxlu kamanını ona tərəf tutaraq.

F i t n ə

Dayan! Xain!.. Qurtarmazsan oxumdan.

A z ə r b a b a

Gör nələr törədir aləmdə insan?..
Xəyanət durduqca yenə dünyada
Bütün yer üzünü verəcək bada.

Xəyanət izləyir bizi kölgə tək.
Bəzən mələk kimi görünməyərək
Bizim qəlbimizdə o yuva salır,
Ölkələr dağılıb xaraba qalır.
Öldür, ulu Hürmüz, sən bu afəti,
Götür yer üzündən hər xəyanəti!

Şirin

Bir oyan, qədrini bilmədiyim dost!
Üzünə bir dəfə gülmədiyim dost!
Bizi ayrı saldı vəfasız zaman,
Qoy öpüm son dəfə dodaqlarından.
Nə qədər təmizdir, şirindir busən;
Nə olar bir kərə "Şirinim" desən.
Fərhad! Yalvarıram bir ayağa dur,
Göylərin üzündə matəm oxunur...
Bir oyan, intiqam alaq cahandan,
İkimiz bir çıxaq son imtahandan.
Ah,o danışmayır, o dinməyir, ah!..
De, nəydi günahım, de, nəydi, Allah!
Göylər qucağında gəzdirsin onu,
Müqəddəs bir eşqin sadiq oğlunu!

(*Xəncərlə özünü öldürür.*)

Azər baba

Can, oğlum... can, qızım, qulaq asın bir!
İndi söz mənimdir... söz tarixindir!
Bada verdinizsə eşqin kamını –
Bu qoca vaxtımda nə qədər sağam,
Həyat düşmənindən mən alacağam
Ölən məhəbbətin intiqamını...

Fərhadla Şirinin cənazəsini götürüb aparırlar.

Pərdə

SON

# İNSAN

*9 şəkildə mənzum dram*

İŞTİRAK EDƏNLƏR

| | |
|---|---|
| Böyük Şahbaz | – 30 yaşlı gənc filosof |
| Kiçik Şahbaz | – onun oğlu |
| Səhər | – Böyük Şahbazın arvadı, bəstəkar |
| Cəlal | – şair |
| İslam | – zabit |
| Eldar | – kəndli |
| Valentin | – memar |
| Güloğlan | – azsavadlı bir şəhər gənci |
| Mariya | – Valentinin anası |
| Nataşa | – Valentinin arvadı |
| Tatyana | – Valentinin qızı |
| Dildar | – hərbi doktor |
| Qoca hindli | |
| Fon Hols | – feldmarşal |
| Amaliya | – Fon Holsun arvadı |
| Albert | – marşal, alman faşist propaqandası ministri |
| General Hans | |

Zabitlər, əsgərlər, müxtəlif millətlərin nümayəndələri, qızlar, oğlanlar.

## BİRİNCİ ŞƏKİL

Əhvalat 30 il sonra* vaqe olur. Qara dəniz sahilində gözəl bir şəhər salınmışdır ki, adına “Qardaşlıq şəhəri” deyilir. Ön tərəfdə uca sərvlər, çiçəklik və güllük içində bir gəzinti və istirahət parkı. Orada “Qardaş məzarı” deyilən abidəlik nəzəri cəlb edir. Ortadakı bir heykəl bir filosof və qəhrəman surətini ifadə edir. Zaman və məkan böyük bir səadət andırır. Səhər yavaş-yavaş açılır. Dənizin lərzəsi eşidilir. Təbiət o qədər şairanə və müqəddəsdir ki, insan heyran qalır. Daş, torpaq, ağaclar, quşların səsi, səyyar buludlar romantika ilə qanadlanmışdır.

___________

* Böyük vətən müharibəsindən sonra nəzərdə tutulur (*Red.*).

(Mən bu remarkanı təsadüfi yazmayıram. Səhnəmizin təbiət səhnələri dil açıb danışmalıdır. Bu səhnələrdə təbiətin məna ahəngi, onun qüdsiyyəti, xeyirxah və nəcib varlığı ifadə olunmalıdır. Təbiət insan kamalının, insan əməllərinin təcəssümü olmalı, bəzən qaşlarını loğman kimi çatıb düşüncəli, bəzən də iztirablar, həyəcanlar içində çırpınan bir ürək kimi təlatümlər, fırtınalar keçirməlidir. Səhnəmizin bu təbiət gözəlliyinin fəlsəfəsi uğrunda Nüsrət* öz yaradıcılığını başa çatdırmalıdır, çünki onun təbiət zövqləri başqa rəssamlarımıza görə daha gözəldir).

Səhər gəzintisinə çıxanlar təsvir olunan abidəni seyr edir, bəziləri onun yazılarını oxuyur, müxtəlif qocalar, gənclər, müxtəlif qiyafətli millətlər görünür; hindlilər, çinlilər, ərəblər də vardır.

Get-gedə çoxalan izdiham abidənin qarşısına toplaşır.

Gənclərin və qızların şərqi səsi eşidilir.

Qara dəniz! Qara dəniz!
Nə gümrahdır dalğaların!
Bizim xoşbəxt vətənimiz
Timsalıdır ilk baharın.
Ana vətən! Ana vətən!
Günəş doğur gülüşündən!

Azad torpaq, azad vətən!
Nə müqəddəs adın vardır!
Qanlı döyüş günlərindən
Bu səadət yadigardır.
Ana vətən! Ana vətən!
Günəş doğur gülüşündən!

Gəzin, quşlar, çəmənzarı,
Salam deyin dağa-daşa;
Qoy dünyanın ilk baharı
Al geyinsin başdan-başa.
Ana vətən! Ana vətən!
Günəş doğur gülüşündən!

Şərqini dinləyənlər böyük bir həzz alır, üzlərdə təbəssüm
və iftixar hissləri oynayır.

---

* Respublikanın xalq artisti, rəssam Nüsrət Fətullayev nəzərdə tutulur (*Red.*).

V a l e n t i n

(*Hamı nəzərini ona dikmişdir.*)

Sizin gördüyünüz bu gözəl şəhər
“Qardaşlıq şəhəri” adlandırılmış,
Bu əlvan çiçəkli gözəl sahillər
Min bahar görmüşdür, min boranlı qış...

Yaxşı yadımdadır, 30 il qabaq
Burda bir bataqlıq çıxırdı dizə,
Gecənin birində silahlanaraq
Alman ordusuyla gəldik üz-üzə.

Yaman zülmət idi... Lakin ürəklər
Yanıb məşəl kimi, işıq salırdı.
Baş-başa gəldikcə qanlı süngülər
Hər addım başında meyit qalırdı.

Bir matəm örtüsü geyirdi, bəzən
Göyün üzündəki o qara pərdə...
Qulaq tutulurdu topun səsindən,
Hücuma keçmişdi təyyarələr də.

(*O, bir az öskürür. Tatyana ona su verir.*)

İndi o zamandan 30 il keçir,
Qayıtmaz bir daha o yaman illər.
Dünyadan cürbəcür nəsillər köçür.
Dəyişir daima aylar, fəsillər...

İndi siz dünyanın hər tərəfindən
Bizim bu şəhərə xoş gəlmişsiniz,
Qovuşsun yer üzü, bir olsun vətən,
Bu amal uğrunda qan tökmüşük biz.

(*Abidəni göstərərək*)

Mənim yaratdığım bu abidəsə
O qanlı günlərdən bir yadigardır;
Yüz dildə, min dildə dastan deyilsə,
Bu qardaş qəbrinin tarixi vardır!

Q o c a   h i n d l i

Əfv edin, əfv edin, bu şanlı məzar
Qoynunda nə qədər millət adı var?

V a l e n t i n

Çoxdur... rus... Ukrayna... özbək və tatar
Erməni, belorus...azərbaycanlı...
Gürcülər... türkmənlər... kürdlər, kazaklar –
Hamsının məsləki, məqsədi şanlı ,
Hamsı bir məhəbbət yolçularıydı,
Hamsının öz eşqi, qəlbi varıydı...

T a t y a n a

Atacan, burdakı bütün şəhidlər
Sizlə tanış idi?

V a l e n t i n

Filosof, adı da...

Q o c a   h i n d l i

Çox qəribədir!
Bəlkə bilirsiniz... ünvanı nədir?

V a l e n t i n

Necə ki bilirəm?.. Filosof Şahbaz,
Onunla bir yerdə iki qış, üç yaz

Yoldaş olmuşuq ki... doğrudan, əfsus,
O gənc filosofda dahiyə məxsus
Bir kamal, bir idrak şəfəqi vardı,
Lakin səhər kimi təzə parlardı.

Q o c a  h i n d l i

Eşq olsun bu şəhid qəhrəmanlara!
Mən alqış deyirəm bu gün onlara!

Sol tərəfdən qoca Cəlal, Səhər və gənc Şahbaz gəlirlər.

C ə l a l

Gəl, gəl, Səhər bacı, gəl, doyunca bax,
O yerdir... özüdür... o qanlı torpaq...

V a l e n t i n

Yol verin, deyəsən, qonaqlar gəlir.

C ə l a l

Sabahınız xeyir!

V a l e n t i n

Xoş gəlmişsiniz!
Yaxşı, hardan belə?

C ə l a l

Azərbaycandan.

V a l e n t i n

Səsi tanış gəlir...

Cəlal ona diqqətlə baxır. Pauza

C ə l a l

Valentin! Valentin!..

V a l e n t i n

Ah, dostum, Cəlal!..
Yenə birləşdirdi bizi istiqbal!

Qocalar qucaqlaşıb öpüşür.

C ə l a l

Valentin, nə qədər qocalsan da sən,
Gizlənə bilməzsən şair gözündən...

V a l e n t i n

Çox gözəl qalmışdır hələ hafizən,
Əşi, lap qocalıb əldən düşmüsən.

C ə l a l

Cənub müqəssirdir... Bir də, şairlər
Nə axşam dincəlir, nə də ki səhər.
Odur ki, çox vaxtsız qocalır onlar.

V a l e n t i n

Yaxşı, yaşımız ki elə bir olar...
Qaydadır... qaydadır... şair tayfası
Özündən deməsə dayana bilməz.

(*Gülürlər.*)

Yaxşı, bunlar kimdir?

C ə l a l

Bəli? Bu, Səhər!
Şahbaz, yadındadır? Onun yoldaşı.

V a l e n t i n

Aha... tanış olaq... Nə qədər şadam!
Bu saat, bir azca lap sizdən qabaq,
Filosof dostumu xatırlayaraq
Burda danışırdım...

S ə h ə r

Çox gözəl... şadam...
Bəli... Çox çətindir unutmaq onu,
Yəqin bilirsiniz kim olduğunu.
30 il Şahbazsız sürdüyüm ömür,
Gözümə mənasız röya görünür...
Bu gün də ağırdır hicran cəfası...

V a l e n t i n

Bilirəm... qoca Şərq... qadın vəfası...
Lakin o ölməmiş, hələ də sağdır,
Düşünən beyinlər yaşayacaqdır!

S ə h ə r

Bəli, yaşayacaq... o heç vaxt sönməz...
Müqəddəs əməllər torpağa dönməz.
Bu da ki oğludur... adı da Şahbaz.
Siz də tanış olun!

Əl verirlər.

V a l e n t i n

Oxşayır bir az.
Onun da gözləri belə qaraydı.
Tatyana! Tatyana!

Tatyana yüyürüb gəlir.

Bu şeytancıq da
Mənim öz qızımdır... tanış olun siz,
Ancaq... ayrılmasın qoy əlləriniz...

Tanış olurlar.

V a l e n t i n

Cəlal, sən də bir aç söz xəzinəni.

C ə l a l

Bəs necə, qocalmış zənn etdin məni?..

(*O, çeşməyini gözünə taxaraq, cibindən bir kitabça çıxarıb, abidəyə hörmətlə baxır, şeir oxuyur.*)

Otuz il, otuz il yaşadıq sənsiz!
Bu dost həsrətilə çox odlandım tək.
Bəzən qayıq kimi üzüb yelkənsiz
Daşdan-daşa dəydi sinəmdə ürək.
Otuz il, otuz il sən bizdən uzaq
Bəlkə ziynət oldun bu məzarlığa.
Lakin əməllərin alovlanaraq
Günəş tək boy atdı bütün varlığa.
Budur bax: nə zülmət, nə aclıq, nə qan,
Nə də göz yaşı var bizim vətəndə.
Nur yağır insanın baxışlarından,
Bu azad günləri görürsən sən də...
Müqəddəs bir əməl payimal olmaz
Məzarı gül açmış bir laləzarda.
Dünya cənnət olsa, dərd unudulmaz,
Of... səndən ayrıldıq bir ilk baharda ...

Hamı əl çalır, ortalığı bir həyəcan qaplayır.

V a l e n t i n

Yalnız şerin dili belə danışar,
Onun hikmətində Allah gücü var!

Səhər ara-sıra gözlərini yaylıqla silir... Valentin Cəlalın əllərini bərk-bərk sıxaraq.

V a l e n t i n

Yenə haman qanad... Haman təravət...
Yox, dostum, ürəyin qocalmamışdır!

C ə l a l

Belədir... yerlərdən doğan bir sənət
Göylərə xəyalsız ucalmamışdır!

T a t y a n a

Şeir bir nəğmədir, gözəllik çəmən.

C ə l a l

Yaxşı, Səhər bacı! Sənin hədiyyən?

S ə h ə r

(*Şahbaza*)

Aç, oğul, aç mənim çamadanımı,
Ordakı notanı gətir, bala can!

Şahbaz notanı gətirir. Səhər onu simli orkestrə təqdim edərək:

Çalın, balalarım! Hicran nəğməsi!
Pərişan olsa da qəlbimin səsi,
Hicran günlərindən bir yadigardır,
Bunda unudulmaz bir nalə vardır!

Musiqi dəstəsi notayla tanış olur, alətlər müxtəlif səslər çıxarıb köklənilir.
Şahbaz və Tatyana bir tərəfdə söhbət edirlər.

Ş a h b a z

(*zarafatla*)

Tatyana Larina!

T a t y a n a

(*təbəssümlə*)

Yox, Sergeyevna!

Ş a h b a z

Lakin... baxışınız bənzəyir ona
Puşkin qələminin qız yavrusuna...

T a t y a n a

Bəlkə də...

Ş a h b a z

Bəlkə yox... doğrudan da siz
O ilahi qıza bənzəyirsiniz!

T a t y a n a

Bu, komplimentdir...

Ş a h b a z

Yox... Həqiqətdir!
Yaxşı... Qafqaza heç getməmişsiniz?

T a t y a n a

Çox təəssüf ki, yox...

Ş a h b a z

Buyurun, gedək!
Qonağımız olun, gedib seyr edək.
Hamınız gedək!
Bu saat Qafqazda hər gül, hər çiçək
Dil açıb danışır... Buyurun, dostlar!
Göy gölə gedərik, pis olmaz bahar.

Hicran nəğməsi ifa olunur. Hamının diqqəti cəlb olunur.

C ə l a l

Yadında varmıdır?

V a l e n t i n

Lap yaxşı... bəli!
Şahbaz çox sevərdi bu xoş nəğməni...

C ə l a l

Bu gün də, bu gün də yandırır məni
Otuz il qabaqkı o xatirələr.
O kədərli axşam... o qəmli səhər...
Valentin, nə qədər dəyişmiş insan!

V a l e n t i n

Gəmimiz yol açdı qan dəryasından...

T a t y a n a

Şahbaz, dinləyirsən?.. Ötdükcə simlər,
Elə bil yas tutur, ağlayır səhər!..

S ə h ə r

Ağlayan o deyil... mənəm... qızım, mən,
Bu bir xatirədir keçən günlərdən...
Qoy bütün kainat eşitsin bunu,
Bir qəlbin min oxla vurulduğunu.
Qoy "Hicran nəğməsi" gəzsin dünyanı,
Nəsillər dinləsin bu simfoniyanı...
O bir dastan kimi varaqlanaraq
Yüz illik bir ömrü yenidən açsın.
Hər qəmli ürəkdə yansın bir çıraq,
Hər ümid günəşi bir şəfəq saçsın!..

Musiqi get-gedə həyəcanlanır, bütün diqqətlər, sifətlər böyük bir məftunluq içində; yavaş-yavaş pərdə.

P ə r d ə

## İKİNCİ ŞƏKİL

Böyük Şahbazın otağı. Sol tərəfdə piano. Çoxlu kitablar görünür. Əhvalat 1-ci ildə olur.

Ş a h b a z

Nə deyir, nə deyir ağlın qüdrəti?
Qalib gələcəkmi cahanda kamal?
Sən ey mənaların saf ülviyyəti!
Nədir düşüncəmi yaxan bu sual?
Qalib gələcəkmi cahanda kamal?

Toplar, təyyarələr gəlmiş baş-başa,
Al qana qərq olmuş bütün kainat.
Bu ki həqiqətdir... deyil tamaşa
Bəlkə də məhv olur müqəddəs həyat?
Atını dördnala sürdükcə zaval,
Qalib gələcəkmi cahanda kamal?

Dağılın başımdan qara şübhələr,
İdraka sığmayır bu düşüncələr!
Sən ey başladığım dumanlı əsər,
Söylə, nələr deyir bizə istiqbal?
Qalib gələcəkmi cahanda kamal?

Səhər o biri otaqdan Şahbaz üçün çay gətirir. O qayət məhzun və dalğındır. Şahbaz ona diqqət yetirir, sonra asta, lakin riqqətli bir səslə.

Ş a h b a z

De, niyə dalğınsan, dilbər Səhərim?

Səhər divan üstə əyləşərək, başını əlləri arasına alır, fikrə gedir, sükut...

Ş a h b a z

(ətrafa)

Bir ona bağlıdır, ah, əməllərim,
Bir odur cahanda məni dərk edən,
Bir onun eşqilə bəxtiyaram mən.
Elə ki, aləmdən əlim üzülür,
Salama gəldikcə eşqin baharı,
Qəlbimə təzədən yüz səhər gülür,
Xəyalım fəth edir asimanları...
Başımdan dağılır qəm də, möhnət də,
Könlümdə rəqs edir bütün xilqət də!...

Şahbaz Səhərin yanına gəlir, onun uzun qara hörüyünü oxşayaraq mehriban bir səslə:

Ş a h b a z

Səhər! Səni dalğın görəndə bir an
Üstümə tökülür bütün asiman...
De görək nə vardır, nə olmuş ki, sən
Belə birtəhərsən... çox fikirlisən?..

S ə h ə r

Bir elə şey yoxdur...

Ş a h b a z

Yenə, de görək.
Daima şadlıqla gülən bir mələk
Neçin bulud kimi birdən qaralmış?
Nədir üzündəki bu boranlı qış?

S ə h ə r

Heç, Şahbaz, çox böyük müharibədir...

Ş a h b a z

Bunu söyləməkdən məqsədin nədir?

S ə h ə r

Sənsən... düşündüyüm sənsən, əzizim!
Başqa nə dərdimiz olacaq bizim?
Onu deyirəm ki, sən də çağrılsan,
Günümüz nə olar?

Ş a h b a z

Belədir insan...
O öz taleyini düşünür öncə.

S ə h ə r

Nolsun... bu, cinayət deyildir, məncə.
Şəxsi taleyini duymayan bir kəs
Başqa bir tale də yarada bilməz.
Bir gücdə olsa da bütün insanlar,
Hər kəsin öz eşqi, öz arzusu var...

Ş a h b a z

Dünya da qurulur bu arzulardan...
Ümman da yaranır bir çox sulardan...
Odur ki, daima zaman və məkan
Sıxır məngənə tək ürəyimizi,
Yoxdur təbiətdə sonsuz azadlıq
Ruzgar neçə səmtə aparır bizi.
Nə mütləq qüssə var, nə mütləq şadlıq.
Sən nə fikirdəsən, belədir, Səhər?

S ə h ə r

Həqiqət olsa da bu fəlsəfələr,
Qəlbimdə elə bir döyüntü var ki,
Sinəmin qəfəsi o qədər dar ki,
Qüssə xəncər kimi bağrımı dəlir,
Gözümə tilsimli bir zülmət gəlir!

Ş a h b a z

O zülmət üstünə coşub gələndə,
Bir məşəl tutaram qəlbimi mən də...

S ə h ə r

O vaxt... sən olmasan?

Ş a h b a z

(*pianonu göstərərək*)

Odur... o sənət...
Ağlamaz sənətlə gülən məhəbbət
Şirmayı dillərə öz meylini sal,
Göylərə uçursun qoy səni xəyal!
Onun əl çatmayan bir dünyası var,
Dərdin dərmanını xəyalda axtar...

S ə h ə r

Lap idealistsən...

Ş a h b a z

Xoşdur ideal!
Onsuz nə hal vardır, nə də istiqbal.

S ə h ə r

Nə qədər sevsək də idealları,
Məncə, həyatdır ömrün baharı...
Bəzən bağçadakı bir cocuq səsi,
Ya bir bəstəkarın ürək nəğməsi
Ya mənalı bir söz, məsum bir baxış,
Qışdakı qar tarı, yazdakı yağış,
Yaşıl yamacdakı bir ayaq izi,
Qəmli bir insanın pərişan üzü,
Bir gülüş... bir bayram... ya da ki, bir yas.
Bir insan vüqarı, bir qəşəng libas
Yerdə olmasaydı insan sönərdi,
Gözəl xəyallar da heçə dönərdi.

Ş a h b a z

Odur da... Odur ki, sən bəstəkarsan...
Öz qəlbinlə yaşa nə qədər varsan!
Bir mələk olsa da hüsn-camalın,
Mələkdən ucadır sənin kamalın!

(*Böyük bir ehtirasla Səhəri öpür.*)

Haqlısan, haqlısan, doğrudan da sən,
Bütün xəyallardan şirindir busən!

S ə h ə r

Hörmətin çox olsun, filosof yoldaş!

Ş a h b a z

Bəli! Göylərdəki vüqarlı bir baş
Bir sənin eşqinlə yerlərə endi,
Eşq ilə torpaq da, göy də bəzəndi...

Zəng çalınır, Səhər qapını açır. İslam və Cəlal daxil olur.

İ s l a m

Xoş gördük, ağalar!

C ə l a l

Xoş gördük, Şahbaz!

Ş a h b a z

Buyurun, buyurun, siz gələsiniz!

İslam fit çala-çala, əlləri cibində gəzinir.

Ş a h b a z

Cəlal? Nə var, nə yox?

C ə l a l

Kefsizəm bir az...
Gəldik ki, görüşək.

Ş a h b a z

Necə görüşək?

C ə l a l

Bizi uzaqlara aparır külək...

Ş a h b a z

Nə uzaq? Nə külək? Nə olub, Cəlal?

İ s l a m

Bəli, biz gedirik, sən salamat qal!
Başıyın altına yastıq qoy sən də,
Fəlsəfə qırıldat yeri gələndə...
Bizsə cəbhələrə... bəli, vuruşa!

S ə h ə r

Hər vuruş yol açır bir qurtuluşa...

Ş a h b a z

Fəzilət məlum şüd...

İ s l a m

Gedirik, bəli!

Ş a h b a z

Dəhşətlər törədir insanın əli...
Dost dostdan ayrılır, qardaş qardaşdan...
Həyat cəhənnəmdir binadan-başdan...

İ s l a m

Sən öz işində ol!
Fəlsəfəni yaz!
Səndən tüfəng tutub qan tökən olmaz...

Ş a h b a z

Lakin unutma ki, vətəndaşam mən...

İ s l a m

Fəqət, filosofsan acizliyindən...
Nə elm? Nə kitab? Müharibədir,
Əflatun olsan da mənası nədir?
İndi qılınc yazır həqiqətləri...
Heç kəs eşitməyir boş söhbətləri...
Mən ölüm, belədir? Mən ölüm, bir vur!

Hamı gülür.

S ə h ə r

Qılınc yarasını insan unudur.
Fəqət, söz yarası...

İ s l a m

Köhnə məsəldir...
Dünyanı quran da, yıxan da əldir.

C ə l a l

Odur da... On beş il oxudun, ancaq
Nə elm qazandın, nə də qanacaq...

İ s l a m

Sən öl yox! Hamıdan ağıllıyam mən,
Gündə bir şey yazır hər gəlib-gedən.
Nə başımız qaldı, nə də beynimiz,
Bir də, söz çuvalı deyilik ki, biz!

Səhər stolu bəzəyir, yemək-içmək qoyur.

Ş a h b a z

Cəlal, üzündəki fırtına nədir?

C ə l a l

Həyat doğrudan da çox qəribədir,
Nə əvvəli vardır, nə də ki, sonu,
Hələ kəşf etməmiş dahilər onu!

İ s l a m

(*kinayəli*)

Bəs şairlər necə?..

C ə l a l

(*kinayəli*)

Bu barədə sən
Bizim hamımızdan daha mərufsan.

İ s l a m

Əlbəttə... əlbəttə...
Şeir də, söz də
Sənin söz qoşduğun o alagöz də...
Saçları sünbül,
Dodaqları gül...
O ağzı fincan,
Dişləri mərcan,
O zülfü şahmar,
Dili zəhrimar...
Qurbanı olduğum o növrəstə qız,
Ha... ha... ha!.. Doğrudan da ağıllısınız!
Adam da eşq üçün odlara yanar?

C ə l a l

Yalandır? Hər qəlbin öz sevdası var!

İ s l a m

Sən öl yox! Nə sevda? Dəliyəm məgər?
Eşqə düçar olur sevilməyənlər...
Mənə nə, şəhərin bütün qızları
Sino gedirlər ki, məni görəndə...

S ə h ə r

Yaxına buyurun, dəmlənin barı!

(*Hamı masa ətrafına əyləşir.*)

Ş a h b a z

Sən tək düşünürdüm bir zaman mən də.
Lakin məhəbbətin hökmü yamandır.
O qəlbi titrədən bir xoş kamandır.
Dil açıb ötdükcə onun simləri,
Hüsnünü açdıqca o gözəl pəri,
Sanki nur tökülür baxışlarından.
Bütün varlığını unudur insan.

İ s l a m

Cəlal yaxşı bilər... kişi şairdir!
Qanadlı sözlər də ona dairdir...
Mənsə yavaş-yavaş...

(*Badələri doldurur.*)

C ə l a l

Hə... Doldur görək!
İçək, bir damcı da qalmasın gərək.
Bəlkə görüşmədik bir də dünyada...

İ s l a m

Sən öl yox! Düşsəm də alova, oda,
Yarıb çıxacağam şiri-nər kimi!

S ə h ə r

Qabaqca özünü öyənlər kimi?

C ə l a l

Sən öl yox! Məndə bir etiqad var ki,
Elə bir iradə, bir inad var ki...

C ə l a l

Di yaxşı, iç görək! Cəbhə göstərər!

(*Badələr vurulur.*)

Dostlar! Çox ağırdır müharibələr,
Bəli... doğrudan da mənzil uzaqdır...
Kim bilir, kim ölüb, kim qalacaqdır.
Dəyişir fəsillər, dəyişir ruzgar,
Hər günün öz hökmü, öz yazısı var...

İ s l a m

Eh... Bu şairlər də ağürək olur.
Yenə hünərlisi bunun tək olur.

Ş a h b a z

Bir dayan!

İ s l a m

Mən ölüm, bir başına çək!
Elə bil ilk güllə buna dəyəcək...

Hamı içir.

Ş a h b a z

Bağışla, sözünə davam et, Cəlal!

C ə l a l

Bəli... qaranlıqdır bu gün istiqbal,
Göyləri çulğayan o qara bulud
Bir ölüm gətirir, bir sonsuz sükut...

(*İslama işarə ilə*)

Yalnız ağılsızlar dərk etməz bunu,
Düşünməz ölümün nə olduğunu.
Həyat bir oyuncaq deyildir, məncə...
Dünyanı titrədir bir qanlı pəncə,
Bir qara ehtiras... bir sönük vicdan...
Ölüm yox, həyatçün yaranmış insan.
İndi başa düşdün?

İ s l a m

Sən öl yox...

S ə h ə r

Cəlal!
Ölümdən şeirlə sən intiqam al!
Od-alov içində yansa da həyat
Sən odlar içində bir dastan yarat!
Öylə bir dastan ki, keçdikcə illər
Oxuyub yad etsin bizi nəsillər...

İ s l a m

(*deklamasiya deyənləri yamsılayaraq*)

Qorxma, şair qardaş, nə qədər sağam
Sənin komandanın mən olacağam!
Hünər göstərdikcə cəbhələrdə mən
Sən də lələşini tərifləyərsən!..

İndi badələri qaldırın, dostlar,
Hələlik şadlığa möhlətimiz var!

Hamı içir, Şahbazın iki-üç yaşlı oğlu qapını açıb içəri girir, Cəlal onu qucağına alır.

Cəlal

Balası, balası! Kimin oğlusan?

(*Uşaq barmağı ilə Şahbazı göstərir.*)

Bəs anan? Balası, hardadır anan?

Uşaq əli ilə anasını göstərir, onun qucağına tərəf meyl edir.

Cəlal

Görürsən? Meylini anaya salır.

İslam

Həm də... Quru zəhmət ataya qalır.

Səhər

Sən ki atalıqdan hələ uzaqsan...

İslam

(*kinayəli*)

Hələ verməmişdir hökmünü zaman...

Cəlal

Qoy xoşbəxt yaşasın övladlarımız!
Analar yas tutub geyməsin qara,
O zülmət çökməsin bizim dağlara,
Səadət yaranmış haqqımız, yalnız!

Ş a h b a z

Bu gözəl sağlıqdır! Sən də iç, Səhər,
Qara gün görməsin bizim nəsillər.
Bil ki, bu arzuyla, qəlb ilə mən də
Ölməyə hazıram ana vətəndə...

İ s l a m

Mənim nə evim var... nə də ki, nəslim,
Bir yuva içində keçir hər fəslim...

C ə l a l

İndi kefinə bax... gedirsən... ancaq
Yurdunda qara bir pişik qalacaq.
Belədir?

İ s l a m

(*mütəəssir*)

O düzdür, belədir, bəli...

(*Uşağı qucağına alır.*)

Doğrudan, adamın bir oğlu ola,
Öləndən sonra da yurdunda qala.

S ə h ə r

Yaxşı, İslam qardaş, bir de görək sən,
Bu nə tərslikdir ki, evlənməyirsən?

İ s l a m

Neyləyim qızların hamsı dul qalsın,
Hamsının canın əzrayıl alsın!

S ə h ə r

Bu niyə?

İ s l a m

Qoydular, qoydular məgər?
Bir məni yüz yerə tutub çəkdilər...
Gözümü açmağa qoydular ki, bir?..

C ə l a l

Sevib-sevilmək də asan deyildir!
Yaxşı, Səhər bacı, bir şey çal görək!
Görək alnımıza nə yazır fələk.

S ə h ə r

Buyurun, nə çalım?

İ s l a m

Bir nazbarı çal...

S ə h ə r

Sizi gözləyirəm, buyurun, Cəlal!

C ə l a l

Vallah, özün bilən daha yaxşıdır.

Səhər həzin və mənalı bir hava çalır; bir az sonra Cəlal musiqi ilə ahəngdar bir səslə şeir oxuyur.

C ə l a l

Binələri çadır-çadır,
Çox gəzmişəm özüm, dağlar!
Qüdrətini sizdən aldı
Mənim sazım, sözüm, dağlar!

Maral gəzər asta-asta,
Enib gələr çeşmə üstə.
Gözüm yolda, könlüm səsdə,
Həsrətinə dözüm, dağlar!

Qayaları baş-başadır,
Güneyləri tamaşadır,
Gödək ömrü çox yaşadır
Canım dağlar, gözüm dağlar!

Bir qonağam bu dünyada,
Bir gün ömrüm gedər bada.
Cəlalı da salar yada
Düz ilqarlı bizim dağlar...

İslam

Sağ ol, Səhər bacı, daha biz gedək.

Cəlal

Şahbaz, salamat qal!

Şahbaz

Yaxşı yol, Cəlal!

Öpüşürlər.

Səhər

Yaxşı yol, sağ gedib, salamat gəlin!
Gedin, qılıncınız zəfərlər çalsın.

İslam

Neyləyim, qızların hamsı dul qalsın.
Doğrudan adamın bir oğlu ola...

C ə l a l

De salamat qalın!

Ş a h b a z

Uğurlar ola!..

Gedirlər.

Ş a h b a z

Bəli... İki dost da... belə gedirlər.
Görürsən nə yaman dövrandır, Səhər?

S ə h ə r

Cəlal ağıllıdır, İslamsa qoçaq.

Ş a h b a z

Eh... topun gülləsi kimə baxacaq?
İndi hünər vaxtı deyildir, Səhər!
İndi meydan açır toplar, tüfənglər.
Hitler dediyimiz o məlun iblis
Bütün Avropanın top-tüfəngini
Öz əlinə yığıb... belədir?

S ə h ə r

Bəs biz?

Ş a h b a z

Bizim təyyarəmiz, topumuz azdır...
Həqiqət güvənir yalnız qüvvətə.
Ümidim çox azdır qalibiyyətə...

S ə h ə r

Bəs insan qüvvəti? Bizdə ki, çoxdur?

Ş a h b a z

Onun o qədər də mənası yoxdur...
Qərəz ki... mən gedim, dincəlim bir az...

(*Yataq otağına keçir.*)

S ə h ə r

Hələ inanmayır insana Şahbaz.
Xeyr... bambaşqa fikirdəyəm mən,
İradə möhkəmdir topdan, tüfəngdən.

Zəng çalınır. Səhər qapını açır, poçtalyon ona çağırış vərəqəsi verir. Səhər vərəqəni diqqətlə oxuyur, başını iki əli ilə tutaraq divana əyləşir.
Pauza

S ə h ə r

Demək ki... mən yalnız qalıram, aman!...
O sağ çıxa bilməz fırtınalardan...
Of... tale! Nə yaman dövranın varmış,
Alim də... alim də əsgər olarmış!
Bəli, indən belə yalnız qal, Səhər!
Keçdi yaşadığın o xoşbəxt günlər...
Keçdi o günlər ki, min bir niyazla
Yatıb, oyanardım söhbətlə... sazla...
Aşsın dərya kimi başımdan qəmim,
Bir heçliyə gedir könül həmdəmim.
Mən artıq... yalnızam... yalnızam... yalnız!..

Gözlərini əli ilə tutub astaca ağlayır. Uşaq sol qapıdan girib anasının yanına gəlir; Səhər onu qucağına alır, təzə görür kimi xeyli baxır, sonra bağrına basaraq üzündən bərk-bərk öpür, pərdə yavaş-yavaş düşür.

P ə r d ə

## ÜÇÜNCÜ ŞƏKİL

Kiyev Elmlər Akademiyasının gözəl tarixi abidələr, heykəllər, bədii təsvir əsərləri ilə bəzənmiş salonu. Alman ordu komandanlığının qərargahı. Amaliya ayna qabağında özünə bəzək verir; o, alman üslubunda geyinir. Qoca Mariya təmizlik və səliqə aparır.

M a r i y a

Xanım, bu gün yenə ziyafətmi var?

A m a l i y a

Necə, ziyafətdən yorulmaq olar?

M a r i y a

Elə, soruşuram...

A m a l i y a

Bir də soruşsan<br>
Tutub buracağam qulaqlarını!

M a r i y a

Mən ki, çox qocayam...

A m a l i y a

Hə... bilirəm, sən<br>
Dildən diri qalıb, əldən düşmüsən...

M a r i y a

(*xaç çəkərək*)

Vallah... yox... gecə də yatmayıram heç...<br>
Yenə qocalıqdır... suçum varsa, keç!

A m a l i y a

Gəl, gəl, bir təmizlə tuflilərimi.

(*O əyləşir, Mariya onun ayaqlarını silir. Amaliya ara-sıra güzgüyə boylanaraq*)

Doğrudan geyimdir qadına ziynət.
Zərif yaratmışdır bizi təbiət...
Başda olmasa da ağıldan əsər,
Ət-qan əsiridir bütün kişilər.

(*Öz-özünə gülür.*)

M a r i y a

Xanım, ağlınıza nə olub, şükür?

A m a l i y a

Ağıl çox olanda sifət bürüşür...
Qadının üzüsə hər zaman, gərək
Parlasın gül kimi gülümsəyərək,
Sən nə qanırsan ki, ay qoca kaftar!

(*Yenə gülür.*)

M a r i y a

Xanım, heç oğlunuz, ya qızınız var?

A m a l i y a

Yox bir!.. Kül başına ... ala hey, ala!
Yatma... qundaq bələ... beşik yırğala...
Fuf... dərdim, azarım qurtarıb demək,
Mənimki geyimdir, bir də ki, yemək.

M a r i y a

Axı... çox şirindir övlad nəfəsi,
Elə... buyurduğun o qundaq səsi.

A m a l i y a

Fuf... bir o qalmışdı... yuxudan kal dur,
Gecənin yarısı uşaq əmizdir...
Nə var ki, anayam!

(*Gülür.*)

M a r i y a

Bu ki, bir borcdur...
Uşaq da müqəddəs...

A m a l i y a

Yox bir mələkdir...

(*Gülür.*)

Fuf... sizə nə var ki... heyvansınız siz,
Nə eşqiniz vardır, nə də qəlbiniz.

M a r i y a

Xanım, bəs qalmasın sizdən bir nəsil?
Bir meyvə yetirir ildə hər fəsil...

A m a l i y a

Qadın inək deyil ildə sağıla
Mən öləndən sonra dünya dağıla!..
Nəsil! Fuf... guya ki, doğmasam bir mən.
Böyük bir şey itər insan nəslindən!

M a r i y a

Yox... yox... doğmasanız daha gözəldir.

(*ətrafa*)

Beləsi doğsa da pəzəvəng doğar.

A m a l i y a

Qadına hər şeydən bədən əfzəldir,
Bədənin varsa da müştərin də var!

F o n  H o l s

(*Daxil olur; o hirsli-hirsli gəzinir,*
*birdən Amaliyanı görür.*)

Amaliya, bu gündən doğmalısan sən!

A m a l i y a

Belə bir əmr var?

F o n  H o l s

Doğasan gərək!
Hər əmri hamıya açmasam da mən...
Sənə söyləyirəm yalnız ərin tək!

A m a l i y a

Mən doğum? Mən doğum? Aman, ya rəbbim!
Of... of, elə bil ki, qırılır qəlbim;
Mən uşaq saxlayım, yuxusuz qalım?!

(*Ağlayır.*)

F o n  H o l s

Amaliya! Fürerin əmridir doğmaq!
Sən alman qızısan, bir orduna bax!
Kişi qalmamışdır... qırıldı hamı,
Nəylə alacaqsan son intiqamı?

A m a l i y a

Belə cəhənnəmə qırılsın onlar,
De görək, bir mənim nə taxsırım var?

F o n  H o l s

Bir bax əynindəki xəzə, ipəyə.
Alman ordusunun hədiyyəsidir...
Onu qazanmışıq qan tökə-tökə!
Rusiya çörəklə xəz ölkəsidir...

Pauza.

Bəli, bu torpağın sonsuz çölləri
İçdikcə doymayır alman qanından,
Ordumuz hücuma keçəndən bəri
Rahatlıq üzünü görməyir bir an.
Nə qədər məlunmuş bu inad torpaq!
Nə daşı tərpənir, nə də kəsəyi.
Torpaq titrətsə də göyləri zağ-zağ,
Poladmış burdakı insan ürəyi!
Fəqət sən... bir uşaq doğmağı da sən
Özünə, nə deyim... çətin bilirsən...

A m a l i y a

Yox... doğmayacağam nə qədər sağam,
İş ki belə düşdü, boşanacağam...
Yaxşı neyləyək ki, ərsiz yaşaram.

F o n  H o l s

Ha... ha... əfv edin, əfv edin, madam!
Artıq doğmalıdır bütün ərsizlər.

A m a l i y a

Necə? Ərsizlər də?

F o n  H o l s

Bəli, bir nəfər,
Bir nəfər qadın da, doğmasa gerçək,
Alman torpağında gəzməsin, gərək!

A m a l i y a

Yaxşı bəs ərsizlər necə doğacaq?

F o n  H o l s

Özün anlayırsan... bir yol var, ancaq:
İyirmi qadına bir nəfər kişi!
Adi heyvanların gözəl vərdişi!

A m a l i y a

(*yumşaq bir səslə*)

Bəs... kimdən... doğum... mən?

General həyəcan keçirir.

F o n  H o l s

Bilmirəm kimdən.

A m a l i y a

(*onun boynunu qucaqlayaraq*)

Yaxşı... qeyrətinə toxunmaz bunlar?

F o n  H o l s

Burax sualları, Amaliya xanım,
Saldata ziynətdir bütün qanunlar.
Odur ki, rahatdır mənim vicdanım...

(*O, qol saatına baxaraq.*)

Vaxtdır, danışacaq bu saat fürer!

Radionu qurur, bir çox general və məsul hərbi işçilər gələrək hərbi təzim verirlər.

F o n  H o l s

Əyləşin, ağalar! Bu saat, bu an...

G e n e r a l  H a n s

(*təzimlə*)

Cənab feldmarşal! Xeyir bir xəbər!

F o n  H o l s

Deyin, dinləyirəm.

H a n s

Bizim əsgərlər
Bu gün ayaq basmış Qafqaz dağına,
Odlar ölkəsinə, neft torpağına!

F o n  H o l s

(*böyük bir şadlıqla*)

Qafqaz! Bütün Şərqin gözüdür Qafqaz!
Gərək qana dönsün Kür ilə Araz.

(*Xəritəyə baxaraq.*)

Dərbənd... Mahaçqala, Bakı, of, Bakı!
O böyük şəhərin qucağındakı
Tükənməz xəzinə... neft buruqları,
Muğan çöllərinin gözəl baharı...
Daima şad xəbər gətirəsiniz!

H a n s

Bəli, Mozdoku da fəth elədik biz!
Lakin... ölənlərin sayı yamandır.
Terek sahilləri qıpqızıl qandır...
Doğrusu... ürəyim pis olur hərdən...

F o n  H o l s

Nə qədər ölmüşdür bizimkilərdən?

H a n s

Üç gündə öləni, itəni yüz min.

F o n  H o l s

(*fikirdən sonra*)

Üçdən birini yaz bu rəqəmlərin...
Qoy ruhdan düşməsin cəsur almanlar!

H a n s

Fəqət... gizləsək də... ölmüşdür onlar!

F o n  H o l s

Mən də bilirəm ki, ölmüşlər, ancaq
Ölənlərin sayı yerdə qalacaq...
Başa düşdünüzmü?

H a n s

Doğrudur, cənab!
Lakin... həqiqəti gizləmək... bir az...

F o n  H o l s

Döyüş meydanında doğruluq olmaz!
Ha!.. Ha!.. Ha!.. Həqiqət! Yox bir, ədalət!
Nə vaxtdan dərd olmuş sizə bu adət?

H a n s

Əmr sizinkidir, cənab feldmarşal!

F o n  H o l s

Keçən tarixləri bir yadına sal!
İskəndər... Napoleon... Vilhelm, Çingiz xan
Sizin dediyiniz o həqiqəti
Gizlədi ən yaxın sirdaşlarından,
Hiylədir saldatın böyük zinəti!

H a n s

Əmr sizinkidir, cənab feldmarşal!
Mənim də qəlbimdə alman qanı var!
Həqiqət saldatın nəyinə gərək?
Onsuz da ölənlər dirilməyəcək...
Ha... ha ... ha...

Fon Hols

Afərin, afərin, indi almansan!
Göydə günəşi də rədd edib dansan,
Buna haqqın vardır...

Hans

Səbəb?

Fon Hols

Çünki sən
Qalib bir ordunun sərkərdəsisən!
Nə dünən, nə bu gün, nə də istiqbal
Qalib insanlara verməyir sual...
Əksinə... baş əyir onlara hər kəs,
Həqiqət də budur... söz ola bilməz!

(*Hamı əl çalır.*)

Fəqət, qalibiyyət çıxsa əlindən,
Bir Allah, bir Allah olsan belə sən
Üstünə uşaq da baş qaldırar, bil,
Bu da həqiqətdir... uydurma deyil!

Səs

Alo! Alo! Alo! Danışır Berlin.

Fon Hols

Farağat!

(*Hamı rəsmi təzimlə qulaq asır.*)

Səs

Böyük Avropanı titrədib keçən
Ordumuz səs saldı bütün cahana,
Qoy bütün yer üzü boyansın qana.
Bu gündən aləmə bildirirəm mən:
Kimin ki, qəlbində alman qanı var
Odur yer üzünə yalnız hökmdar.
Qoy zəfər səsimiz buluda dəysin.
Yerlər də, göylər də bizə baş əysin!

Sürəkli ura səsləri, çalınan zəfər marşının gurultusu,
dinləyənlər də əl çalıb ura çəkir.

Fon Hols

Budur bax! Həqiqət budur, general!
Bizimdir, bizimdir deyir istiqbal!
Hayl Hitler!
Yaşasın Fürer!

Hans

(*ətrafa*)

Yerlər də, göylər də... bu çox böyükdür...
Nə deyim, ağıl da başa bir yükdür...

Amaliya

(*qabağa gələrək*)

General! Fürerə yaz ki, bu gündən
Bir oğul doğmağa söz verirəm mən.
Elə bir oğul ki, qoy canavar tək
Didsin rast gələni pəncələyərək!
Nə mərhəmət bilsin, nə də məhəbbət,
Üzü boran olsun, baxışları sərt,
Bəli, qılınc çalsın, qan töksün!

F o n  H o l s

Qan, qan!
Amaliya! Yaxın gəl, öpüm ağzından.

(*Onu öpdükdən sonra.*)

Mən indi bildim ki, alman qızısan!
Qanla yoğrulmuşdur əzəldən insan!
Hayl Hitler!
Yaşasın Fürer!

H a n s

Yaşasın Almaniya! yaşasın vətən!

F o n  H o l s

(*zarafatyana, həm də hiyləgərcəsinə*)

Necə, ölən çoxdur bizimkilərdən?..

H a n s

Yox, yox... lap azdır ki...
Kimdir axtaran?
Bir də ki davadır, qan lazımdır, qan!
Bəs müftə torpaqlar, müftə ölkələr!

F o n  H o l s

İndisə, dəmlənək bir az, ağalar!

Sol otağa keçirlər.

M a r i y a

(*Tək gəzinir, pəncərədən boylanır,*
*əlləri qoynunda pərişan bir tövr alır.*)

Gecəm qara, günüm qara
Bu günüm, ya sabahımdır.

Ah, nə deyim insanlara,
Bəlkə də öz günahımdır...
Of, Valentin! Gəl. balacan!
Anan ölsün, de hardasan?
De, üstünə qarmı yağır?
Yazıq balam, de noldun sən?
De, bəlkə də yaran ağır,
Üzün üstə sürünürsən?
Ah, Valentin, yazıq anan
Bir qul olub indi, oğlum.
Səsin gəlir uzaqlardan
Gözlərinə qurban olum.
Gəl, balacan, qurtar məni,
Od vur sönmüş ocağıma.
Gəl ki, yenə öpüm səni,
Yenə basım qucağıma.

Sol otaqdan musiqi səsi, sərxoşluq qəhqəhələri gəlir.

M a r i y a

Yeyin! Burnunuzdan töküləcəkdir,
Dan yeri bizə də söküləcəkdir...

F o n  H o l s

(*səsi*)

Zəfər bayrağımız buluda dəysin,
Yerlər də, göylər də bizə baş əysin!

Ura səsləri, əl çalınır.

M a r i y a

Ay siz öləsiniz... iştaha bir bax...
Yerlər də ... göylər də...

(*Xaç çəkir.*)

Xeyr... bu torpaq
Çox sizin kimsini yola salmışdır,
Hələ bir dayanın... qabağı qışdır...

Hans Nataşa ilə sərxoş halda öpüşə-öpüşə sol otaqdan çıxır.
Mariyanın diqqəti pəncərədədir, onları görməyir.

Hans

Nataşa, doğrudan rus gözəlisən.

(*Onu öpür.*)

Nataşa

General, sevirəm almanları mən,
Doğrudan sevirəm... nəcibdir onlar,
Sizdə doğrudan da mədəniyyət var.

Hans

Nataşa, doğrudan rus gözəlisən,
Yalnız öpüş üçün yaranmısan sən!
Bax, bu ala gözlər, bax, bu yanaqlar...
Bu süzgün baxışlar... zərif dodaqlar...
Ha... ha... nə qəşəng çənən də vardır!
Eh, ruslar! Onlar ki, lap barbarlardır...
Nə qanır, nə qanır bu gözləri rus!
Ancaq... rus qızısan... bir buna əfsus.

Nataşa

Baxmayın, general, mənim onlardan,
Düzü, zəhləm gedir... nə rus, nə alman?
Gözəlin heç kəsə yoxdur minnəti...
Berlində yaşaram... söz vermişsiniz!

H a n s

Bəli, söz verməyə çox mahirik biz.

N a t a ş a

Necə ki?

H a n s

Necəsi yoxdur ki, bunun,
Gündüzü, gecəsi yoxdur ki, bunun...
Ha, ha, ha...

(*Nataşanı qucaqlayıb yenə öpür.*)

M a r i y a

(*onları görərək*)

Nataşa!

H a n s

(*qəzəbli*)

Bu kimdir?

N a t a ş a

(*Rişxəndlə gülür.*)

Mənim qaynanam!

M a r i y a

Nataşa, Valentin ölmüşdür məgər?

(*Ağlayır*)

H a n s

Ölmüşdür, öləcək, öləcək, kaftar!
Yoxsa, görüşməyə ümidiniz var?

M a r i y a

(*Xaç çəkərək.*)

Böyük Tanrım, yerdə qoyma bu zilləti,
Xar eləmə sən qocaman bir milləti!

(*Nataşaya qəzəblə baxaraq*)

Fahişəsən!..

Nataşa əlləri ilə üzünü tutur.

H a n s

Sus, danışma, qoca köpək!

(*Onu təpiklə vurur.*)

Hamınızın sümüyünüz çürüyəcək.

Fon Hols və başqaları çıxır.

F o n  H o l s

Bu nədir? Nə olub? Yenə qalmaqal?..

H a n s

Əfv edin! Əfv edin, cənab feldmarşal!
Bayaqdan bəridir bu kaftar qarı
Oğlu Valentini axtarır...

F o n  H o l s

Aha!..
Oğlu Valentini?

H a n s

Bəli!
Ha... ha... ha...

A m a l i y a

Bəlkə də casusdur...

H a n s

Mümkündür... olar.

M a r i y a

(*Onun sir-sifətinə baxır.*)

Xeyr, mən anayam... ana qəlbim var...

A m a l i y a

Bıy... bıy... yaxına gəl, gözlərinə bax.
Gördünüz, gördünüz, casus olacaq...

F o n  H o l s

General!
Nişan al!

General-mayor nişan alır.

N a t a ş a

(*qorxa-qorxa*)

Yox... yox... casus deyil, yazıqdır qarı...

F o n  H o l s

Nə olar, ağlasın qoy balaları.

Amaliya qəhqəhə çəkir.

M a r i y a

Axı... mən qocayam...

F o n  H o l s

Ölmək vaxtındır. Atəş!

Qarı yıxılır, hamı sərxoş qəhqəhələrlə gülüşür, bu aralıq şəhərin üstünü təyyarə səsləri alır, atılan bombaların partlayışları və alovları pəncərədən görünür, hamı iğtişaşla qaçışır. Mariya sürünə-sürünə əlləri üstündə baş qaldırır. Pəncərəyə tərəf boylanaraq.

Valentin, Valentin, hələ mən sağam,
Hələ ölməmişəm, yaşayacağam!..

(*O, başını ağzı üstə yerə qoyur.*)

P ə r d ə

## DÖRDÜNCÜ ŞƏKİL

Şimali Qafqazda bir qəsəbə. Arxada Terek çayı və meşəlik görünür. Əsgərlər ağaclıq içində istirahətdədirlər. Payız fəslidir. Ocaqlar yanır, ara-sıra tavalarda xörək bişirirlər. Bir çoxları tüfəng təmizləyir, şinel düyməsi tikir, səngər qazır, bir çoxu başqa işlərlə məşğuldur. Güloğlan qızdırma üşütməsi keçirir.

E l d a r

Nə var ə?.. Nə olub, üşütmənmi var?

G ü l o ğ l a n

Görmürsən payızdır?.. Bütün yarpaqlar
Üşüyüb tökülür...

(*O, şineli başına çəkir.*)

E l d a r

Bəs qabaqda qış,
Hələ o boz şaxta, o qar, o yağış,
Bəs onda əhvalın necə keçəcək!

G ü l o ğ l a n

Əşi, qoy dincələk...

E l d a r

Di dincəl görək,
Niyə küsürsən ki?..

G ü l o ğ l a n

Küsməyim yoxdur,
Anamın caniçün yaman soyuqdur.

E l d a r

Ə, ana canına adam and içər?
Sən nə qəribəsən?

G ü l o ğ l a n

Eh... üşütmələr
Lap məni çaşdırıb, qoy görək, Eldar.

E l d a r

Ə, bəlkə, canıyın qızdırması var?
Davadan-dərmandan içsənə görək.

G ü l o ğ l a n

Eh, sən də... onsuz da hamı öləcək...
Burdan sağ qayıdan tapılacaqdır?
Eh, bizimkilər də bir cür axmaqdır.

E l d a r

Ə... nə danışırsan, dəlisən, nəsən?

G ü l o ğ l a n

Anamın canıçün düz deyirəm mən.
Görərsən... mən deyən olmasa əgər...

E l d a r

Yaxşı, qara tökmə, gəl səhər-səhər.
Aşna, qorxudandır yoxsa üşütmən?

Tibb bacısı gəlib keçir.

E l d a r

Yoldaş tibb bacısı!

T i b b   b a c ı s ı

Eşidirəm mən.

E l d a r

Davadan-dərmandan nəyiniz olar?

T i b b   b a c ı s ı

Nə olub, yenə də qızdırmalı var?

E l d a r

Odur bax... Güloğlan.

T i b b   b a c ı s ı

Güloğlan sənsən?

G ü l o ğ l a n

Anamın canıçün düşmüşəm əldən.

T i b b  b a c ı s ı

Anamın canıçün?

(*Gülür.*)

Çox qəribədir.
Yaxşı, azarınız, dərdiniz nədir?

G ü l o ğ l a n

Nə bilim... zəhrimar... heç bilirəm ki...

Tibb bacısı onun nəbzini tutur.

T i b b  b a c ı s ı

Ağzınızı açın.

(*Güloğlan ağzını açır.*)

Diliniz təmiz,
İstiniz də yoxdur...

(*O gedir.*)

G ü l o ğ l a n

De... bu da doktor!
Get-get, vəfasızsan bu dünya kimi,
Görünmə gözümə bir röya kimi.

Şahbaz hərbi libasda, əlindəki dəftərçəni yaza-yaza ağır addımlarla, mütəəssir bir halda gəlir.

Ş a h b a z

(*öz-özünə*)

Cinayət varsa da, bəs nədir kamal?
Cavab verəcəkmi buna istiqbal?
Bəlkə də sönükdür ağlın qüdrəti...
Yoxsa idrak adlı bir ülviyyəti
Ayaqlar altına salmışdır insan?
Hər tərəfdə ölüm... hər addımda qan,
Nə müsibət çəkir gör insan oğlu,
Budurmu taleyin qurtuluş yolu?

(*O, alnını ovxalayır, dəftərçəyə nəsə qeyd edir.*)

Xeyr, tarix boyu axsa da bu qan,
İnsanlıq keçsə də fırtınalardan,
Zəncirə bağlanıb qalsa da ürək,
İdrak səltənəti sürünməyəcək...

Pauza.

Nə deyim... Xəyaldır bəlkə bu inam?

(*O, əlini havaya çırparaq*)

Xəyal da səyyardır yaranışından...
Bəzən gülümsəyir saxta mələk tək,
Bizim qəlbimizlə o əylənərək.
Cocuq tək aldadır... oynadır bizi,
Daşdan-daşa çırpır ürəyimizi.

(*O, radist Valentinin yanına gəlir.*)

Ş a h b a z

Əfv edin, nə sənət sahibisiniz?

V a l e n t i n

İndi... rabitəçi.

Ş a h b a z

Bəs qabaq?

V a l e n t i n

Memar.

Ş a h b a z

Nə qədər dəyişib dönür insanlar?!

V a l e n t i n

Bu, təəccüblüdür?

Ş a h b a z

Bəs sizcə necə?

V a l e n t i n

Bu çox təbiidir mənim zənnimcə,
Bu gün bir əsgərdir dünənki memar,
Nolar ki, hər günün öz tələbi var.
Siz filosofsunuz?

Ş a h b a z

Deyirlər bir az.

V a l e n t i n

Gərək ki... adınız... Şahbazdır!

Ş a h b a z

Şahbaz

V a l e n t i n

Siz də mənim kimi bir əsgərsiniz,
Alim olsanız da, hünərvərsiniz.

Ş a h b a z

Əlbəttə, əlbəttə, hünər... hünərvər,
Dünən bir filosof, bu gün bir əsgər.

V a l e n t i n

Bəli. Təəccüblü nə var ki, bunda!

Ş a h b a z

Əlbəttə, dəyişib dönür qanun da...
Hər şey təbiətdə min şəkil alır,
Lakin hər qətrənin mənası qalır...
Biz də mənamızla yaşayaq, gərək.
Bu gün səngərlərə sinə də gərsək.
Od-alov içində yansaq belə biz,
Gərək ki, sönməsin sənət eşqimiz;
Bəlkə yanılıram?..

V a l e n t i n

Xeyr, bu haqdır,
İnsan, nəfəsilə yaşayacaqdır.

Ş a h b a z

Gəlin, yoldaş deyil, bir qardaş olaq.
Pis gündə, xoş gündə bir sirdaş olaq.
Çünki mən sevirəm kamallarımı.

(*Onlar bir-birinə əl verir.*)

V a l e n t i n

Göydən buz töksə də ömrün ruzgarı,
Sönməz cəbhələrdə yaranan ülfət.
Bu böyük dostluğa and içirəm mən.

Ş a h b a z

Var olsun azadlıq, bir də məhəbbət,
Evdə kimin vardır?

V a l e n t i n

Qoca bir ana.
Bir də ağıldan kəm bir yoldaşım var.

Ş a h b a z

Hə... Eldar!

E l d a r

(*ayağa qalxaraq*)

Buyurun...buyurun... Şahbaz!

Ş a h b a z

Noldu əlindəki o dünənki saz?

E l d a r

Ordadır... Çadırda... necə?

Ş a h b a z

Gətir bir.
Könlümdən yenə saz havası keçir...
Hə... zəhmət olmaz ki?

E l d a r

Bıy, bu nə sözdür?

Eldar çadıra yönəlib, sazı gətirir, əsgərlər onun başına toplaşır.

Ş a h b a z

Çal, Məryəm oğlunun şikəstəsini.

S ə s l ə r

Hə... hə... yaxşı deyir...
Onu çal, onu!

Məryəm oğlunun şikəstəsi çalınır, Eldar asta, lakin
məlahətli bir səslə oxuyur.

E l d a r

Hər obanın bir yaylağı,
Hər tərlanın öz oylağı,
Dolaylarda bahar çağı
Bir doyunca gəzim, dağlar!

Qayaları baş-başadır,
Güneyləri tamaşadır;
Gödək ömrü çox yaşadır
Canım dağlar, gözüm dağlar!

Bir qonağam bu dünyada,
Bir gün ömrüm gedər bada,
Cəlalı da salar yada,
Düz ilqarlı, bizim dağlar!

S ə s

Sağ ol, maştağalı balası, sağ ol!
Oxuyan, saz çalan, əsgər komsomol!

Ş a h b a z

Vallah, halal olsun, doğrudan sağ ol!

V a l e n t i n

Doğrudan, mənalı, gözəl nəğmədir.

Ş a h b a z

Eh, sən nə görmüsən, hələ bu nədir?
Bakı! Müqəddəsdir o böyük şəhər,
Şərqin ümidgahı – o nazlı Vətən.
Sahili sardıqca əlvan şəfəqlər,
Bir filosof kimi düşünür bəzən;
Bir üzü baharsa, bir üzü qışdır.
Gözəllik dastanı yazılmamışdır...
Ah, Cəlal! Ah, Cəlal görən hardadır?
Kim bilir, o hansı dalğalardadır?

G ü l o ğ l a n

(*irəli gələrək*)

Ay Eldar, çox sağ ol, üşütməm qaçdı...

Ş a h b a z

Paho... Güloğlan da birdən dil açdı...

E l d a r

Doğrudan deyirsən? Hə, istiləndin?

G ü l o ğ l a n

Anamın caniçün...

İslam mayor libasında gəlir. Hamı onu hərbi təzimlə qarşılayır.

İ s l a m

Azad! Hə... filosof, necədir işlər?
Yenə başındadır köhnə vərdişlər?

Ş a h b a z

Necə ki?

İ s l a m

Belə də... o hökmi-zaman,
O idrak qanunu... o fəlsəfələr
Yoxsa əl çəkməyir hələ yaxandan?

Ş a h b a z

Məncə, düşünməkçün yaranır hər baş,
Ağıldır insana ən böyük sirdaş.

İ s l a m

(*belindəki avtomatı göstərərək*)

Bəs avtomat necə? Hə, aran yoxdur?

Ş a h b a z

Nə üçün... onun da mənası çoxdur,
O da bir zinətdir qəhrəmanlığa...

İ s l a m

Tutaq ki, allahsan sən bir anlığa ,
Bir avtomatın var, bir də fəlsəfən,
Dünyanı hansıyla xilas edərsən?

Ş a h b a z

Əlbəttə, fəlsəfə ağlın qüdrəti,
Bir də ürəklərin saf məhəbbəti.

İ s l a m

Odur da... nə qədər əlləşsəm də mən,
Sən yenə əvvəlki idealistsən.

Qılıncdır, qılıncdır haqqa yol açan,
Qılıncdır ağzından şəfəqlər saçan,
Qılınc öldürəcək hər cahangiri.

E l d a r

Olmazmı qılıncda ağıl tədbiri,
Ağılda bir qılınc kəsəri ola?

Hamı təəccüblə sükut edir.

İ s l a m

Maştağa filosof salıb ki, yola!..

Ş a h b a z

O düzdür, birləşsə qılıncla kamal,
Bu qanlı günləri görməz istiqbal.
Afərin, çox sağ ol, afərin, Eldar!

(*Onun əlini sıxır.*)

İ s l a m

Gör də... papaq altda nə oğullar var.

G ü l o ğ l a n

(*Eldara*)

Anamın caniçün lap düz deyirsən!
Canımdan üşütmə getdi bu gündən....

C ə l a l

Xoş gördük, yoldaşlar!

S ə s l ə r

Xoş gördük!

İ s l a m

Cəlal!
Ay səni xoş gördük gənc şairimiz,
Xoş buyurmusunuz bu tərəfə siz.

(*Onlar qucaqlaşıb öpüşürlər.*)

Yaxşı, hardan belə, de nə işdəsən,
Harda işləyirsən, nədir vəzifən?

C ə l a l

Redaktor, mənim də qılıncım sözdür!
Bütün yazdığım da Quran tək düzdür.

İ s l a m

Heç yalanı yoxdur?

C ə l a l

Niyə... hərdən bir...
Bəzən uydurmaq da günah deyildir...

İ s l a m

Bilirəm, şairlər hap-gopsuz olmaz.
Yaxşı, dincini al,
Əmr edin aşpaz
Bir kabab bişirsin
Yəqin ki, acsan!

C ə l a l

Piyada gəlmişəm. Yorğunluğumdan
İştaham da yoxdur.
Bay, mayor yoldaş!
Qoy təbrik eləyim, artıb ki, rütbən!

(*Ona əl verir.*)

İ s l a m

Hələ bir tələsmə.

(*O, məğrur bir vəziyyət alır.*)

Yaxşı, de görək,
General çıxarmı, bu lələşindən?

C ə l a l

Mütləq sən general olsan gərək,
Şerimiz, sözümüz, elmimiz də var,
Arif yaşamışdır, bizim babalar,
Lakin xoş olsa da söz ilə sənət!
Böyük sərkərdələr yetirən millət
Yalnız qalibiyyət çələngi taxar,
Gələcək günlərə vüqarla baxar.

İ s l a m

(*mütəəssir bir halda*)

Gözlə qardaşını... vaxtı var...

Dildar gəlir. Cəlal onu görür.

C ə l a l

Dildar!..

D i l d a r

Cəlal qardaş!..

Onlar əl verib görüşürlər.

C ə l a l

Necəsən, ay qız?

İ s l a m

Ürəyi sadədir... üzü ayıbsız,
Ancaq... bir azacıq qaraqabaqdır...

C ə l a l

Bildim... yaşın ötür... lap yaxşı...
Vaxtdır...

Dildar mehriban baxışlarla uzaqlaşır.

C ə l a l

Yaxşı, xeyir olsun...

İ s l a m

Belədir insan –
Keçdikcə həyatın alovlarından,
Ölümlə gəldikcə pəncə-pəncəyə,
Ürək min dil açır məhəbbət deyə,
Doğrudan, adamın bir oğlu ola,
Öləndən sonra da yurdunda qala.

G ü l o ğ l a n

(*irəli gələrək*)

Mən də...
Bir şeir yazmışam... görün yaxşıdır!..

C ə l a l

(*şerə baxaraq*)

Bu... bərcüstə əsər özünüzündür?

G ü l o ğ l a n

Anamın... Canıçün özüm yazmışam.

C ə l a l

Ancaq... yazmasanız lap qiyamətdir.

İ s l a m

Bəs özün? Hə... təzə bir şeyin varmı?

C ə l a l

Şairin çantası heç boş olarmı?

İ s l a m

Tez bura toplaşın,
Di dur, zəhmət çək,
Yenə canımıza bir döşə görək!

Cəlal çantasından bir dəftərçə çıxarıb oxuyur.

C ə l a l

Biz gələndə saz tuturdu Azərbaycan elləri,
Yaşıl məxmər geyinmişdi nazlı Muğan çölləri
Uğur olsun, get, dedikcə bizim odlar ölkəsi,
Başımızın üstündəydi qartalların kölgəsi.
Ana torpaq dil açmışdı yarpaqların səsində,
Hicran sazı çalınırdı quşların nəğməsində...
Boynu bükük dayanmışdı su üstündə sonalar,
Bir namusdan açmayırdı öz dərdini analar...

Güloğlan ana sözünü eşitcək hönkürüb ağlayır.

Biz duyuruq bu həsrəti... dinməsə də dodaqlar,
Ürəklərin yanğısına su səpirdi bulaqlar...
Lakin Vətən torpağının qəhrəmanlıq şöhrəti
Yar deyirdi şimşək kimi üfüqdəki zülməti...
Yaz da keçdi, yay da yetdi, ay da , il də dolandı,
Unutmadıq, unutmayaq, içdiyimiz o andı!

Toy duvağı açılmamış gəlinlərin naləsi,
Dağ döşündə yaz çiçəyi, son baharın laləsi
İntiqama dəvət edir hər qəhrəman ürəyi,
Zülmətlərdə məşəl olsun azadlığın diləyi.
Haydı dostlar! Yerin qəlbi hiddət ilə bağırır,
Vətən bizi şərəf deyə döyüşlərə çağırır!

Havanı düşmən təyyarələri bulud kimi alır, yerdə dəhşətli partlayışlar əmələ gəlir. Hamı səngərlərə dolur, topçular topların arxasına keçir.

İ s l a m

Dəhşət!
Bizimkilər gecikdi demək!
Göydən yer üzünə od töküləcək.
Atəş!

G ü l o ğ l a n

Alovlandı... odur ha... yandı!
Yandı!
Düşmən təyyarəsi qana boyandı!

İ s l a m

Atəş!.. Od püskürsün toplar ağzından...

C ə l a l

Nə qansız həyat var, nə həyatsız qan.

İ s l a m

Şahbaz, yaralandın?

E l d a r

Ah... namərd güllə!..
Sağ olmuş özünü gözləmədi ki...

D i l d a r

Onun gözlərində şəfəq sökülür.

C ə l a l

Elə bil, üstümə dağ-daş tökülür.

Ş a h b a z

Belə bir xalq ilə vaxtsız da ölmək
Bir şəfəq, bir namus sayılsın gərək.

Radio səslənir.

Dinləyin, dinləyin, hicran nəğməsi!
Bəstəkar Səhərin könül səsidir.
Öz həyat yoldaşı... əsgər Şahbaza
Səhərin birinci hədiyyəsidir!

Hicran nəğməsi çalınır, hamı sükut içində qulaq asır.

Ş a h b a z

Odur, o Səhərdir... onun nəfəsi,
Onun... o vicdanın qəm nəşidəsi.
Bəs niyə qəmlidir?.. Aman... o nədir?..
Bəlkə... şama yanan bir pərvanədir.
Yox, yox... o danlayır... danlayır məni...
Xeyr, o danlayır bir qərinəni...
Hökm edir bir ürək təranəsilə,
O böyük vicdanın hər hökmü haqdır.
Ah, onun lütfkar, hicran səsilə
Yaram simləsə də sağalacaqdır...

P ə r d ə

BEŞİNCİ ŞƏKİL

Fon Holsun qabaqkı mənzili. Amaliya və Nataşa evdədir.
Amaliya ayna qabağında bəzənir.

A m a l i y a

Nə zərif ipəkdir, özü də güllü!..
Gözəldir... nə xoşbəxt keçir günlərim!
Hayıf ki, bir azca qocadır ərim.
Eh, cəhənnəmə ki... nə çoxdur gənclər.
Gündəcə bir aşna... təzəcə bir ər,
Nataşa, belədir?

N a t a ş a

Düzdür? Amaliya!
Yalnız ehtirasla yaşayır dünya.

A m a l i y a

He... he doğrudan da yalnız ehtiras,
Gözəl bir oğlanı qucağına bas...
Sıx... sıx... qoy bağırsın... qışqırıq salsın.
Ağız da, ürək də bir ləzzət alsın...

N a t a ş a

Elə bərk sıxmayın rəhm edin barı,
Sınar ki, yazığın qabırğaları.

Gülüşürlər.

A m a l i y a

Hə... hə... mənim ərim bir az səs salır.
Sonra da daş kimi sustalıb qalır...

Hə, doğrudan, cavan... sinəsi möhkəm,
Özü də ağıldan bir azacıq kəm...
Hə... hə... lap qurd kimi... canavar kimi.

N a t a ş a

Mənəsə... gözləri aslanlar kimi,
Həm də bir azacıq saçlarında ağ...
Otuz beş... qırx yaşlı gözəl bir kişi
Pələngə oxşasın hər tərpənişi...

A m a l i y a

Sən hələ cavansan, odur ki, hələ
Yaşlılar xoş gəlir nəzərlərinə.
Dayan... qocalarsan sən də mənim tək,
O vaxt arı kimi şirə çəkərək
Çiçəkdən-çiçəyə qonarsan sən də.

N a t a ş a

Eh... kaş ki, ölməyim, qocalım mən də,
Nə çoxdur dünyada, sən demiş, cavan.

A m a l i y a

Amma nə gəbərdi sənin qaynanan?

(*Gülür.*)

Durub nitq eləyir ağılsız kaftar.

N a t a ş a

Amaliya, deyəsən...

A m a l i y a

Yoxsa... gələn var?

Fon Hols, Hans və Albert gəlirlər. Albert Hitler libasında maskalanmış alman-faşist filosofu və propaqanda ministridir.

F o n  H o l s

Nə qədər xoşbəxtəm bu gün, Fürer,
Qaçır ayaqlarım altındakı yer
Hayl Hitler!

H a n s

Yaşasın Fürer!

Hərbi təzim verirlər.

F o n  H o l s

Paltonuzu tutum!

A l b e r t

(*mülayim səslə*)

Soyuqdur bir az,
Müharibə vaxtı soldat soyunmaz.

F o n  H o l s

Əfv edin, əfv edin,
Lap şaşmışam mən.

H a n s

O qədər şadıq ki, gəlişinizdən
Çıxır yadımızdan bir çox qaydalar.

(*Baş əyir.*)

Fon Hols

Bu gün nitqinizi söylədikcə siz
Coşub ruha gəldi əsgərlərimiz.
Yoxsa... axır zaman... sözün doğrusu,
Belə... birtəhərdi alman ordusu.
Arabir bədbinlik... məyusluq... hətta
İntihar adlanan böyük bir xəta...

Albert buxarıda əllərini qızdırır.

Albert

(*qəzəbli və heybətli*)

Ordunun hücumu dayanan zaman,
Əlbəttə, əlbəttə, o düşər ruhdan.
Barı danışmayın... eyibdir sizə,
Bu söz yaraşmayır heç rütbənizə,
Feldmarşal?
General, ax... sizə?

O hirsli-hirsli gəzinir. Fon Hols və Hans hərbi təzimdə dayanmışlar.

Albert

(*mülayim və hiyləgərcə*)

Əmr edin, qapılar və pəncərələr
Möhkəmcə bağlansın, başqa bir nəfər
İndiki söhbəti eşitsə, işdir,
Sizin ölümünüz hazır gəlmişdir.

Fon Hols

Hayl Hitler!

Hans

Yaşasın Fürer!

Qapılar və pəncərələr bağlanır. Zabitlər çıxır.

Albert

(*maskasını götürərək mülayim bir səslə*)

Hə... kiməm, general?
Kiməm, feldmarşal?

Fon Hols və Hans heyrətlə baxırlar, yenə hərbi təzim edirlər.

Albert

(*mülayim bir səslə*)

Neyçün susursunuz, tanımadınız?
Yoxsa bildiyiniz Fürerdir, yalnız.
Fürer tək deyildir, o, peyğəmbər tək
Gündə bir qiyafət dəyişdirərək
Cilddən-cildə girir... bəli, böylədir...
Bu da bir üsuldur... müharibədir.
İndi tanış olaq, Albert...

Hans

Ministr!..

Əl verib tanış olurlar.

Fon Hols

Çox gözəl, fürerin yaxın sirdaşı,
Elm ilə ürfanın ən böyük başı.

Ministr, nə qədər bəxtiyaram mən,
Asılı olsaq da biz rütbənizdən,
İcazə verin ki, ziyafət quraq,
Sadə dostlar kimi bir badə vuraq!

A l b e r t

(*mülayim*)

Eyb etməz, oturun, ancaq bir nəfər.

(*qəzəbli*)

Nə zabit, nə də ki, başqa bir əsgər.

F o n  H o l s

Yox... Yox... siz arxayın olun bu axşam,
Mən də hiylələrdə saç ağartmışam.

Hans badələri doldurur.

F o n  H o l s

Topdan, dinamitdən daha qüdrətli,
İldırım sürətli, həm də heybətli
Sizin sözləriniz bir Allah qədər
Hər başa hökm edir, hər qəlbə əsər.
Ürəkdən içirəm şərəfinizə!

H a n s

(*yaltaqlanaraq*)

Cənab, çox görməyin bu haqqı bizə!

İçirlər.

Albert

(*yumşaq bir səslə*)

Sizin sağlığıza, Fon Hols, bir də Hans!
Alman orduları heç məğlub olmaz!

Fon Hols

Sağ olun!..

Hans

Sağ olun!..

Fon Hols

Sizindir hünər,
O odlu nitqlər, odlu fikirlər,
Ordumuz yaşayır fəlsəfənizlə!

Hans

Alman əsgərləri fəxr edir sizlə.

Albert

(*hirsli*)

Yaşı keçənlərin çoxalır sayı.

Fon Hols

Cənab, çox inadmış bu Volqa çayı.

Albert

(*qəzəbli*)

Feldmarşal çay deyil... insandır inad,
Hələ çox yerləri görürəm abad.

Az yandırırsınız... yumşalsa ürək,
Düşmən fürsət tapıb ürəklənəcək,
Artırın sayını fəlakətlərin,
Heç kəs nəfəsini çəkə bilməsin.

Hans

Əcəb, çox inadmış, inadmış ruslar,
Nə ölüm, nə aclıq, nə soyuq, nə qar
Qırmayır onların iradəsini.

Albert

(*yumşaq bir səslə*)

Alman ordusunun hücum səsini
Bircə an... bircə an saxlasaq, əgər,
Ruhdan düşəcəkdir bizim əsgərlər.

(*ucadan, süni ruh yüksəkliyi ilə*)

Çünki alışmışdır onlar səfərə...
Dayanmaq səbəbdir təhlükələrə.
Utanın, utanın bir rütbənizdən...

(*O gəzinir, sonra yumşaq bir səslə.*)

Fürerin rəyilə həmfikirəm mən:
Şimşək sürətilə getməsək başa,
Bütün ümidimiz dəyəcək daşa...

(*mülayim və hiyləgərcə*)

Fəqət, müharibə uzansa, əgər,
Əlbir ola bilər bir çox ölkələr.

Hans

Artıq... bu təhlükə duyulur, bəzən...

A l b e r t

(*eyhamlı və kinayəli*)

Bəli, bu xüsusda danışıram mən...
Nolar... yastıq qoyub yatın, general...
Siz də... cənab Fon Hols... həm də feldmarşal!

Xaricdən pulemyot səsləri eşidilir.

A l b e r t

(*qorxmuş*)

Bu nədir?

F o n  H o l s

Narahat olmayın, cənab!
Əsir güllələnir...

A l b e r t

Neçə nəfərdir?

F o n  H o l s

On zabit, üç yüz də adi əsgərdir.

A l b e r t

Üsyan qaldırmışlar?

H a n s

(*kinayəli*)

Üsyan... etiraz...

A l b e r t

Əsirlərin sayı azalır... çox az...
Yaxşı, bəs onlardan bizim tərəfə
Çəkdiyiniz yoxmu?

F o n  H o l s

Nə üçün, vardır,
Ancaq qananlar yox... simasızlardır.

A l b e r t

Bəs alimlərindən?

F o n  H o l s

Olur... ancaq az.

H a n s

Bir rus alimilə filosof Şahbaz
Əsir alınmışdır... söhbət etsəniz,
Bəlkə biz tərəfə çəkəsiniz siz.

A l b e r t

Filosof hardandır?

H a n s

Azərbaycandan...

A l b e r t

(*Fikrə gedir... mənalı*)

Bakı... Azərbaycan, İran,
Hin-dus-tan!

Xüsusən... xüsusən... Bakı şəhəri,
Ordansa... ən uzaq Şərq ölkələri...
Əmr edib gətirdin!

Hans çıxır.

A l b e r t

Qafqaz xalqlarını tezcə tovlamaq
Asan mümkün olar... çünki ruslarla
Köhnə ədavət var aralarında...
Öz qan düşmənindən intiqam almaq
Onlarda nəsildən nəsilə keçir.

F o n  H o l s

Lakin... təəssüf ki, dəyişmiş onlar...
Onlarda duz-çörək, bir də etibar,
Yoldaşlıq hissi də çox möhkəm olur.
Nə vaxt ki, cəbhədə bir rus vurulur –
Çoxu yaylıq alıb ağlayır bəzən,
Ədavət getmişdir ürəklərindən...

A l b e r t

Doğrudan belədir?..

F o n  H o l s

Əfsus ki... bəli!
Onlara bayraqdır yoldaşlıq əli.

A l b e r t

Təbliğat, təbliğat güclənsə, əgər,
Oyanar təzədən köhnə hisslər...

F o n  H o l s

(*hərbi təzimlə*)

Bir tədbir tökərik, cənab marşal!..

Hans ilə Şahbaz gəlir. Şahbazın saçları dümağ ağarmış, özü də çox pərişandır. O, bərk axsayır.

H a n s

(*hərbi təzimlə*)

Əmrinizə görə!

A l b e r t

Əyləşin... bir az...

Hansın işarəsi ilə Şahbaz əyləşir.

A l b e r t

(*mülayim və hiyləgərcə*)

Feldmarşal, bu gəncdir filosof Şahbaz?

F o n  H o l s

Özüdür...

A l b e r t

Çox gözəl... çox gözəl... şadam
Çox qəribə keçir bugünkü axşam...

(*Şahbaza*)

Hamı sizin kimi təslim olsaydı,
Çox tez qurtarardıq müharibəni.

Ş a h b a z

Təslim yox... bir əsir çağırın məni.

A l b e r t

Nə fərqi varmış ki?..

Ş a h b a z

(*sakit bir təbiətlə*)

Təfavüt çoxdur...
Yaralı əsgərin əsir düşməkdə
O qədər də böyük günahı yoxdur...
Fəqət, təslim olsa qorxudan insan,
Demək ki, yox imiş onda bir vicdan.

A l b e r t

Vicdan varlığına inanırsınız?

Ş a h b a z

İnsanın mənası bir odur, yalnız.

A l b e r t

(*gülür*)

Məncə, yox... hər vicdan gözə pərdədir,
Vicdan etiqadı zəiflərdədir...
Kimin ki süngüsü, bombası çoxdur,
Vicdanın ona bir köməyi yoxdur...
Belədir, filosof?..

Ş a h b a z

Sizcə, doğrudan...

A l b e r t

Bütün canlılardan zəifdir insan.
Odur ki, daima vicdan da, haqq da,
Dostluğa, ülfətə arxalanmaq da
Baş verir insanın zəifliyindən...
Bu xüsusda kitab yazmışam ki, mən.
Filosof Albertəm...

Ş a h b a z

Bir az xəbərim var.

A l b e r t

Fikriniz nədir?
Tarixə balaca bir hədiyyədir.

Ş a h b a z

Orijinal deyildir yazdıqlarınız –
Filosof Nitşenin fikridir, yalnız...

Albert həyəcan keçirir.

A l b e r t

Bəlkə Nitşeni də sevməyirsiniz?

Ş a h b a z

Bəlkə yox... başqadır fikirlərimiz.

A l b e r t

Kimi sevirsiniz bəs almanlardan?

Ş a h b a z

Birini sevərdim, o da bir zaman...

A l b e r t

O kimdi?

Ş a h b a z

O – Höte, “Faust”u yazan.

A l b e r t

Bəs indi, fikriniz dəyişmiş yoxsa?

Ş a h b a z

Bəli, “Faust”dakı gizli bir məna
Gülür insanlığın arzularına.
Orda Mefistofel qələbə çalır,
İnsan qüdrətiysə kölgədə qalır.

A l b e r t

(*kinayə ilə*)

Bəs sizin fəlsəfə, Hürmüz, Əhrimən?..

Ş a h b a z

Hürmüz xəbər verir qərinələrdən.
Orda çarpışsa da xeyir ilə şər,
Fənalıq qurdunu öldürür bəşər.
Əhrimən səpsə də yalnız zülməti.
Hürmüzün eşqidir insan qüdrəti.

F o n  H o l s

İndi də çarpışır Əhrimən, Hürmüz?

Ş a h b a z

İndi də çarpışır gecəylə gündüz...

A l b e r t

Hardan kəşf elədin bu qanunu sən?

Ş a h b a z

Əsgəri olduğum müharibədən.

F o n  H o l s

(*qəzəbli*)

Siz kommunistsiniz!

Ş a h b a z

Xeyr... bitərəf...

H a n s

Çox gözəl dərs almış bolşeviklərdən.

Ş a h b a z

Öz etiqadımla danışıram mən...

A l b e r t

Feldmarşal!

(*O, Fon Holsu ətrafa çəkərək ikilikdə danışır.*)

A l b e r t

Qabaqda Şərq vardır... bunu birtəhər
Tovlasaq, şübhəsiz, çox xeyri dəyər.
Görürsən, kamildir.

Fon Hols

Doğrudur, cənab!
Lakin zəhərləmiş onu inqilab,
Ağlım çətin kəsir dəyişməyinə.

Albert

Nə qədər fürsət var... çalışın yenə.

(*O Şahbaza dönərək, qorxutmaq üsulu ilə.*)

De, ölüm şirindir... yoxsa yaşamaq?

Şahbaz

Mənim qibləgahım həyatdır, ancaq.

Albert

İkisindən biri... dönsəniz, əgər,
Həyat olacaqdır sizə müyəssər.
Lakin əvvəlkini desəniz, yalnız,
Əmrimlə odlara yanacaqsınız.

Şahbaz

(*fikrə gedərək*)

Həyatmı, ölümmü, – böyük sualdır...
Elə bil yerlər də, göylər də laldır...

Hicran nəğməsi çalınır, Şahbazın üzündə təbəssüm işıqları parlayır.

Albert

Neçin susursunuz, şirindir həyat?

Şahbaz

Çox şirin olsa da, əsirəm... heyhat!

A l b e r t

Artıq cavab verin, filosof Şahbaz!

Ş a h b a z

Cənab, danışıram... dayanın bir az.

A l b e r t

Ha... ha... kim ilə?

Ş a h b a z

Öz vicdanımla...
Günəşli, gündüzlü asimanımla.

Musiqi canlanır. Şahbaz üzündə təbəssüm xəyala getmiş, Fon Hols, Albert və Hans ona kinli gözlərlə baxırlar, yavaş-yavaş pərdə düşür.

P ə r d ə

## ALTINCI ŞƏKİL

İkiotaqlı bir zirzəmi. Divarlar nəm və soyuqdur. Səhər qaranlığı yavaş-yavaş aydınlaşır. Əlli nəfər Azərbaycan əsgəri əsirdir. Şahbaz sol divarın dibində, şəfqət bacısı isə sağ divara arxasını söykəyib, əlləri qoynunda oturmuşdur. Yatanlar, xəstələr, acından sustalanlar var. Həzin bir musiqi.

Ş a h b a z

Açılmaq bilməyir zalım səhər də,
Başımda donmuşdur düşüncələr də.
Didib parçalayır məni dörd divar,
Nə qurtuluş yolu... nə də ümid var...
Boğur nəfəsimi bu zil qaranlıq,
Ah, Günəş, ah, Günəş... barı, bir anlıq
Görünüb, sonradan batsaydı yenə,
Mən səcdə qılardım bu hörmətinə.

D i l d a r

Şahbaz, yatmamısan, hələ oyaqsan?

Ş a h b a z

Yox, bacım... sən özün məndən sayaqsan.

D i l d a r

Üç gündür gözümdən çəkilmiş yuxu...
Didir ürəyimi bir qara qorxu.

Ş a h b a z

Nədən qorxursan ki?..

D i l d a r

Yalnız ölümdən,
Ölümün nəfəsi yaman murdardır.

Ş a h b a z

Ölümdən zövq alan bir almanlardır.

D i l d a r

Doğrudan, nə üçün belədir onlar,
Nə üçün qatildir, söylə, almanlar?

Ş a h b a z

Qədim tarixi var bu pis adətin,
Onlar aşiqidir hər fəlakətin.
Səadət adlanan gözəl bir pəri,
Yaxud da Günəşin al şəfəqləri
Onlara yad kimi görünür, Dildar
Odur ki, cəlladdır qatil almanlar.

D i l d a r

Bəs həyat ölümdən şirindir, Şahbaz,
Neçin həyat üçün yaşamayırlar?

Ş a h b a z

Bunun hikmətini düşünsən bir az,
Çox çirkin olsa da öz tarixi var.

(*O əllərini ovxalayıb gəzinir.*)

Həyat dediyimiz o gözəl məna,
Tale dediyimiz müqəddəs dünya
Yaranır insanın arzularından,
Hər təmiz vicdanın ilk baharından,
Məsələn, dost olmaq, bir sirdaş olmaq,
Ya ata, ya oğul, ya qardaş olmaq,
Gözəl bir dilbərin eşqilə gülmək,
Bir çöræklə düzün qədrini bilmək,
Keçən tarixləri varaqlayaraq
Babalar eşqilə bəxtiyar olmaq,
Ədalət, insanlıq, şərəf və namus,
Bir sözlə söyləsək, insana məxsus
Bu sifətlər ilə yaranır həyat,
Alman qəlbindəsə bu yoxdur, heyhat!

D i l d a r

Neçin bu sifətlər yoxdur onlarda?
İnsan yaranmamış məgər onlar da?

Ş a h b a z

Əzəldən saf olur insan fitrəti.

D i l d a r

Yaxşı, nə korlamış bəs bu milləti?

Ş a h b a z

Yalnız qarətçilik... talana uymaq...
Könüllər mülkünü xaraba qoymaq...
Özgə zəhmətilə yaşamaq fikri,
Alman millətinin bu axmaq fikri
Əsrlərdən bəri azardır, azar –
Hələ nə dərmanı, nə təbibi var!

D i l d a r

Onların gözündə bir quldur insan.

Ş a h b a z

Cəlladda qan olmaz, oğruda vicdan.

S ə s l ə r

Ah!.. Aman!.. , ölürəm... Bir parça çörək...

D i l d a r

O yazıq, deyəsən, lap keçinəcək.

(*Dildar əsirlərin arasına gedir.*)

Ş a h b a z

Əsiri acından öldürür bunlar,
Nəsildən nəslə bütün qanunlar,
Qaydalar tapdanır. Oyansın torpaq,
Qoy insan dərdilə alovlanaraq
Cəlladlar başına bir külüng çalsın,
Azadlıq eşqilə yer nəfəs alsın.

(*O, bir küncdə əyləşir, dəftərini dizi üstə tutub yazır;
hava artıq işıqlanmışdır.*)

S ə s l ə r

– Eh, dünya... yasdadır indi analar...
– Nə yaman olurmuş həbsxanalar...
– Doktor! Mən ölürəm... əlacın varmı?..

D i l d a r

Yox, qardaş, aclığa dərman olarmı?

S ə s l ə r

– Dayan, insaf elə, əlini saxla!..
– Bala, qapıya çıx, həyəti yoxla,
– Deyəsən gələn var... kim ola görən?
– Gülbahar, Gülbahar! Ah, qızım, sənsən?..
– Öldü köpək oğlu? Gəbərdi, aha!..
– Görən çoxmu qalır hələ sabaha?..

D i l d a r

Aman!.. Nələr deyir bu qərib səslər,
Elə bil bağrıma sancılır xəncər.

Ş a h b a z

Nə deyir, nə deyir bizə istiqbal,
Qalib gələcəkmi cahanda kamal?

(*O yazır, hicran nəğməsi onun xəyalına gəlir.*)

Ş a h b a z

Odur, ah, Səhərdir, onun səsidir.
Çaldığı hicranın ilk nəğməsidir.
Odur, o sənətin asimanında.

S ə h ə r i n  s ə s i

Yox, yox... səninləyəm, sənin yanında.

Ş a h b a z

Bizi görürsənmi, yaman dardayıq,
26-lar tək zindanlardayıq.

S ə h ə r

Cəllada baş əymə, babaların tək.

Ş a h b a z

Sağ ol! Dağa döndü sinəmdə ürək.
De, uşaq necədir, məni anırmı,
Ata həsrətilə qəlbi yanırmı?

S ə h ə r

Ana qoynundadır, qalma nigaran.
Həyata öyrədir onu da zaman.
Əsərini qurtar... gözləyirik biz,
Oxusun gələcək nəsillərimiz.

Ş a h b a z

O yarımçıq qalır, tez ölürəm mən.

S ə h ə r

Ya oğlun tamamlar, ya da öz nəvən.

D i l d a r

(*Şahbaza yaxınlaşaraq*)

Şahbaz, bir çarəmiz qalmadı daha.

S ə s

Dözək... hələ dözək... mədəd Allaha!

Ş a h b a z

Gəl, gəl, bu bu divarı yaraq birtəhər!

D i l d a r

Yarıb qaçışaqmı, mümkünmü, məgər?

Ş a h b a z

Yox, Dildar! Qaçmağa qalmamış imkan,
Başqa bir fikrim var...

(*O, divarı dırnaqları ilə didir.*)

D i l d a r

Aqil bir insan
Artıq şaşırmışdır, dəhşətə bir bax!
Yazıq, olmuya ki, havalanacaq.

Ş a h b a z

Aha... qopdu bir daş, qopdu, bax, Dildar!

Əsirlər onun başına toplaşır.

S ə s

Şahbaz, de, qardaşım, nə məqsədin var?

Ş a h b a z

(*dəftərçəni qoynundan çıxararaq*)

Bu səhər... Yarımçıq qalıb bu əsər,
Deyirəm gizləyim bunu birtəhər.

Bəlkə daş altından tapıldı bir vaxt,
Bir də dünya gördü bu nakam, bədbaxt...

(*O, əsəri ovuğa qoyub, daş parçasını yerinə qoyur.*)

Əlvida, əlvida, ey ilk əsərim!
Səninlə keçmişdir əziz günlərim.
Mən səndən ayrılıb getsəm də bu dəm,
Ya oğlum tamamlar, ya da öz nəvəm.

O bayılır, əsirlər onu yavaşca yerə qoyurlar.

D i l d a r

Şahbaz, qoy üzməsin səni xəyallar.

Ş a h b a z

Hər qışın sonunda gülür bir bahar.

(*O ayağa qalxır.*)

General Hans gəlir.

H a n s

Yaxşı, vicdanınız nə dedi sizə?
Yoxsa, pərdə tutdu gözlərinizə.

Ş a h b a z

Artıq mən hazıram!

H a n s

Ha... ha... ha... bunu
Qabaqca desəniz yaxşı olmazdı?
Yoxsa tarixlərdə adın qalmazdı?..

Ş a h b a z

Artıq mən hazıram!

H a n s

Buyurun, gedək!
Açıq təbiəti ziyarət edək!
Bir az hava udun, rənginiz gülsün,
Bir az başınıza qar da tökülsün.
Ağlınız daha da yerinə gələr.
Sizlə həmfikirdir bütün əsirlər.

Ş a h b a z

Əmr edin!

H a n s

Nə əmr? Artıq sirdaşıq.

Ş a h b a z

Nə vaxtdan cəllada biz də yoldaşıq?
Əmr edin, daxmaya qoy od vursunlar.

H a n s

(*qəzəblə gəzinə-gəzinə*)

Bəs belə... çox gözəl!..

Ş a h b a z

Uzatma, murdar!

H a n s

Bəs bunlar, bunlara cavabdehsiniz?..

Ş a h b a z

Özlərindən sorun.

H a n s

Yaxşı... deyin siz!

S ə s l ə r

– Biz də!.
          – Biz də!..
                    – Yandırın bizi!..
– Satmarıq, satmarıq şərəfimizi.

D i l d a r

Qəlbimiz, eşqimiz, məsləkimiz bir –
Odur ki, rəyimiz ayrı deyildir.

H a n s

Zavallı filosof, bil, şərəf deyə,
Səbəb siz oldunuz bu faciəyə.

Ş a h b a z

İstər Allah olsun, istər peyğəmbər,
Örtür cinayəti bütün canilər.

H a n s

İndisə tələsmə, keçmədən bir an
Yanıb od içində qovrulacaqsan.
Nəsibin ölümdür, ölümdür heyhat!..

Ş a h b a z

Fəqət mən, – yaşasın, deyirəm, – həyat!..

H a n s

Yaşamaq desən də ölürsən, ölür!

Ş a h b a z

Ölüm də şərəfli həyatla gülür.

Hans getmək istəyir.

Ş a h b a z

Dayanın, general!

H a n s

Hə, deyin görək.

Ş a h b a z

Bilin ki, doktordur bu dilbər mələk,
Sizdə insan qanı varsa da bir az,
Bunu yandırmayın.

D i l d a r

Aman, yox, Şahbaz!..
Namusu ləkəli yaşamaram mən.
Halal süd əmmişəm ana döşündən.
Qoy cəhənnəm olsun!..

Hans gedir.

D i l d a r

Nəydi əməlin?

Ş a h b a z

Dedim sağ qalarsan... bəlkə də əlin
Bir yana yetişdi... səhv elədin sən,
Bəzən həyatdakı bir təsadüfdən
Səadət yaranır.

Evə od vurulur, əsirlər görüşüb öpüşürlər, divarlara sığınırlar.

Ş a h b a z

Təəssüf etməyin, qardaşlar, buna.
Şərəf bir ziynətdir insan oğluna!

H a n s

(*bayırdan*)

Ha... ha... ha...Yaşamaq! Artıq odlanın,
Artıq külə dönüb odun tək yanın!

D i l d a r

Uf... İslam... O gəlib çıxsaydı bu dəm...
Aman... gözlərimdə alışır aləm.

Ş a h b a z

(*həzin bir səslə*)

Gəl, bacım, dəmidir son ayrılığın,
Bir göyərçin kimi qoynuma sığın.
Gəl, ana yurdumun ismətli qızı,
Tarixlər unutmaz bu haqqımızı.

S ə s l ə r

– Yandım, ah!..

(*Yıxılır.*)

– Yandım, ah!..
– Alışdım, aman!..

(*Yıxılır.*)

Ş a h b a z

Sanki qıfıllanmış bütün asiman!

Uzaqdan Divani havası üstə marş səsi gəlir.

Ş a h b a z

Dildar... O, Səhərin simfoniyasıdır,
Ah, onun... o qəlbin öz dünyasıdır.

Marşın səsi yaxınlaşır, böyük bir hücum nəfəsi duyulur, topların, təyyarələrin səsi gurlayır. Uzaqdan Eldarın nərəsi eşidilir.

E l d a r

Gəl, gəl, çulu cırıq kəndliyəm mən də,
Şahla vuruşaram yeri gələndə.

S ə s

Ah... bizimkilərdir...

(*Yıxılır.*)

D i l d a r

Bəs İslam... hanı?

İ s l a m

Söndürün, söndürün, bu yanğınları!

D i l d a r

Odur, ah, özüdür... tez gələ, barı...

Ş a h b a z

Özüdür, özüdür, zəfər ordumuz,
Vətən torpağımız, ana yurdumuz!
Dildar!.. Aç qollarımı... odlandı başım.

D i l d a r

Sən məni əlindən burax, qardaşım!

(*Şahbazın qucağından yerə yıxılaraq*)

Of!.. Aman!... qaraldı... söndü kainat...

Ş a h b a z

(*yana-yana*)

Mən yenə, yaşasın, deyirəm həyat!

O, əli alnında arxası üstə divara dayanır. Alovlar sürətlənir, musiqi get-gedə canlanır. Bayırdakı ura səsləri havaya lərzəyə salır; yavaş-yavaş pərdə düşür.

P ə r d ə

## YEDDİNCİ ŞƏKİL

Fon Holsun mənzili və qərargahı. Fon Hols, Hans, bir çox zabitlər təlaşdadırlar. Şəhərdə böyük bir həyəcan var, təyyarə və top səsləri eşidilir.

F o n H o l s

(*Telefonla danışır.*)

Komendant! Komendant!

(*Trubkanı hirslə vurur, gəzinir.*)

Cavab gəlməyir!

H a n s

Feldmarşal, sinirim heç dincəlməyir...

F o n  H o l s

General, toxtadın özünüzü bir.

H a n s

Feldmarşal, bu yaman mühasirədir,
Ayağa qalxmışdır bütün şəhər də.
Ax... tülkü kimidir bizimkilər də.

F o n  H o l s

(*telefona qaçaraq*)

Komendant, komendant!
Hə... dillən görək.

Amaliya və Nataşa içəri otaqdan yüyürüb gəlir, Hansa yaxınlaşırlar.

A m a l i y a

General, məhv olduq!..

N a t a ş a

General, qaçaq!..

H a n s

Haraya, haraya, iştahına bax!

A m a l i y a

General, Berlinə... təyyarə çağır...

H a n s

Yox, xanım, əfv edin... göydən od yağır,
Gərək düşünəydik bir azca qabaq.

N a t a ş a

Aman... Amaliya, izdihama bax!..

F o n  H o l s

(*Telefonla danışır.*)

Necə, ikinci xətt!..
Bəs bizimkilər?..
Necə baş qaldırıb büsbütün şəhər?..

(*O, trubkanı bərk çırpır, qadınlara acıqlanaraq.*)

İçəri doluşun!

A m a l i y a

Yox... qaçaq... qaçaq...
Onlar qərargahı gəlib tutacaq.

F o n  H o l s

İçəri, deyirəm!..

(*O, tapançaya əl aparır, qadınlar qorxub qaçırlar.*)

Şəhərin yarısı getmişdir əldən.

H a n s

Bir ölçüb-biçsəydik bunu əzəldən...
Barı canımızı qurtarardıq biz.

Fon Hols

İndi başlanmayır səhvlərimiz,
Berlindən çıxanda... o vaxt, o zaman
Fürer cənabının ustalığından...
Birbaşa... birbaşa... Moskvayadək...
Buyur, nə arxa var, nə də bir kömək...

Hans

Baltik dənizindən Qafqaza qədər
Cəbhələr, cəbhələr, elə cəbhələr...
Buna qüvvət çatar?!. Strategiya...

Fon Hols

Bu bir tragediyadır, bir tragediya.

Hans

Tragediya yaxşıdır... bir komediya.

Fon Hols

(*Zabitlərə əmr verir.*)

Çəkin içəriyə pulemyotları.

Zabitlər gedir.

Bir az özümüzü saxlayaq, barı,
Bəlkə kömək gəldi...

Hans

Kömək hardadır?
Şəhər odlardadır, alovlardadır.

Amaliya

General, feldmarşal!

Fon Hols

Cəhənnəm olun,
İçəri dolun!

Amaliya

(*onun yaxasından yapışaraq*)

Yox, yox, gəl qaçaq, Fon Hols, əzizim!

Fon Hols

(*onu itələyərək*)

Çəkil, cəhənnəm ol!

Amaliya

Yox... yox, gəl qaçaq!

Fon Hols

Sən məni daha da karıxdırırsan...
Al!.. Gəbər, it qızı!

Amaliya yıxılır, zabitlər pulemyotları gətirib pəncərələrinə ağzına düzür.

Fon Hols

Düzəldib dayanın əmrə müntəzir.

Hans

Havada nə yaman təyyarə gəzir.

F o n  H o l s

Nə bilək... sən özün deyirdin azdır
Düşmənin topları, təyyarələri.

H a n s

İşlər çox dəyişib o vaxtdan bəri...

F o n  H o l s

(*Telefona qaçır.*)

Allo! Səs gəlmədi... bu da rabitə...
Yəqin ki, kəsmişlər bütün xətləri.

H a n s

Alov bürümüşdür bütün şəhəri,
İndiyə telefon, rabitə qalar?!

F o n  H o l s

Yaxşı, de, nə fikrin, nə əlacın var?

H a n s

İt kimi qorxuram ələ düşməkdən,
Özümü öldürmək istəyirəm mən.

F o n  H o l s

Öldür, yaşasan da, ölsən də heçsən,
Mən də sənin kimi, sənin günündə.

(*O, hirsli-hirsli gəzinir, papiros çəkir.*)

Birbaşa, birbaşa strategiya...

H a n s

Yerlər də, göylər də... dəyişmiş dünya.

Z a b i t

Onlar yaxınlaşır, lap yaxınlaşır...

F o n   H o l s

Atəş!..

Pulemyotlar işə salınır.

H a n s

Yox... gəlirlər...

F o n   H o l s

Lap ağlım çaşır...

Radio səslənir.

Cəbhədən bir addım geri çəkilən
Hər kəsi boğazdan asacağam mən.
Hücumla! Hücumla! Yalnız birbaşa...

F o n   H o l s

Buyur, cənab Fürer! Buyur... tamaşa,
Birbaşa! Birbaşa!..

H a n s

Yox bir zəhrimar!
Ağızın istidir... nə xəbərin var!

O, tapançanı gicgahına tutur. Pauza.

H a n s

Yox... əlim gəlməyir... Hünər istəyir.

F o n   H o l s

Bir, bax! Güllələri udurlar... udur,
Budur, mən dediyim igidlik, budur.

H a n s

Bu hünər hardadır bizimkilərdə?
Yox, getdi hiylə də, getdi hünər də.

F o n   H o l s

Toxtayın, general, son nəfəsədək,
Biz təslim olunca vuruşaq, gərək.
Yenə qənimətdir, qoy qıraq bir az.

H a n s

Feldmarşal, vuruşmaq daha yaramaz.
Bu saat doluşub bizi qırarlar.
Təslim olmağın da öz möhləti var.

F o n   H o l s

Sonuncu, sonuncu patrona qədər.

H a n s

Bax, bax, nə qaçışır gör bizimkilər.

İzdiham yaxınlaşır, Divani marşı eşidilir. Eldarın səsi gəlir.

E l d a r

Gəl, gəl, çulu cırıq kəndliyəm mən də,
Şahla vuruşuram yeri gələndə.

Fon Hols

Dayanın, ağ bayraq qaldırın, artıq!

Zabitlər atəşi dayandırır, ağ bayraq qaldırırlar. Bayırda atışma səsi kəsilir. Fon Hols və Hans başını aşağı salıb dayanmışlar. Eldar, Güloğlan, Valentin, başqa əsgərlər pəncərələrdən və qapılardan doluşurlar.

Eldar

Təslim! Çulu cırıq kəndliyəm mən də,
Feldmarşal tuturam yeri gələndə...

Güloğlan

(*Tüfəngi üzünə tutaraq, lakin geri çəkilə-çəkilə qaldırır.*)

Yoxsa bu saat
Anamın caniçün başın gedəcək.

Fon Hols

Bir general gəlsin bizi tutmağa.

Valentin

(*bir əsgərə*)

Get, İslamı çağır... buyurun ağa.

Güloğlan və bir çox əsgərlər o biri otağa keçirlər.

Sən öl, lap acmışdım. Baş açılır ki...
Gör bir araq varmı? Doldur, bəri ver.

Eldar

Var, var, özü də lap urus arağı,
Ala başına çək, canın qızışsın.

Valentin araq şüşəsini başına çəkir. Güloğlan Nataşanı qabağına salıb gətirir.

G ü l o ğ l a n

Bir ceyran tutmuşam..
Özü də casus...

Nataşa ilə Valentin birdən göz-gözə gəlirlər.

N a t a ş a

Valentin, Valentin, tı moy daraqoy!

V a l e n t i n

Kaneçno, kaneçno, çox gecdir, əfsus!..
Xanım, mən əsgərəm, özüm də bir rus,
Babamdan irs qalmış şərəflə namus.
Al, köpəyin qızı!

Nataşa yıxılır.

E l d a r

Əlin var olsun!

V a l e n t i n

Qoy bizdən namus da yadigar olsun!
Gələcək nəsillər oxusun bunu,
Bilsinlər şərəfin nə olduğunu.

G ü l o ğ l a n

Valentin, Valentin, öpüm üzündən,
Anamın caniçün lap kişiymişsən!..

İslam general libasında bir yığın zabitlə gəlir, bizimkilər onu hərbi təzimlə qarşılayır.

İslam

Buyurun, feldmarşal, bir də general,
Artıq əsirsiniz.

Fon Hols

Ancaq deyin, siz,
Deyin doğrudanmı generalsınız?

Güloğlan

Anamın caniçün!

İslam vəsiqəsini Fon Holsa göstərir, o, baxıb tanış olur.

Fon Hols

Çox gözəl... gedək!

İslam onları aparır.

Valentin

(*pəncərədən baxaraq*)

Nə qədər gözəldi bir bu şəhər,
Böyük meydançalar, geniş küçələr –
İndi başdan-başa xarabazardır,
Hər addım başında min uçuq vardır.
Ah ana, ah ana, zavallı ana!..
Bəlkə can vermisən sən yana-yana.
Bəlkə son nəfəsdə məni andıqca,
Qəlbin ümman kimi dalğalandıqca,
Kimsə çatmamışdır harayına, ah!..
Sənə sirdaş olmuş qəlbində Allah.

(*O, başını əlləri arasına alıb, fikrə gedir.*)

E l d a r

Güloğlan, Cəlalı görmədin ki, sən?

G ü l o ğ l a n

Yox... dünəndən bəri görməmişəm heç.

E l d a r

Yaxşı, bir şəhəri dolanıb gəzsən,
Bəlkə də rast gəldi...

G ü l o ğ l a n

Darıxma, tez-gec,
Qəlbimə damıb ki, o da gələcək.
Anamın caniçün!

E l d a r

Ə, durur anan?

G ü l o ğ l a n

Bıy... niyə durmasın, özü də şir tək,
Ağzını xeyrə aç, ə... nə yaman nəssən!
Yaman da inaddır... dilini kəssən,
Elə dediyinin üstündə durur,
Kim ağız tərpətsə. başından vurur.

E l d a r

Doğrudan?

G ü l o ğ l a n

Sən öl!

E l d a r

Özünün caniçün.

Eldar Valentini fikirdən ayıldaraq.

E l d a r

Dur görək, əşi!
Geri dönməyəcək çarxın gərdişi.
Sən tək oğul doğub rəhmətlik anan,
Onun nə dərdi var?..

G ü l o ğ l a n

Nə olub, balam,
Biz kişi deyilik?.. Hamıdan əvvəl
İki generalı mən tutdum ki, mən.

E l d a r

Dastan yazılacaq bu hünərindən.

Eldar çırtıq vura-vura Güloğlan havasını oxuyur.

G ü l o ğ l a n

Yaxşı, bilirsən ki, onu doğrudan
Qızlar mənə qoşub?..

E l d a r

Doğru deyirsən?

G ü l o ğ l a n

Anamın caniçün. Bəs nə bilirsən?

Cəlal bir neçə əsgərlə qayət pərişan bir halda gəlir.

E l d a r

Möhtərəm şairə salamlar olsun,
Bu dünya durduqca o da var olsun!

C ə l a l

Burax zarafatı, qaradır qanım.

(*O əyləşib fikrə gedir.*)

V a l e n t i n

Sən də mənim kimi dərdlisən canım,
De görək, nə olmuş?

C ə l a l

Valentin, bilsən,
Bir ildırım keçdi bu gün qəlbimdən.
Böyük bir müsibət oxladı məni,
İndi mən anladım müharibəni.
Yalnız evlər deyil, şəhərlər deyil,
Bu toplar altında xaraba qalan
Ağıllar da uçur... ürəklər də bil.
Bu insan dərdinə dözməyir vicdan.

V a l e n t i n

Yaxşı, həssas olur bütün şairlər.
Özün bilirsən ki, bizimdir zəfər.
Bu qanlar üstündən bayraq çəkərək,
Ordumuz yol açır düz Berlinədək.

E l d a r

Cəlal, bəs hardaydın dünəndən bəri?

Cəlal

Dünəndən gəzirdim xərabələri
Bir evdə, bir evdə əlli bir nəfər –
İki zabit ilə qırx doqquz əsgər,
Dünəncə lap dünən yandırılmışdır.
Ah, Şahbaz, ürəyim lap qırılmışdır.

(*O ağlayır.*)

Eldar

Şair, ağlayarmı cəbhədə əsgər?

Cəlal

Hər yerdə bir deyil bütün ürəklər,
Yananlar da vardır, yanmayanlar da.
Of, zülmət görürəm asimanlarda,
Tutulur gözümə bir qara pərdə.
Bir ilan başı var bütün göylərdə.

(*O, cibindən Şahbazın dəftərini çıxararaq*)

Budur, daş altından tapmışam bunu...
Siz də bilirsiniz kim olduğunu.

Hamı heyrətlə dəftərə baxır.

Valentin

Şahbazın, Şahbazın, onun dəftəri...

Cəlal

Bəli... filosofun lap ilk əsəri.
Alovlar içində yarımçıq qalmış,
Cildi toz-torpaqlı... rəngi saralmış.

Budur, bu, faşizmin rəzil varlığı,
Məhv edir ağılla bəxtiyarlığı.
Valentin, yaxın gəl, gör nə yazmışdır.

Hamı dəftərə göz dikir.

C ə l a l

(*Oxuyur.*)

“Bu yarımçıq qalır, vaxtsız ölürəm,
Ya oğlum tamamlar, ya da öz nəvəm”...

V a l e n t i n

Bu bir həqiqətdir, deyildir sual.

C ə l a l

Görək nə göstərir bizə istiqbal!..

P ə r d ə

## SƏKKİZİNCİ ŞƏKİL

Gənc Şahbaz gəzə-gəzə dərin-dərin düşünür.

Ş a h b a z

Qalib gələcəkmi cahanda kamal?
Atamdan irs qalmış bu böyük sual.
Elmin göylərində parlasın gərək,
Üfüqdən-üfüqə qanad gərərək –
Uçduqca, uçduqca bu düşüncələr,
Kamalla yaranır hər böyük əsər.

Pauza.

Varlığın əzəli bir qanunu var:
Zaman dəyişsə də, dönsə də rəng-rəng,
Cahanın qəlbində tutmuşdur qərar
Min hüsnün anası, böyük bir ahəng...
Öylə bir ahəng ki, bütün kainat
Yaşar o rübabın təranəsilə...
Ah... o əbədiyyət ilahəsilə
İnsan qovuşacaq öz dünyasında.
Xilqətin əzəli, ilk mənasında
Nə vaxtsız ölüm var, nə vaxtsız həyat!
Yaransın, yaşasın, qocalsın insan,
Solsun çiçək kimi vaxtı yetişcək.
Ölüm qapısını açdığı zaman
Onun gəlişindən qorxmasın ürək.
İçsin o badəni bir şərbət kimi,
Müqəddəs, ilahi bir nemət kimi.
Torpağa dönsə də, ucalsın göyə,
Ölsün, mən yaşadım, yaratdım deyə!

Budur əbədiyyət! O qüdsi ahəng!
Məncə pozulmazdır onun təməli,
Bu, görünsə də bir əfsanə tək,
Sabah yaradacaq insanın əli...

(*Sola gedir.*)

T a t y a n a

(*tək gəlir*)

Yox... yox... ürəyimə dammışdır, inan!
Onun o mənalı baxışlarından
Bir sevda oxunur... o sevir məni,
Duyuram, duyuram, o nəşidəni.

Pauza.

Bəs neçin dinməyir, sevirsə, əgər?
Yox... yox... qaraqabaq olur alimlər.

Bizdə ürək dinir, onlarda şüur,
Yəqin susmağının səbəbi budur!
Qabaqca mən özüm açılsam nolar?
Xeyr! Bir zinətdr qadına vüqar...
Bir də, o kişidir, bütün kişilər
Çox xudpəsənd olur... düşüb həvəsə,
Qadın öz eşqini açıq söyləsə,
Onu bir ağılsız, yüngül sayırlar...

(*Gedir.*)

Cəlal, Səhər və Valentin gəzişirlər.

V a l e n t i n

Nə qədər səfalı bir yermiş, Cəlal!
Baxdıqca aləmi seyr edir xəyal...

C ə l a l

Hələ o rəngarəng göylərə bir bax!
Şərq insanları tək bardaş quraraq,
Sanki məclis qurur əlvan buludlar...

S ə h ə r

Yaşamaq, yaşamaq, şirindir həyat!
Nə qədər xoşbəxtdir bütün kainat!
Lakin şad yaranmış bu təbiəti
Bir də ağlatmasın qoy qəsbkarlar.
Qoy insan oğlunun ilk məhəbbəti
Nəsildən-nəslə keçsin yadigar.

V a l e n t i n

Təəssüf ki, mənim ilk sevdiyim qız
Ürəkdən boş çıxdı, başdan ağılsız.
Lakin Tatyananın ruhu dərindir,
Ürəyi istisə, ağlı sərindir!

S ə h ə r

Tay tayını tapar, bizim oğlan da,
Sizin qızınızdan geriyə qalmaz!

V a l e n t i n

Şübhəsiz, ağıllı bir gəncdir Şahbaz!
Mən onu ilk dəfə görən zamanda
Atası Şahbaza oxşatdım.

C ə l a l

Bəli!
Onu yaman yıxdı dövranın əli!
Ən böyük dəhşətdir, ən böyük zülüm,
Hər vaxtsız doğuluş, hər vaxtsız ölüm.

S ə h ə r

Lakin bəxtiyardır bizim nəsillər,
Qayıtmaz bir daha o yaman illər!

V a l e n t i n

Qoy xoşbəxt yaşasın nəsillərimiz!
Bu səadət üçün qan tökmüşük biz!

S ə h ə r

Tatyana! Tatyana! Oğul, ay Şahbaz,
Gəlin, xörək yeyin!

C ə l a l

Tələsmə, Səhər,
Təbiət gözəldir, qoy gezişsinlər...

S ə h ə r

Cəlal! Hər gördükcə bizim Şahbazı,
On il cavanlaşır ürəyim azı...

C ə l a l

Bəli, Səhər bacı... Bütün qocalar
Özünü aldadır bu xəyal ilə...
Lakin qocalığa yoxdur etibar.
Qoy gənclik sevinsin istiqbal ilə!

S ə h ə r

Elə bil, atası Şahbazdır uşaq.
Bəzən qaşlarını sıx-sıx çataraq,
O, fikrə getdikcə lap Şahbaz olur.

C ə l a l

Ürəyin açılır, kefin saz olur.

S ə h ə r

Lakin... unudulmaz hicran cəfası!

V a l e n t i n

Qoca Şərq! Qoca Şərq! Qadın vəfası!

C ə l a l

Yaxşı, qurtarmadı "Hicran nəğməsi"?

S ə h ə r

Yox, Cəlal, yazıram... o, simfoniyadır...
Döndükcə qəlbimin yüz səhifəsi,
Bəlkə də ömrümün sonuna qədər
Tamamlanmayacaq bu böyük əsər.
Bir də qurtarmağa qorxuram onu,
Bəs nəylə keçinsin ömrümün sonu?

C ə l a l

İnsan qocaldıqca yaşamaq istər.
Gənclik zamanında, aqil bir nəfər
Mənə demişdi ki, ölməyin vaxtsız,
İnsan həyat üçün yaranır yalnız.
Bir aysa, bir ilsə ömrü artıran
Böyük qəhrəmandır, aqil bir insan,

S ə h ə r

Bunlar hara getdi?

(*O yan-bu yana boylanır.*)

C ə l a l

Görünür, dostlar
Dil tapıb... qoy olsun... qoy bütün aləm
Nə bir qüssə duysun, nə də ki, bir qəm.
Qoy eşqin odunu duyan hər vicdan
Nə iztirab çəksin, nə də ki, hicran.

Onlar sağa gedir.

Ş a h b a z

(*gəlir*)

Of... Başım yorulur... min bir həqiqət
Gəlib toqquşduqca baş-başa bəzən.
İdrak göylərini seyr edib gəzən
Gözəllik beşiyi – ana təbiət,
Hər daş parçacığı, hər dalğalı su,
İnsan övladının min bir arzusu,
Qansız, ədavətsiz böyük istiqbal,
Hamsı öz donunu lalədən geyir,
Hamsı bir ağızla, bir səslə deyir:
“Qalib gələcəkdir cahanda kamal!”

Tatyana gəlir.

T a t y a n a

(*gözaltı ona baxaraq*)

Onun alnındakı o gizli məna
Böyük bir aləmdir sonsuz bir dünya.
Daima düşünür... çatılır qaşı...
Bəzən də baxışı borandır, qışdır;
Sanki bu aləmdə o yaranmışdır.
Yerin də, göyün də ürək sirdaşı...
Yox... daha qalmadı səbrim, qərarım,
Mum kimi yumşaldı lap ixtiyarım.
Yox, açılacağam.

(*Şahbaza yaxınlaşaraq*)

Sizsiniz, Şahbaz?
Mane olmadım ki?

Ş a h b a z

Niyə ki, bir az.

T a t y a n a

Mən gedə bilərəm!

Ş a h b a z

Yox... artıq gecdir.
Başı yormağın da mənası heçdir.

T a t y a n a

Lakin... çox yaraşır düşünmək sizə.
Bəzən duman gəlir gözlərinizə.

Sizsə bir dağ kimi dayanarsınız,
Sonra al şəfəqə boylanırsınız...

Ş a h b a z

Görünür, həssasdır sizdəki diqqət!

T a t y a n a

İnsan yaratmışdır bizi təbiət.

Ş a h b a z

Yox! Gərək açılam... sonra gec olar...
Bəzən bir anlığa geciksə insan,
Çıxmaz ömrü boyu fırtınalardan...
Hər həqiqətin də öz zamanı var!
Əfv edin, mümkünmü mələyi sevmək?

T a t y a n a

Mələyi? Nə bilim? Nə deyir mələk?

Ş a h b a z

O hələ susmuşdur...

T a t y a n a

Bəs siz?.. İnsafsız?
Qabaqca qəlbini heç açarmı qız?

Ş a h b a z

(*onun əllərini tutaraq*)

Əfv edin! Şəksiz ki, mənəm müqəssir,
Ürəyim yarpaq tək titrəyib əsir.

T a t y a n a

(*utancaq bir halda*)

Düzü... mənimki də...

Ş a h b a z

Dərdimiz birdir!

T a t y a n a

Artıq, taleyimiz ayrı deyildir!

Ş a h b a z

Əfv edin, mümkünmü mələyi öpmək?

T a t y a n a

Eşqi öpüşməkdə görməyir mələk...

Ş a h b a z

Mən ki, mələk deyil, canlı insanam?
Məni də bir kişi doğmuşdur anam...

T a t y a n a

Bilirəm... kişilər səbirsiz olar...
Ürəyin yanırsa, öp, nə eybi var?..

(*Öpür.*)

P ə r d ə

## DOQQUZUNCU ŞƏKİL

Şahbazın evi. Evdə heç bir dəyişiklik olmamışdır. Tatyana qoca Şahbazın rəsmini çəkib qurtarmaq üzrədir. Böyük bir ziyafət süfrəsi düzəldilmişdir. Qoca Səhər süfrəylə məşğuldur. O çox şaddır, tərpənişi cavan gəlinləri andırır.

S ə h ə r

Bunu da yetirdim artıq boy-başa,
Kamalı dəryadır, boyu tamaşa.
Lap atası Şahbaz, lap bir almadır,
Yerişi, duruşu ondan qalmadır.
Ancaq... bənzəməsin heç ona baxtı,
Düşmən də ölməsin qoy cavan vaxtı.
Vaxtsız saralanda, solanda çiçək
Bu qanunsuz işə ağrıyır ürək
Eh... keçən dövranlar... eh, keçən günlər.
Bu gün olmasa da sizdən bir əsər,
Yenə biz qocalar duyuruq sizi,
Duyuruq o qanlı faciənizi.
Bir xəyal olsa da artıq o günlər,
Sinəmdən getməmiş dağlar, düyünlər.

T a t y a n a

Xala! Bir zəhmət çək!

(*Səhər əksə baxır.*)

T a t y a n a

Varmı bənzəri?

S ə h ə r

Qızım, çox qaraydı onun gözləri.
Bir də, alnındakı vaxtsız cizgilər
Böyük bir kamaldan verirdi xəbər...
Hə, hə, nə zaman ki fikrə dalardı.
Rəngi kəhrəba tək sarı çalardı...

Lakin baxışında hər zaman, hər an
Bir ümid gülürdü yaranışından.
Heç unutmamışam o vaxtdan bəri,
Sən də nəzərdə tut bu sifətləri.

(*Səhər sol otağa keçir.*)

T a t y a n a

Bir sonsuz ümmandır bundakı şüur,
Onun hər sözündən dastan oxunur...
Qəlbində nə həsəd, nə də ki, bir kin.
Böyüklük eşqində, diləyindədir.
30 il qabaqkı bir faciənin
Odları indi də ürəyindədir.

(*O, əksi çəkir; bir az sonra*)

Bir zaman qanımı cəllad içsə də,
Ömrün bahar vaxtı dul qalsam da mən
Başımdan bəlalar gəlib keçsə də,
Ayrılmayacağam öz ürəyimdən.
Qoy mənim Şahbaza bu olsun andım,
Eşqin qüdrətinə bu gün inandım!

O, yenə əksi davam etdirir, Şahbaz sağ otaqdan dəftərçəni yaza-yaza çıxır, Tatyananı görərək.

Ş a h b a z

Tatyana Larina?

T a t y a n a

...Valentinovna.
Bir azdan sonra da Şahbazzadəyəm...

Gülüşürlər.

Ş a h b a z

Lakin... gözləriniz bənzəyir ona,
Puşkin qələminin qız yavrusuna.

T a t y a n a

Hələ kəşf etmədin təzə bir surət?

Ş a h b a z

Şairə məxsusdur belə bir adət.
Gündə bir çiçəyə, gündə bir gülə,
Nə bilim laləyə, sonra sünbülə,
Sonra da tikana... bir də ilana...
Eh... Loğman gərəkdir onları qana!
Bizsə alimlərik, kasıbıq dildən...

T a t y a n a

Görürəm, görürəm, yaman kasıbsan...
Sənin tək olsaydı alimlər tamam,
Yazıq şairlərə qalmazdı ilham.

Gülüşürlər.

T a t y a n a

Şahbaz, mane olma...
Az qalır, lap az...
Yaxın gəl, oxşayır, filosof Şahbaz?

Ş a h b a z

Təəssüf ki, onu heç görmədim mən,
Sağ olsun anamın söhbətlərindən
Az-çox düşünürəm o xoş surəti,
Elmə məftun olan bu təbiəti.

T a t y a n a

Atana doğrudan məhəbbətin var?

Ş a h b a z

Bəs necə?

T a t y a n a

Eləysə, əsəri qurtar.
Di get otağına.

Ş a h b a z

Yaxşı, gedirəm...

(*O gedir.*)

Cəlal ilə Valentin orta qapıdan gəlirlər.

C ə l a l

Gəl, gəl, lap yorulub əldən düşmüsən.

V a l e n t i n

Nə olub? Səndən ki çox gümraham mən!
O qədər böyükdür sizin bu şəhər...
Canım, bir aydır ki...

V a l e n t i n

Tatyana!

C ə l a l

Dəymə!

T a t y a n a

Ata can, bu saat, lap bu dəqiqə.

Qocalar əyləşir.

C ə l a l

Eh, Şahbaz... dünyadır, qalsaydı o da,
Bu toy axşamında cavanlaşardı,
Baxıb bu gəncliyə yenə yaşardı...

V a l e n t i n

Olur... çox şey olur qoca dünyada,
Yaxşı, yadındadır sənin o Eldar?..
Görəsən sağdırmı? Bir xəbərin var?

C ə l a l

Sağdır, arabir də görüşürük, hə!..
Yenə haman xasiyyət, haman qəhqəhə...
Hələ İslam özü!

V a l e n t i n

Aha... general!?

C ə l a l

Elə haman səs-küy, haman qalmaqal...

Gülüşürlər.

T a t y a n a

Mən hazır!

(*O, əksi divardan asır, qocalar əksə tamaşa edirlər.*)

C ə l a l

Afərin, qızım, afərin!
Elə bil özüdür... Belədir sənət.
Allah, yaratmışdır onu təbiət.

(*O, Tatyananın alnından öpür.*)

V a l e n t i n

Doğrudan... nə yaman oxşayır, Cəlal!
Qızım, ağlatmasın sizi istiqbal,
Ancaq şeytan qızım, bu hünərlə sən
Qoca atanı da göstərməlisən!

T a t y a n a

O mənim borcumdur!

V a l e n t i n

Çox sağ ol, qızım!
Bircə sən qalmısan, tale ulduzum!

(*O, Tatyananı öpür.*)

Eldar çiynində bir xalça, kəndli libasında birdən daxil olur.
O, nisbətən az qocalmışdır.

C ə l a l

Eldar!..

E l d a r

Bay!.. Valentin! Xoş gördük əşi!..

Onlar görüşürlər.

Vallah, qəribədir dünyanın işi.
Yaxşı, nə var, nə yox?

C ə l a l

Çox sağ ol, Eldar!

V a l e n t i n

Sən özün necəsən?

C ə l a l

Niyə... ruzigar!...

C ə l a l

Ay Eldar, bu nədir? Bu xalça nədir?

C ə l a l

Heç əşi... toydur da, bir hədiyyədir.
Nolar, çulu cırıq kəndliyəm mən də,
Xalça toxuyuram yeri gələndə.

Hamı gülüşür.

V a l e n t i n

Elə haman Eldar... haman zarafat...

E l d a r

Səhər bacı hanı?

T a t y a n a

Gələr bu saat!

(*Onu çağırmağa qaçır.*)

Şahbaz sağ otaqdan əlindən dəftər və qələm sevincək çıxaraq.

Ş a h b a z

Qalib gələcəkmi cahanda kamal?
Atamdan yadigar qalan bu sual
Artıq həll olundu, oxuyun, çalın!
Dünənin, bu günün və istiqbalın
Verdiyi sualın cavabıdır bu.
Mən sənə borcluyam ömrüm uzunu.

C ə l a l

O da alqış deyir sənə məzardan,
O vaxtdan görmüşdü o aqil insan;
Bu yarımçıq qalır, vaxtsız ölürəm,
Ya oğlum tamamlar, ya da öz nəvəm!

Ş a h b a z

Bay! Eldar əmi!

E l d a r

Cavanlıq qızanda görməz aləmi.
Xoş gördük! Toyun da mübarək olsun!..

C ə l a l

Birinci badəni bu iki gəncin
Sağlığına içək!

S ə s l ə r

Tatyana! Şahbaz!
Bəxtiyar yaşayın! Həm də ülfətlə,
İlahi, müqəddəs bir məhəbbətlə!

E l d a r

Yaşayın, yaradın, bizim balalar!

C ə l a l

Dostunuz eşq olsun, bir də etibar!

(*Şahbazla Tatyananın alnından öpərək*)

S ə h ə r

Şahbaz! Əziz balam! Bugünkü qədər
Heç oxşamamışdın yazıq atana.
Bala, qayıtmasın bir də o günlər,
Nə ata dərdə görsün, nə də ki, ana!

C ə l a l

Səhər! Səhər bacı! Gərək keçəsən,
Barı bir piyalə bu gün içəsən!

S ə h ə r

Yox... yox... içməsəm də, xoşbəxt kimiyəm,
Elə bil qəlbimdə toy qurur aləm.
Eldar, eşitmirik çoxdan səsini,
Bir Məryəm oğlunun şikəstəsini
De sən qulaq asaq!

E l d a r

Deyim, baş üstə!
Nolar, çulu cırıq kəndliyəm mən də,
Şikəstəm də olur yeri gələndə.

"Məryəm oğlu" çalınır. Eldar oxuyur.

E l d a r

Binələri çadır-çadır,
Çox gəzmişəm özüm, dağlar.
Qüdrətini sizdən aldı
Mənim sazım, sözüm, dağlar!

Qayaları baş-başadır,
Güneyləri tamaşadır

Gödək ömrü çox yaşadır
Canım dağlar, gözüm dağlar!

Bir qonağam bu dünyada,
Bir gün ömrüm gedər bada,
Cəlalı da salar yada
Düz ilqarlı bizim dağlar!

C ə l a l

Dayan! Bu əlli il qabaqkı sözdür!
Baxıb bu kəndliyə sevindikcə mən,
Bir səs eşidirəm Vətən mülkündən.

(*O, musiqiyə uyğun bir ahənglə*)

Bir bağam ki, xəzan görməz camalım,
Süsənlərim, sünbüllərim var mənim.
Gözəlliklə bir yarandı kamalım,
Dastan deyən bülbüllərim var mənim.

Ovçu keçər yenə Muğan düzündən,
Oxlanmasın bir ceyranın gözündən.
Bülbül öpər qızılgülün üzündən,
Allı-güllü fəsillərim var mənim.
Havalanıb qartal kimi mərd uçan.
Şimşək olub zülmətlərdən yol açan,
Qoca Şərqə kamalından nur saçan
Ağır təbli nəsillərim var mənim.

Hamı əl çalır.

Ş a h b a z

Sağ ol, Cəlal baba! Şeirlə sənət
Əzəldən yarandı məclisə ziynət.

İslam general libasında, qucağında bir dəstə gül daxil olur.

İ s l a m

Farağat!

Hamı qalxır, hərbi təzim verir.

İ s l a m

Yox... hamı gərək əl çalsın!

Əl çalırlar, o qızlara zarafat gözü ilə baxaraq.

Neyləyim... qızların hamsı dul qalsın...

Hamı gülür, qızlar onları öz aralarına alırlar.

C ə l a l

İslam, Valentindir...

(*Ona əl verir.*)

İ s l a m

Yenə memarsan!

V a l e n t i n

Öz sənət eşqini dəyişməz insan.

İ s l a m

Bilirəm... Nə səndən, nə də Cəlaldan
Komandir çıxmadı...

B i r  q ı z

İslam baba, gəl,
Qılıncını soyun, dinc əyləş bir az!

İ s l a m

Yox, qızım, yarağı əsgər soyunmaz.

C ə l a l

Nə olub, yenə də müharibədir?

İ s l a m

Oldu, ya olmadı... təfavüt nədir?
Yox, qardaş... nə qədər almanlar varsa,
Qılıncı belimdən aça bilmərəm.

Gülüş.

İ s l a m

Bay, Eldar... Xoş gördük!

E l d a r

Eh...aram yoxdur.
General olsan da qanın soyuqdur.
Şahbazı güdaza sən vermədinmi?

İ s l a m

(*ciddi bir tövr ilə*)

Mən yox, müharibə! O qanlı dövran,
Lakin ömrüm boyu məni ağrıdan
Bir Şahbaz olmuşdur... Çarəmiz nəydi?
Ölüb-öldürən də müharibəydi.
Hünər də göstərdik, çox yanıldıq da,
Arabir tez yatıb, gec ayıldıq da.
İmtahan vaxtıydı... biz isə cavan,
Təzə dərs alırdıq imtahanlardan.

E l d a r

Yaxşı... bəs o vaxtdan evlənmədin sən?

İ s l a m

Bax, bax, qocalmışam bir bu səhvimdən.
Dedim ki, əsgərəm, öz vəzifəm var
Sonra arvad-uşaq başımı qatar –
Davadan ürəyim soyuyar... ancaq,
Bilmədim belə bir dövran olacaq...
İndi... qış gecəsi gəldikcə işdən,
Təklikdir... yoldaş da olmayır, bəzən,
Məni məngənə tək sıxır dörd divar.
Gəlib-getməyir də köhnə tanışlar...
Doğrusu, bir yaxın həmdəmim yoxdur.
Yayda da yastığım buz tək soyuqdur.

Qərəz... Darıxıram... Yaxşı deyildir
Baxtımdan dava da olmayır ki, bir
Başım qarışaydı yenə cəbhəyə,
Yenə qışqıraydım"Hücum var!" deyə...
Eh... məndə baxt hanı...

Gülüşürlər.

Q ı z l a r d a n   b i r i

İslam baba, sən
Bizim birimizi sevə bilməzsən?

S ə s l ə r

Hə... məni...
Yox... məni...
Yox... məni alsın...

İ s l a m

(*Cəlala*)

Görürsən?.. Qızların hamsı dul qalsın!

(*Qızlara*)

Bala, dəyişməyib məndəki baxt da,
Sizin tək gözəllər elə o vaxt da
Bir məni yüz yerə çəkdilər bir-bir,
Gözümü açmağa qoydular ki, bir!..

Gülüş.

Keçib... siz sağ olun, siz sağ olun, siz,
Nə qadın, nə oğul, nə qız, nə qardaş,
Mənə qılınc qaldı dünyada sirdaş!

S ə h ə r

Tatyana! Can qızım... Hicran nəğməsi...
Qorxma həyat deyir hər səhifəsi...
Burdakı qüssə də, gizli bir qəm də,
Səadət axtarır bütün aləm də...

Can bala, görməyin, bu hicranı siz,
Görməsin sizin də nəsilləriniz...
Çal, qızım, eşidin, mənası nədir.

Tatyana pianoda çalır, hamı diqqətlə qulaq asır.

C ə l a l

30 il qabaqkı bir faciədir,
Nə əzəli vardır, nə intəhası.

V a l e n t i n

Qoca Şərq, Qoca Şərq, qadın vəfası!..

S ə h ə r

Balalar, eşidin hicran nəğməsi.
Deyəsən, ağlayır kamanım mənim,
Yox, yox... o, həyatdır, həyatın səsi,
Ondan üzülmədi gümanım mənim .
Lakin sinəmdəki bu sadiq ürək,
Döyünüb gəlmişdir qəmlər yeyərək,
Könül yarasını sağaltmaz fələk,
Yüz yerdən gəlsə də loğmanım mənim.

(*O, əksin qarşısına gedərək.*)

Ah, Şahbaz! Neyləyim, baxırsan mana,
Lənətmi deyirsən sən o dövrana...
Səninlə... səninlə döndü al qana
Ən gözəl, ən xoşbəxt zamanım mənim!

C ə l a l

Eh, hicran nəğməsi, hicran cəfası!

V a l e n t i n

Qoca Şərq, qoca Şərq, qadın vəfası!

Şahbaz və Cəlal Səhərin dalınca gedirlər.

İslam

Bax belə, bax belə, sevin, a qızlar!
O vaxt küsənəcək sizə ulduzlar.

Cəlal və Şahbaz qəmgin qayıdırlar.

Cəlal

Söndü, günəş kimi söndü o vicdan!..

Valentin

Doğrudan... Nə böyük yaranır insan!
Onun nə ilki var, nə intəhası,
Qoca Şərq, qoca Şərq, qadın vəfası!

Şahbaz

(*mütəəssir, lakin yenə nikbin bir səslə üzünü Cəlala tutaraq*)

Atamın açdığı bu səhifələr,
Mənim də yazdığım bu kiçik əsər,
Məncə, bir-birindən ayrı deyildir.
Əməl də, qayə də, ürək də birdir.

Bunların köksündə çırpınan vicdan
Bir səadət deyir, bir də ki, insan.
Nə adla çağıraq bu ülviyyəti?!
Göylərə hökm edən bu şeriyyəti!
Nə adla çağıraq biz bu növrağı?

Cəlal

(*canlı və mənalı bir səslə*)

İnsan kamalının zəfər bayrağı!..

Pərdə

# MÜNDƏRİCAT

## DRAM ƏSƏRLƏRİ

